

AZƏRBAYCAN RESPUBLİKASI
ELM VƏ TƏHSİL NAZİRLİYİ

ISSN 2790-0738 (Print)
ISSN 2791-0911 (Online)

# AZƏRBAYCAN DİLİ
## VƏ ƏDƏBİYYAT TƏDRİSİ

ELMİ-METODİK JURNAL

**2023, №4 / 278**

**TEACHING of AZERBAIJANI LANGUAGE and LITERATURE**

SCIENTIFIC-METHODICAL JOURNAL

**AZƏRBAYCAN DİLİ və ƏDƏBİYYAT TƏDRİSİ**
Elmi-metodik jurnal. 1954-cü ildən nəşr olunur.
ISSN 2790–0738 (Print); ISSN 2791–0911 (Online)

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1997-ci il tarixli Nizamnaməsi ilə təsdiq edilmiş, Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyində dövlət qeydiyyatına alınmışdır. Seriya AB № 022436, Qeydiyyat № B236

"Azərbaycan dili və ədəbiyyat tədrisi" humanitar elmlər istiqaməti üzrə dilçiliyin və ədəbiyyatşünaslığın bütün sahələrinə aid Azərbaycan, türk, ingilis və rus dillərində orijinal, yüksək keyfiyyətli elmi məqalələr dərc edən, dilimizin saflığı və işləkliyini qoruyan, Azərbaycan dili və ədəbiyyatın (həmçinin xarici ədəbiyyatın) tədrisi metodikasını, onun tədqiqi və təbliği məsələlərini araşdıran resenziyalı, açıq girişli elmi-metodik jurnaldır. İl ərzində dörd dəfə nəşr olunur. Jurnal dilçilik məsələləri, metodika, qrammatika, dialektologiya, mətnşünaslıq, Azərbaycan ədəbiyyatı, türk dili və ədəbiyyatı, xarici ədəbiyyat, uşaq ədəbiyyatı və folklorşünaslıq mövzularını əhatə edən bölmələrindən ibarətdir. "Nəşrlər" bölməsində elmi-pedaqoji sahədə yeni nəşr edilən kitablar tanıdılır. Jurnal Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının tövsiyə etdiyi dövri elmi nəşrlər sırasındadır.

---



**TEACHING of AZERBAIJANI LANGUAGE and LITERATURE**
Scientific-methodical journal. Published since 1954.
ISSN 2790–0738 (Print); ISSN 2791–0911 (Online)

Approved by the Charter of the Ministry of Education of the Republic of Azerbaijan dated May 5, 1997, registered with the Ministry of Press and Information of the Republic of Azerbaijan. Series AB № 022436, Registration № B236

"Teaching of Azerbaijani language and literature" publishing original, high-quality scientific articles in Azerbaijani, Turkish, English and Russian languages in all fields of linguistics and literary (including foreign literature) criticism in the field of humanities is a peer-reviewed, Open Access scientific-methodical journal that studies the methodology, its research and promotion. Published four times a year. The journal consists of sections covering linguistics, methods, grammar, dialectology, textology, Azerbaijani literature, Turkish language and literature, foreign literature, children's literature and folklore. In the section "Publications" are presented new books published in the scientific and pedagogical field. The journal is among the publications recommended by the Supreme Attestation Commission under the President of the Republic of Azerbaijan.

---

# İÇİNDƏKİLƏR / № 4, 2023

## Q R A M M A T İ K A



## A Z Ə R B A Y C A N   T Ə H S İ L İ

# CONTENTS / № 4, 2023

H A Y D A R   A L I Y E V – 1 0 0



L I N G U I S T I C   I S S U E S



M E T H O D S

## GRAMMAR



## AZERBAIJANI EDUCATION

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 12–27
doi.org/10.48445/k7954-5410-2333-p

**HEYDƏR ƏLİYEV–100**

# Heydər Əliyev və Azərbaycan ədəbiyyatının intibahı

***Nazilə Abdullazadə***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: nazile.s.m.d@mail.ru
https://orcid.org/0000-0002-1829-7178

**XÜLASƏ**
Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin müstəqil Azərbaycanın dövlət quruculuğunda ən böyük xidmətlərindən biri də ədəbiyyatın və bu ədəbiyyatı yaradan şəxsiyyətlərin qayğısına qalması, onlara dəyər verməsi, qoruyub gələcək nəsillərə ərməğan etməsidir. Ulu öndər özünün bir insan kimi formalaşmasında təhsili, əxlaqı, mənəviyyatında ədəbiyyatın, mədəniyyətin böyük rolu olduğunu qürurla vurğulayırdı. Onun fikrincə, ədəbiyyatın şərəfli vəzifəsi – cəmiyyətin yüksəlişinə, elmi-texniki inqilab şəraitində iqtisadiyyatın inkişafına yönəldilmiş fəaliyyətinin, öz məqsəd və mahiyyəti etibarilə novator xarakterli nəhəng fəaliyyətinin mürəkkəbliyini, dərinliyini, sülh və xalqların təhlükəsizliyi uğrunda mübarizənin bütün əzəmətini hərtərəfli və bədii boyalarla əks etdirməkdir.

**AÇAR SÖZLƏR**
Heydər Əliyev, folklor, klassik ədəbiyyat, intibah, milli ideologiya

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 05.10.2023
qəbul edilib: 10.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 12–27
doi.org/10.48445/k7954-5410-2333-p

**HAYDAR ALIYEV–100**

# Haydar Aliyev and the renaissance of Azerbaijan

***Nazila Abdullazade***
Doctor of Philosophy in Pedagogical, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: nazile.s.m.d@mail.ru
https://orcid.org/0000-0002-1829-7178

**ABSTRACT**
One of the greatest services of the national leader of the Azerbaijani people, Haydar Aliyev, in the establishment of the independent state of Azerbaijan, is to take care of literature, the personalities who created this literature, to give it its true value, and to preserve it and leave it as a gift to future generations. The great leader proudly emphasized the great role of literature and culture in his formation as a person, in his education, morals, and spirituality. In his opinion, the honorable task of literature is to show the complexity and depth of its activity aimed at the rise of society, the development of the economy in the conditions of the scientific and technical revolution, the great and huge activity of an innovative nature in terms of its goals and essence, and all the magnificence of the struggle for peace and the security of peoples in comprehensive and artistic colors.

**KEYWORDS**
Haydar Aliyev, folklore, classical literature, renaissance, national ideology

**ARTICLE HISTORY**
Received: 05.10.2023
Accepted: 10.11.2023

**Giriş / Introduction**

Müstəqil Azərbaycan dövlətinin qurucusu Heydər Əliyevin həyat amalının bir dayaq nöqtəsi vardı: azərbaycançılıq. O, hər addımında, hər əməlində Azərbaycanı düşünür, hər zaman ona müstəqil Azərbaycanın mirası kimi yanaşırdı. Dünya azərbaycanlılarının I Qurultayında ulu öndər öz qayəsini belə ifadə etmişdi: "Azərbaycan dövlət müstəqilliyini əldə edəndən sonra azərbaycançılıq aparıcı ideya kimi həm Azərbaycanda, həm də bütün dünyada yaşayan azərbaycanlılar üçün əsas ideya olubdur. Biz həmişə bu ideya ətrafında birləşməliyik. Müstəqil Azərbaycan dövlətinin əsas ideyası azərbaycançılıqdır. Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir və biz azərbaycançılığı – Azərbaycan dilini, mədəniyyətini, milli-mənəvi dəyərlərini, adət-ənənələrini yaşatmalıyıq" [1, s.604].

**Əsas hissə / Main part**

Azərbaycançılıq onun anlamında həyatın bütün sahələrinə şamil idi: təhsil, elm, səhiyyə, iqtisadiyyat, incəsənət və s. Heydər Əliyev bunların hər birində Azərbaycanın portretini görür, onun şəklini çəkir, musiqisini eşidirdi. Azərbaycançılıq onun yazmağa başladığı və gələcək nəsillərə ərməğan qoyduğu bir epopeyadır. Xalqın məişətindən tutmuş elminə, maarifinə, səhiyyəsinə, incəsənətinə sədaqət bu romanın ideyasını təşkil edir. Azərbaycançılıq fəlsəfəsi ulu öndərin siyasi fəaliyyətini, milli dövlətçilik ideologiyasını, dil, ədəbiyyat, tarixi keçmiş, milli-mənəvi dəyərlər isə onun mənbələrini təşkil edir.

Tarixən zəngin olan Azərbaycan ədəbiyyatının bugünkü səviyyəsi Heydər Əliyevin adı ilə bağlıdır. O, ədəbiyyatın bütün sahələrini sevir, bədii ədəbiyyata xüsusi sevgisini gizlətmirdi: "Ədəbiyyata olan məhəbbətimi sübut etməyə elə bir ehtiyac yoxdur. Bunu Azərbaycanda yaxşı bilirlər. Bu, mənim vəzifəmə görə deyildir, mənim təbiətimdir, içimdən gələn hissiyyatımdır. Məndə həmişə − hələ uşaq, gənc yaşlarımdan şeirə, ədəbiyyata, incəsənətə, mədəniyyətə çox böyük həvəs olubdur, həmişə maraqlanmışam. İndi dövlət işi ilə məşğul olanda da mən bunun nə qədər əhəmiyyətli olduğunu bilirəm, dərk edirəm. Ona görə də əlimdən gələni edirəm". Heydər Əliyev ədəbiyyatın əsas vəzifəsini onun humanist mahiyyətində görürdü. Hələ postsovet məkanında sovet həyat tərzinin nəcib və gözəl cizgilərini, insan arzu və əməllərinin tərənnümünü yazıçıların həyatın ab-havasını duymaları ilə bağlayırdı. Cəmiyyətin yüksəlişi, iqtisadiyyatın inkişafına yönəlmiş fəaliyyəti, sülh və təhlükəsizlik uğrunda mübarizənin hərtərəfli bədii təsviri Heydər Əliyevə görə, ədəbiyyatın şərəfli vəzifəsidir. O bilirdi ki, xalqın mədəni səviyyəsini daha da inkişaf etdirmək, gənc nəsli

sağlam əhvali-ruhiyyədə, saf əxlaqlı yetişdirmək üçün bədii sözün, bədii ədəbiyyatın əvəzedilməz təsiri var. Bu anlamda ulu öndər folklor yaradıcılığına, klassik irsə, müasir ədəbi prosesə, ümumiyyətlə, bədii ədəbiyyata böyük önəm verirdi.

Heydər Əliyev həmçinin bədii ədəbiyyatın imkanlarını ədəbiyyatşünas kimi təhlil edir və onlara güvənirdi. Onun fikrincə, ədəbiyyat, mədəniyyət xalqın milli sərvəti, xəzinəsidir. Ədəbiyyatın xalqımıza bəxş etdiyi ən böyük xidmət ondan ibarətdir ki, şairlər və yazıçılarımız öz əsərləri ilə millətimizdə daim milli hissiyyatlar oyatmışlar. Qeyd edək ki, milli özünüdərk, milli oyanış, dirçəliş prosesi ilk növbədə ədəbiyyatdan keçir. Bədii ədəbiyyat və onu yaradan sənətkar məfhumu Heydər Əliyevin nəzərində dəyəri olmayan anlayışlar idi. O, bunlara tarixi-fəlsəfi prizmadan yanaşır, sənətkar şəxsiyyətinin qiyməti və dəyərini yaratdığı əsərlərdə təbliğ etdiyi bəşəri ideyalarda, milli dəyərlərdə, əxlaqi-mənəvi keyfiyyətlərdə görürdü. Ulu öndər 1975-ci ildə Azərbaycan sovet ədəbiyyatı günlərində çıxış edərkən demişdir: "Tarixin bir-birinə qovuşdurduğu əsrlər bir çox xalqların oğul və qızlarını məhəbbətlə tərənnüm edən Nizami dühasının ölməz əsərlərini, Füzulinin insanpərvərlik və xeyirxahlıq dolu misralarını, Nəsiminin fəlsəfi fikirlə zəngin lirikasını, Xətainin məhəbbət və iztirab tərənnüm edən poemalarını, Vidadi və Vaqifin xalq yaradıcılığı çeşməsindən qidalanan ölməz şeirlərini bizə gətirib çatdırmışdır. Hökmdarlar, saray əyanları, zülmkarlar unudulub getmişlər. Azərbaycanın böyük mütəfəkkir və humanist şairlərinin təravətdən düşməyən misraları isə bu gün də öz hikməti və insanpərvərlik ruhu ilə dünyanı heyran qoyur. Onlar xalqın azadlığı və səadəti haqqında öz dərin fikirlərini və sönməz arzularını əsrlərdən, nadanlıq, dini fanatizm, milli əsarət və ictimai ədalətsizlik zülmətindən keçirərək nəsillərə bəxş etmişlər" [8, s.71].

Ulu öndər şeiri, bədii ədəbiyyatı ürəkdən sevir, sözün təsir gücünü gözəl bilirdi. "Şübhəsiz ki, insanlara şeir qədər, ədəbiyyat qədər güclü təsir edən, yəni insanların mənəviyyatına, əxlaqına, tərbiyəsinə, fikirlərinin formalaşmasına bu qədər güclü təsir göstərən başqa bir vasitə yoxdur" – deyirdi. Xalqın bədii söz xəzinəsi, yaradılan hər bir əsər onun üçün hikmət dolu tərbiyə məktəbi idi. Bəlkə buna görədir ki, Dədə Qorqud müdrikliyi, Nizami humanizmi, Füzuli sevgisi, Nəsimi fəlsəfiliyi, Xətai hikməti, Vaqif nikbinliyi, Mirzə Cəlil gülüşü, Sabir lakonikliyi, Cavid düşüncəsi, Vurğun bədiiliyi, Vahabzadə yanğısı, Məmməd Araz dünyası onun ruhunda, nəfəsində yaşayırdı.

Məhz Heydər Əliyevin xidmətləri sayəsində ədəbiyyat sözün həqiqi mənasında yüksəliş və intibah dövrü keçirdi. Bunu onun hakimiyyətdə olduğu dövrlərdə gördüyü işlərlə yanaşı, müxtəlif görüşlərdə, yubiley gecələrində söylədiyi fikirlər, ayrı-ayrı sənətkarlara göstərdiyi diqqət və qayğı da sübut edir. Klassiklərin yubileylərinin

beynəlxalq səviyyədə qeyd olunması, ədəbi əsərlərin, külliyyatların toplanması və nəşri, fəxri adlar və mükafatların verilməsi, ev muzeylərinin yaradılması, abidələrin ucaldılması doğma dilin saflığına məhəbbət, ucalığına pərəstiş hissi ilə yanaşı, ümummilli liderin bədii ədəbiyyata ehtiram və məhəbbətindən irəli gəlirdi. Bədii ədəbiyyatı yaradanların taleyi, gün-güzəranına qayğı və diqqət onun əməli fəaliyyətinin ayrılmaz hissəsi idi. Ulu öndər yaxşı bilirdi ki, dünyada əbədiyaşar yeganə qüvvə sözdür, sözü uca tutanları isə zaman öz məhvərindən keçirə-keçirə yaşadır.

Heydər Əliyevə görə, yazıçı, şair dövrün nəbzini tutmağı bacarmalı, aktual mövzuları gündəmə gətirməli, ideya və bədii cəhətdən onları yüksək səviyyədə həll etməyi bacarmalıdır. Çünki cəmiyyətin inkişafının bütün mərhələlərində sözün − ədəbiyyatın və mədəniyyətin əsas vəzifəsi tərbiyələndirmək olmuşdur: “Bədii söz həqiqi vətənpərvərliyi, əməyi sevən, nəcib, mərd, yüksək şüurlu adamlar tərbiyə etməlidir, ...ideologiya mübarizəsində fəal iştirak edən adamlar tərbiyələndirməlidir”. Ulu öndər yazıçıya, şairə xalqın hörmətini tarixi ənənə, əcdadlardan gəlib çatmış bir xüsusiyyət sayırdı. Onun fikrincə, xalqın tarixindən danışanda, yaxud cəmiyyətə, dünyaya nə isə çatdırmaq istəyəndə ilk növbədə mədəniyyət, ədəbiyyat xadimlərinin yaratdığı əsərlərə, tarixi-memarlıq abidələrinə istinad olunur. Təsadüfi deyil ki, ulu öndər Azərbaycan ədəbiyyatının dünya ədəbiyyatına inteqrasiyasında ədəbiyyat xadimlərinin rolunu yüksək qiymətləndirirdi: “Azərbaycan Asiya ilə Avropanın birləşdiyi, qovuşduğu bir ərazidə yerləşən, amma Avropaya daxil olan bir ölkədir. Ancaq Azərbaycan öz kökünə, dini mənsubiyyətinə, ənənələrinə görə Şərq aləminə, İslam, türk dünyasına daxil olubdur. Bu qəbildən olan xalqlar, millətlər içərisində Azərbaycan xalqı XIX–XX əsrlərdə öz milli köklərindən ayrılmayaraq, ədəbiyyatını, mədəniyyətini dünyanın inkişaf etmiş Qərb mədəniyyəti, ədəbiyyatı ilə birləşdirə bilibdir. Bizim milli ədəbiyyatımızı, mədəniyyətimizi Qərb mədəniyyəti, ədəbiyyatı ilə birləşdirən, onun sintezini yaradan insanlar çox uzaqgörən, müdrik insanlar olubdur” [8, s.420].

Yazıçını “insan qəlbinin mühəndisi” adlandıran Heydər Əliyev onun insan zəkasına və qəlbinə təsir göstərmək kimi böyük mənəvi gücə malik olduğunu vurğulayırdı. Onun fikrincə, yazıçı, sənətkar həyatda da, şəxsi davranışı ilə də oxucusuna nümunə ola bilər.

Sovet ideologiyasının vaxtilə qoruyub yüksəyə qaldırdığı sənətkarların illər keçdikdən sonra Azərbaycana düşmən mövqedə olmaları fikrini Heydər Əliyev heç bir halda qəbul etmirdi. Xüsusilə ədəbiyyat, mədəniyyət xadimlərinin öz dövrünün, yaşadığı mühitin çərçivəsində böyümüş görkəmli yazıçı, siyasi xadim olduqları bildi-

yindən ulu öndər onların xatirəsinin, xidmətlərinin təhrif olunmasına yol vermirdi. XX əsrin əvvəllərində Azərbaycan üçün ömrünü fəda etmiş Nəriman Nərimanovun üzərindən "millətçi" damğasının götürülməsi, Cavidin cənazəsinin Sibirdən Naxçıvana gətirilməsi, Nəsimi, Vaqif, C.Cabbarlı, C.Məmmədquluzadə və digər ediblərin, incəsənət xadimlərinin xatirəsinin əbədiləşdirilməsi Heydər Əliyevin uğurlu siyasətinin nəticəsi idi. 1972-ci ildə Aşıq Ələsgərin 150 illik, 1973-cü ildə Nəsiminin 600 illik yubileyinin Bakıda və Moskvada qeyd edilməsi, 1976-cı ildə Füzulinin İraqdakı məqbərəsinin bərpası, 1981-ci ildə Nizami Gəncəvinin 800 illik yubileyinin qeyd edilməsi, 1982-ci ildə Şuşada Vaqifin məqbərəsinin tikilməsi, 1982-ci ildə Cavidin cənazəsinin Uzaq Sibirdən vətənə gətirilməsi, 1994-cü ildə Füzulinin anadan olmasının 500 illik yubileyinin ölkə miqyasında, 1999-cu ildə "Kitabi-Dədə Qorqud"un 1300 illik yubileyinin beynəlxalq səviyyədə qeyd edilməsi, müasiri olan sənətkarlara dövlət qayğısı, əsərlərinin nəşri kimi tədbirlər ulu öndərin Azərbaycan ədəbiyyatına diqqət və qayğısının təzahürüdür. Heydər Əliyev dünyadan nakam köçən, qədir-qiyməti bilinməyən, sovet ideoloji sisteminin qamçıladığı sənətkarların xatirəsini daha əziz tutur, sağlıqlarında nəsib olmayan hörməti, şərəfi gec də olsa qaytarmağa çalışırdı. O bu sənətkarların ev muzeylərinin yaradılmasına, abidələrinin qoyulmasına, əsərlərinin nəşr olunmasına, bir sözlə, onların "yarımçıq qalan işləri"ni tamamlamağa çalışırdı. Bütün bunlar, akademik İsa Həbibbəylinin dediyi kimi, məhz Heydər Əliyevin səyi nəticəsində XX əsrin 70–80-ci illərindən etibarən Azərbaycanda milli istiqlal ədəbiyyatının yeni mərhələsinin yarandığını söyləməyə əsas verir.

Heydər Əliyev ədəbiyyatın tədrisi məsələsini də unutmur, hələ sovet dövründə məktəb qarşısında tələblər qoyur, şəxsiyyətin hərtərəfli inkişafı üçün Azərbaycan ədəbiyyatı ilə yanaşı, dünya ədəbiyyatının, sovet ədəbiyyatının tanınmış nümayəndələrini öyrənməyi, onların əsərlərində irəli sürülən bəşəri ideyalardan bəhrələnməyi tövsiyə edirdi: "Məktəbdə ana dilini və ədəbiyyatın tədrisi formalarını və metodlarını təkmilləşdirmək, uşaqlarda sözə, obrazlı təfəkkürə məhəbbət hissi aşılamaq, onları ölkədə və respublikamızda ...mədəniyyətin nailiyyətləri ilə, rus, dünya və Azərbaycan poeziyası və nəsr klassiklərinin yaradıcılığı ilə, sovet ədəbiyyatının qızıl fonduna daxil olmuş görkəmli əsərlərlə tanış etmək lazımdır. Ana dilini, doğma xalqın ədəbiyyatını, mədəniyyətini dərindən bilmək elmli adam üçün zəruri keyfiyyətdir, sovet cəmiyyəti vətəndaşının şəxsiyyətinin hərtərəfli inkişafı üçün şərtdir" [7, s.98].

Ədəbiyyatın keçdiyi keşməkeşli yolun özünəməxsusluqlarını gözəl bilən Heydər Əliyevin bədii təfəkkür sahibləri, zaman və həyat, reallıq və xalq taleyi, tarixilik və müasirliklə bağlı ədəbi düşüncələri, qiymətli fikir və mülahizələri azərbaycançılıq

ideologiyasının formalaşmasında qiymətli mənbələrdəndir. Bu gün Azərbaycan ədəbiyyatının təşəkkülü, milli-mənəvi gücü ulu öndər Heydər Əliyevin adı ilə bağlıdır.

**Heydər Əliyevin siyasi-nəzəri irsində folklora münasibət**

Ulu öndər xalq yaradıcılığına, el ədəbiyyatına dərindən bələd idi. O bilirdi ki, xalqın ədəbiyyatı – ağız yaradıcılığı onun mənəviyyatının güzgüsü, zəkasının, məfkurəsinin, arzu-istəyinin, sevincinin və nifrətinin ifadəsidir. Uşaqlıqdan ailədə eşitdikləri, duyduqları onu ağız ədəbiyyatının, el deyimlərinin sehrinə salmışdı. "Heydər Əliyev körpəlik çağlarında anasının dilindən eşitdiyi laylaların, bayatıların, oxşamaların Azərbaycan xalqının özü qədər qədimliyini bildiyi üçün və xalq yaradıcılığının xüsusi deyim, təsir gücünə, qüdrətinə malik olduğunu bildiyi üçün duyaraq ona heyranlığını dəfələrlə dilə gətirmişdir" [10, s.62]. Ulu öndər həmişə bu nümunələrin hər birini miras kimi qorumağı, onlara qayğı ilə yanaşmağı tövsiyə edirdi.

Folklor nümunələrində ulu öndəri ən çox cəlb edən onlardakı millilik, vətənpərvərlik, ülvi duyğular və bəşəri idealların xəlqi tərənnümü idi. Sovet dövründə nəşr olunan "Qobustan", "Ulduz", "Azərbaycan" jurnallarında xalq ədəbiyyatı nümunələrinin verilməsi, televiziya verilişlərində müxtəlif janrlı folklor nümunələrinin səsləndirilməsi geniş yayılmışdı. Bölgələrdə aşıq məclisləri yaranır, folklor mərasimləri keçirilirdi. Heydər Əliyevin təşəbbüsü ilə el sənətkarlarının əsərləri toplanıb nəşr edilir, yubileyləri təşkil olunurdu. Ulu öndər sovet monopoliyası dövründə aşıq sənətinin inkişafı, milli mərasimlərimizin təbliği istiqamətində tədbirlərə rəhbərlik edir, milli-mənəvi dəyərlərimizin yetişməsi üçün zəmin hazırlayırdı. Azərbaycana rəhbərlikdən uzaqlaşdırıldığı dövrdə xalq ədəbiyyatına maraq və təbliği bir qədər zəifləsə də, ikinci dəfə hakimiyyətə qayıdışından sonra bu sahə yenidən onun qayğısını hiss etmiş, folklor antologiyası, folklor nəşrləri işıq üzü görmüşdür. "Kitabi-Dədə Qorqud" dastanlarının, Aşıq Ələsgərin yubileylərinin qeyd edilməsi, Folklor İnstitutunun yaradılması bu gün Heydər Əliyevin xalq ədəbiyyatına diqqət və sevgisinin yüksək təzahürü kimi qiymətləndirilir.

Heydər Əliyev tarixdən, keçmişdən danışanda türk dünyasının milli-mənəvi abidəsi "Kitabi-Dədə Qorqud" dastanlarının adını xüsusi iftixarla çəkirdi. 1970–1980-ci illərdə Azərbaycana rəhbərlik etdiyi dövrdə abidə ilə bağlı heç bir tədbirin keçirilmədiyini, təşəbbüsün belə irəli sürülmədiyini təəssüflə qeyd edirdi. O dövrdə milli mədəniyyət, milli tarixlə bağlı Moskvanın qadağası, müqaviməti qarşısında bir çox tədbirlər həyata keçirilirdi. Ancaq "Kitabi-Dədə Qorqud" "unudulmuş", kimsənin "yadına düşməmişdi". Siyasi lider bu unutqanlığı "Azərbaycana pantürkist damğası vurulduğuna, Azərbaycanda çox dəyərli insanların pantürkist adı ilə həbs olunduğuna, repressiyaya məruz qaldığına, əsərlərin, kitabların dağıdıldığına görə" alimlərin,

ictimai xadimlərin abidə ilə bağlı təşəbbüs qaldırmağa cəsarət etməmələrində görürdü [4, s.171].

Heydər Əliyevin 1999-cu il tarixli 98 saylı Sərəncamı ilə təsdiq edilmiş "Kitabi-Dədə Qorqud" dastanının 1300 illik yubiley mərasimində Almaniyanın Saksoniya əyalətinin Elm və İncəsənət üzrə Dövlət Nazirliyi və Kral Kitabxanası tərəfindən əlyazmanın faksimilesi Azərbaycan nümayəndə heyətinə təqdim olunmuşdur. Ulu öndər ona bağışlanan faksimilenin "Kitabi-Dədə Qorqud" irsinin gələcək nəsillərə daha təkmil çatdırılması və qorunub saxlanılması üçün AMEA M.Füzuli adına Əlyazmalar İnstitutuna verilməsi barədə Sərəncam imzalayır.

1300 illik yubileyinin keçirilməsi ilə bir daha dastanın – qədim abidənin tamamilə açılıb cəmiyyətə təqdim olunmasına şərait yaranır, üç il müddətində dastanla bağlı tədqiqatlar, məruzələr, çıxışlar onu dünyaya tanıdır və təsdiq edilir. "Kitabi-Dədə Qorqud" geniş tirajda nəşr olunub kitabxanalara hədiyyə edilir. İlk dəfə olaraq onun iki cildlik ensiklopediyası nəşr olunur; ensiklopediyada dastanın yaranması, mənşəyi, boyların bədii xüsusiyyətləri, bədii obrazlar, nəşr tarixi, tədqiqatçıları, tərcüməçiləri və s. barədə, həmçinin dastan motivləri əsasında çəkilmiş illüstrasiyalar, bəstələnmiş musiqilər, yazılmış nəsr, dram nümunələri haqqında dəqiq elmi məlumat verilirdi.

Heydər Əliyevə görə, "Kitabi-Dədə Qorqud"un yubiley tədbiri tarixi kökə, milli ənənələrə, milli-mənəvi dəyərlərə, mədəniyyətə, elmə, xalqın çoxəsrlik tarixinə olan hörmət, ehtiram bayramı idi. O, "Kitabi-Dədə Qorqud"un təkcə ədəbi abidə deyil, insanları sülhə, əmin-amanlığa, birliyə çağırış simvolu olduğunu Azərbaycan xalqının erməni təcavüzü nəticəsində sülhsevərliyini, humanistliyini, tolerantlığını qoruyub saxlaması ilə bağlayırdı.

Sovet dövründə folklor materiallarının qorunmasına göstərdiyi diqqəti Heydər Əliyev ikinci dəfə hakimiyyətə gəlişindən sonra daha da artırmış, müdrik və uzaqgörən siyasəti ilə xalq ədəbiyyatı incilərinin qorunması, təbliği sahəsində böyük işlər görmüşdür.

**Heydər Əliyev və klassik ədəbiyyat**

Çoxəsrlik tarixi olan "Kitabi-Dədə Qorqud" abidəsi, Xaqani, Nizami, Nəsimi, Füzuli, Xətai, Vaqif, Seyid Əzim yaradıcılığı ilə, aşıq poeziyasının bənzərsiz nümunələri ilə zəngin Azərbaycan ədəbiyyatı Heydər Əliyevin sözləri ilə desək, "klassik Azərbaycan ədəbiyyatı öz inkişafında insana böyük məhəbbətlə dolu olan ecazkar, fəlsəfi lirikanın, orta əsrlərin ictimai və mənəvi buxovları əleyhinə çevrilmiş üsyankar, azad fikirli şeirin parlaq yollarından keçmişdir, ...bu yolları dəf etdikdən sonra XX əsrin ideya və estetik zirvələrinə yüksəlmişdir. Sovet dövründə bu ədəbiyyat görünməmiş keyfiyyət sıçrayışı etmiş, xəlqilik bayrağı altında inkişaf edən ədəbiyyat

olmuşdur. Qısa tarixi müddət ərzində ədəbi mühit nəinki yeni əsərlərlə, habelə yeni mövzularla, yeni janr və formalarla zənginləşmiş, böyük və cəsarətli bədii ümumiləşdirmələr yoluna çıxmışdır... Cəfər Cabbarlı, Məmməd Səid Ordubadi, Səməd Vurğun, Hüseyn Cavid, Mikayıl Müşfiq, Mehdi Hüseyn kimi görkəmli sənətkarların və bir çox digər yazıçıların ədəbiyyat xəzinəsinə daxil olmuşdur" [11].

Azərbaycan KP MK-nın birinci katibi vəzifəsində çalışarkən Heydər Əliyev ədəbiyyat klassiklərinin irsinin tədqiqinə və təbliğinə xüsusi diqqət ayırırdı. "Bədii ədəbiyyat klassiklərinin əsərlərinin tədqiqi, nəşri və təbliğinin yaxşılaşdırılması tədbirləri haqqında", "Böyük Azərbaycan şairi və mütəfəkkiri Nizami Gəncəvinin ədəbi irsinin öyrənilməsi, nəşri və təbliği işinin yaxşılaşdırılması haqqında", "Azərbaycan şairi və maarifçisi Mirzə Şəfi Vazehin yaradıcılıq irsinin öyrənilməsinin gücləndirilməsi haqqında" qərarlar bu diqqətin bariz nümunəsidir.

Heydər Əliyev nəinki Azərbaycanda, hətta ölkədən kənarda da klassik irsin nümayəndələrinə qayğı və ehtiram göstərir, onların xatirəsinin əbədiləşdirilməsi üçün əlindən gələni əsirgəmirdi. Ulu öndər ədəbiyyat nümayəndələri ilə bağlı keçirilən bütün tədbirlərdə iştirak edir, məzmunlu çıxışları ilə ədəbiyyatımızın zənginliyini, bəşəriliyini bir daha sübuta yetirmiş olurdu.

Sankt-Peterburqda Nizami Gəncəvinin abidəsinin təntənəli açılış mərasimindəki nitqində o bu hadisəni – şairə abidə ucaldılmasını dünya mədəni irsinə böyük ehtiramın ifadəsi, Azərbaycan xalqına bəslənilən dostluq və qardaşlıq hisslərinin təzahürü kimi qiymətləndirmişdir. Heydər Əliyev Bakıda rus poeziyasının dühası A.S.Puşkinə, Puşkinin "böyük Pyotrun əsəri" adlandırdığı Sankt-Peterburqda isə Nizamiyə abidənin ucaldılmasını xalqların mədəniyyətinə hədsiz ehtiramın və ölkələr arasında əlaqələrin yeni təcəssümü adlandırmışdır. Onun fikrincə, şairin bütün əsərlərində bəşər övladının misilsiz qüdrətinin tərənnümü ona Sankt-Peterburqun ayrılmaz hissəsinə çevrilmək şərəfini qismət etmişdir. Açılış mərasimində ulu öndər demişdi: "Nizaminin cəmiyyətdəki rolunun mərkəzində varlığın ən böyük sərvəti, mənəvi zənginlik və müdrikliyin tükənməz mənbəyi olan insan dayanır. Nizami insanın cəmiyyətdəki rolunu özünün dünyagörüşü süzgəcindən keçirərək yaradıcılığında antik yunan və Roma irsini, Şərq fəlsəfəsini və Şərq poeziyasının çoxəsrlik ənənələrini əks etdirə bilmişdir" [5, s.42].

Heydər Əliyevin çox sevdiyi şairlərdən biri də Məhəmməd Füzuli idi. 1994-cü ildə iqtisadi vəziyyətin çətin olmasına baxmayaraq, ulu öndər şairin yaradıcılığının, ədəbi, elmi, fəlsəfi irsinin layiqli qiymətləndirilməsi üçün 500 illik yubileyinin yüksək səviyyədə keçirilməsini vacib hesab etmiş və bunu XX əsrdə yaşayan nəslin minnətdarlığı kimi dəyərləndirmişdir. O, Azərbaycanın bugünkü mədəniyyətinin dahi

şəxsiyyət tərəfindən yaradıldığı, bunun əsrlərdən-əsrlərə keçən mədəniyyətə əsaslandığını, dünya xalqlarının şairi özününkü saymaqlarına qarşı Füzulini Azərbaycan xalqının dahi şəxsiyyəti kimi dünyaya tanıtmağı, onun necə böyük şair, mütəfəkkir, filosof olduğunu, dünya mədəniyyətinə nə qədər töhfə verdiyini, onu necə zənginləşdirdiyini əminliklə vurğulayırdı: "Füzuli 500 il bundan qabaq da nurlu bir ulduz kimi parlayıbdır, dünyaya öz şüalarını yayıbdır. Füzuli təkcə Şərqdə yox, müsəlman aləmində, türk dünyasında yox, bütün dünyada, o cümlədən inkişaf etmiş Qərb ölkələrində çox məşhur olmuşdur. Amma Azərbaycan xalqı üçün, bizim üçün Füzuli daha əziz olmuş, sevilmiş, son əsrdə xüsusilə yüksək zirvələrə qaldırılmışdır. Bu gün çox böyük iftixar hissi ilə deyə bilərik ki, Füzuliyə bizim Azərbaycan xalqının, Azərbaycan alimlərinin verdiyi qiymət, onun əsərlərindən daim bəhrələnməsi xalqımızın öz kökünə, adət-ənənəsinə, öz keçmişinə, öz tarixinə, dininə, dilinə nə qədər sadiq qalmasını sübut edir [1, s.479–480].

Heydər Əliyevə görə, Füzuli əsərləri, yaradıcılığı ilə insanların qəlbində özünə yenilməz bir heykəl, abidə yaratmışdır. Hər bir azərbaycanlının qəlbində ucalan bu abidə fırtınalardan, küləklərdən, zəlzələlərdən keçərək yaşayır, zirvələri fəth edir. Şairin yaradıcılığını təhlil edərək ulu öndər onun əsərlərinin insanı, cəmiyyəti tərənnüm etdiyini, insanlarda, cəmiyyətdə mənfiliklərə etirazını, nifrətini bildirdiyini əminliklə ifadə edirdi. O bu əsərlərdə sevgi, insani münasibət, sədaqət, etibarlılıq kimi ülvi duyğuları bütün dövrlər və insanlar üçün yüksək mənəvi keyfiyyətlər hesab edirdi.

Keçmişdə ədəbiyyatımızın, tariximizin, milli-mənəvi dəyərlərimizin indiki kimi dərk edilmədiyini vurğulayan Heydər Əliyev bu gün onları çəkinmədən təbliğ edə bildiyimizi dövlətimizin müstəqilliyi ilə əlaqələndirirdi. Orta əsrlərdə Kərbəla torpağında yaşamış Məhəmməd Füzuli də yaradıcılığı ilə xalqın milli mənlik duyğularını, milli dəyərlərini təbliğ etmişdir. Heydər Əliyev şairin yaradıcılığını bu mənada yüksək qiymətləndirirdi: "Biz fəxr edirik ki, xalqımız öz böyük şəxsiyyətləri vasitəsilə Azərbaycanın milli-mənəvi dəyərlərini daim qoruyub saxlamış, zənginləşdirmiş və bu gün də ümumbəşəri dəyərlərin bir hissəsinə çevirmişdir. Biz fəxr edirik ki, Məhəmməd Füzuli kimi dahi şairimiz var, böyük alimimiz var, böyük filosofumuz var" [3, s.29].

Ulu öndər "Füzuli yaradıcılığı milli-coğrafi sərhəd tanımır, dünya mədəniyyətinin incisinə çevrilərək xalqlar arasında mənəvi-mədəni əlaqələrin möhkəmlənməsində, millətlərin bir-birinə yaxınlaşmasında əvəzsiz rol oynamışdır" – deyirdi. O, ədəbiyyatçılara Füzulini dünyaya tanıda biləcək bir kitabın yazılmasını tapşırırdı: "Füzuli haqqında elə bir kitab lazımdır ki, biz onu ingilis, fransız, alman, ərəb, fars dillərinə tərcümə edib yayaq".

Heydər Əliyev Füzulinin hər zaman türk xalqlarının birliyinə önəm verdiyini, türk dünyası XX əsrdə parçalanmış olduğu bir halda, türkü yaşadıb bu günlərə gətirdiyini qürurla qeyd edirdi. O, şairin bütün türk xalqları tərəfindən sevildiyini Türkiyənin Böyük Millət Məclisinin salonunda Füzuliyə həsr olunmuş yubiley mərasimindəki çıxışında xüsusilə vurğulamışdı: "Ərəblər və farslar Füzulini öz şairi sayırlar. Türkdilli xalqlar isə hesab edirlər ki, o, türkdür. Biz də deyirik ki, Füzuli türk, azərbaycanlıdır. Eyni zamanda bunu türkmən, özbək, qazax, Türkiyədə yaşayan türklər, İraq türkmənləri də deyə bilərlər. Qoy Füzuli hamıya məxsus olsun, tarixə bəşəri bir şəxsiyyət kimi düşsün.

...Füzuli azərbaycanlıdır, Azərbaycan köklüdür, onun yaradıcılığı Azərbaycan ədəbiyyatı və mədəniyyətinin bəhrəsidir. Füzuli başqa ölkələrdə də məşhurdur. Lakin onu azərbaycanlılar qədər özününkü sayan yoxdur" [8, s.204].

Heydər Əliyev klassik ədəbiyyat nümayəndələrinin əsərləri ilə tanış olduqca xalqın nə qədər müdrik və istedadlı olduğuna əminliyini bir daha ifadə edirdi. Nizami, Xaqani, Nəsimi, Füzuli, Vaqif, Mirzə Fətəli Axundov, Seyid Əzim Şirvani, Nəcəf bəy Vəzirov və digər sənətkarlar özlərindən sonra zəngin bir irs qoyub getməklə ədəbiyyatımızın bəşəriliyini, milliliyini, humanistliyini dünyaya çatdırmışlar.

Azərbaycan ədəbiyyatına böyük töhfələr verən Mirzə Fətəli Axundzadənin yaradıcılığını elmi-fəlsəfi aspektdən təhlil edən ulu öndər deyirdi: "Mirzə Fətəli ...həm Şərqin ona qədər yaratdıqlarını, həm də qədim yunan, rum, antik ədəbiyyat, qədim hind ədəbiyyatı nümunələrini öz əsərlərində cəmləyərək yaradıcılığında Şərqin və Qərbin sintezinin nəticəsi olaraq şeirin, elmin, fəlsəfənin ən yüksək zirvələrinə çatmışdır" [8, s.348].

Klassiklərin yaradıcılıqları boyu ədəbiyyatdan cəmiyyətin eybəcərliklərinə qarşı mübarizə və tərbiyə vasitəsi kimi istifadə etdiklərini Heydər Əliyev xüsusilə qiymətləndirirdi. O, müasir dövr sənətkarlarını onlardan öyrənməyə, ibrət almağa çağırırdı: "Bizim klassiklərimiz dinə qarşı amansız, barışmaz mübarizədə ədəbiyyatdan və incəsənətdən cəsarətlə və məharətlə istifadə edirdilər. Çox çətin, həyat üçün təhlükəli şəraitdə Cəlil Məmmədquluzadə, Sabir və başqaları dini, onun xadimlərini qorxu bilmədən ifşa edirdilər, xalqın şüurunu oyadırdılar, həqiqətən böyük vətəndaşlıq hünəri göstərirdilər. Yazıçılarımız öz sələflərinin işini davam etdirməlidirlər. Bu ənənələri inkişaf etdirmək sizin vəzifənizdir" [8, s.22].

Ulu öndər Azərbaycan xalqının özünütanıtımında böyük rol oynamış klassik ədəbiyyat nümayəndələrinə yüksək qiymət verir, onların əsərlərindən, ədəbiyyata gətirdikləri yeniliklərdən həvəslə söz açırdı. Xüsusilə də XIX – XX əsrlərdə

ədəbiyyatda baş verən hadisələr, ədəbiyyatın milliləşməsi və demokratikləşməsi, yeni tendensiyaların təzahürü bu dövrün tarixi əhəmiyyətini artırırdı.

**Heydər Əliyev və Müasir Azərbaycan ədəbiyyatı**

XX əsrin əvvəllərində Azərbaycan üçün ömrünü fəda etmiş N.Nərimanovun üzərindən "millətçi" damğasının götürülməsi, Cavidin cənazəsinin Sibirdən Naxçıvana gətirilməsi, Nəsimi, Vaqif, C.Cabbarlı, C.Məmmədquluzadə və digər ədiblərin, incəsənət xadimlərinin xatirəsinin abidələrlə əbədiləşdirilməsi məhz Heydər Əliyevin ədəbiyyatla bağlı uğurlu siyasətinin nəticəsi idi.

Sovet dövründə Sibirdən Azərbaycana cənazə gətirmək asan iş deyildi; bu, böyük cəsarət, iradə tələb edirdi. Lakin Heydər Əliyev həm böyük ədibə, həm xalqına, həm də ədəbiyyata olan sədaqətini və vətəndaşlıq borcunu yerinə yetirərək bu çətin işin öhdəsindən gəldi. Cavid əfəndini "qara siyahılar"dan, "pantürkist" damğasından xilas edib 100 yaşında yenidən dünyaya gətirdi – 1882-ci ildə Naxçıvanda doğulmuş Cavid 100 yaşında yenidən bu torpağa, Azərbaycana qaytarıldı. Cavidin ölümündən sonra onun haqqında ən böyük əsəri də o böyük şəxsiyyət – Heydər Əliyev yazdı.

Cavidin qəhrəmanları, onların daxili "mən"inin qanunlara qarşı çıxıb içindən gələn harayı eşitməsini, ona tabe olmasını Heydər Əliyev insanın özünüdərki kimi qiymətləndirirdi. Təsadüfi deyil ki, ikinci dəfə ölkə rəhbəri seçiləndən sonra ulu öndərin Cavid irsinə diqqəti daha da artır. 2002-ci ildə o, Hüseyn Cavidin 120 illik yubileyinin keçirilməsi ilə bağlı sərəncam imzalayır. Sərəncamda deyilirdi: "Hüseyn Cavid klassik milli ədəbiyyatın ənənələri ilə yeni dövrün bədii və fəlsəfi axtarışları arasında vəhdət yaradaraq XX əsr Azərbaycan ədəbiyyatının inkişafında misilsiz rol oynamış qüdrətli sənətkarlardandır. Dünya romantizm poeziyası ilə qırılmaz tellərlə bağlı olan Hüseyn Cavid yaradıcılığı öz bədii-estetik qaynağını Azərbaycan mədəniyyətinin dərin tarixi qatlarından alır.

Azərbaycan poeziyasında yeni zirvə fəth edən filosof-şair Cavid romantik bədii düşüncənin, fəlsəfi lirikanın orijinal nümunələrini yaratmışdır. Onun həyatın mənası ilə bağlı axtarışlarının ifadəsi olan yaradıcılığı bədii növ, janr və forma cəhətdən rəngarəng və zəngindir. Yüksək bədii sənətkarlığı, dərin emosionallığı ilə seçilən Hüseyn Cavid poeziyası milli ədəbiyyat tarixində yeni bir dövrün başlanğıcını qoymuşdur.

Dövrün ümumbəşəri problemlərinin əks olunduğu dram əsərləri ilə H.Cavid romantizmin görkəmli nümayəndələrindən biri kimi, Azərbaycan dramaturgiyası tarixində yeni bir mərhələ yaratmışdır.

...Poeziyada və dramaturgiyada bənzərsiz sənət nümunələri olan əsərlər yaradan Hüseyn Cavid bir şəxsiyyət, mütəfəkkir və sənətkar kimi ibrətli həyat və yaradıcılıq yolu keçmişdir. Böyük şair Hüseyn Cavidin əsərləri Azərbaycan ədəbiyyatının qızıl

fonduna həmişəlik daxil olmuşdur" [6, s.120–121].

Heydər Əliyev bilirdi ki, Hüseyn Cavid XX əsrin əvvəllərində müasirləri ilə birgə yaşayıb yaratsa da, onlardan fərqli olaraq, "dünyanın bölündüyü və dünya xəritəsinin yenidən cızıldığı bir dövrün sənətkarıdır" [9, s.34].

Sovet ideologiyasının vaxtilə qoruyub yüksəkliklərə qaldırdığı sənətkarların illər sonra Azərbaycanın düşməni olmaları fikrini Heydər Əliyev heç cür qəbul etmirdi. Xüsusilə ədəbiyyat, mədəniyyət xadimlərinin öz dövrünün, yaşadığı mühitin çərçivəsində böyümüş görkəmli yazıçı, siyasi xadim kimi xatirəsinin, xidmətlərinin təhrif olunmasına heç vaxt yol vermirdi. Vaxtilə Nəriman Nərimanov Moskvada işləyərkən müstəqil demokratik dövlətin üzvlərini qorumuş, müdafiə etmiş, çar ordusunun, daha sonra müstəqil dövlətin məşhur generalları Mehmandarovu, Şıxlinskini, M.Ə.Rəsulzadəni həbsdən xilas etmişdi. Heydər Əliyev N.Nərimanovun Azərbaycanın tarixində xidməti olan, böyük bir ədəbi irs qoyub gedən şəxsiyyət kimi xatirəsinin əbədiləşdirilməsini mənəvi borc hesab edirdi.

Müsavat partiyasının üzvü, böyük dramaturq, yazıçı Cəfər Cabbarlı, romantizmin qüdrətli nümayəndəsi Hüseyn Cavid ən gözəl əsərlərini sovet dövründə yazmışlar. Heydər Əliyevin qeyd etdiyi kimi, sovet dövrü gəncliyi bu əsərlərlə tərbiyə olunmuşdur. Uzun illər Cavidin əsərləri qadağan edilib özü həbs olunsa da, "tarix hər şeyi öz yerinə qoydu".

Azərbaycan dramaturgiyasının ən gənc nümayəndəsi Cəfər Cabbarlının – "dramatik vəziyyətlərlə dolu olan çox mürəkkəb bir dövrdə ədəbiyyata gələn" sənətkarın həyatını Heydər Əliyev ömrünü xalqa xidmət göstərməyə həsr etmiş möhkəm əqidəli, coşqun ehtiraslı döyüşçünün, alovlu vətəndaşın həyatına bənzədirdi. Çoxşaxəli yaradıcılığa malik şair, yazıçı, dramaturq müasir Azərbaycan dramaturgiyasının əsasını qoymuş, onu rəngarəng mövzularla inkişaf etdirmiş, teatr mədəniyyətinə çoxsaylı səhnə əsərləri bəxş etmişdir. M.F.Axundzadə və C.Məmmədquluzadədən gələn ənənələri inkişaf etdirib zənginləşdirən C.Cabbarlı zəmanəsinin novator sənətkarı olmuşdur. Ədibin yaradıcılığını – istər lirik, epik, istərsə də dram əsərlərini təhlil süzgəcindən keçirdikdə onun qədər sovet ideologiyasına sadiq ikinci bir dramaturq tapmaq çətindir. Sovet dövrü ədəbiyyat dərsliklərində də onun haqqında belə yazılırdı: "Azərbaycan sovet dramaturgiyasının banisi".

1969-cu ildə Heydər Əliyevin sərəncamına əsasən C.Cabbarlının anadan olmasının 70 illiyi ilə bağlı təntənəli tədbir keçirildi. Az sonra Moskvada ümumittifaq səviyyəsində ədibin yubileyi qeyd olundu. Yubiley sovet tədbirləri çərçivəsində keçirilsə də, Cəfər Cabbarlı sanki yenidən kəşf olundu, yaradıcılığında kölgəli məqamlar üzə çıxdı. Sovet ədəbiyyatşünaslığının tənqidindən yayınan əsərlər ictimaiy-

yətə tanıdıldı.

Heydər Əliyev C.Cabbarlı yaradıcılığının xalqın azadlıq mübarizəsi tarixinin parlaq lövhələrini, zəmanə qəhrəmanlarının obrazını, istismarçı cəmiyyətin, altun dünyasının eybəcərliklərini sarsıdıcı ifşa edən səciyyəvi xüsusiyyətləri ilə tanış idi. Ədibin, xüsusilə Şərq qadınının silkinib azadlığa çıxmasında oynadığı rolu, unudulmaz qadın obrazları silsiləsi yaratdığını Heydər Əliyev bir oxucu deyil, ədəbiyyatşünas fəhmi ilə qiymətləndirirdi. Dramaturqun abidəsinin açılışında ulu öndər çıxış edərək demişdir: “Şəxsiyyəti dövr, zaman yetişdirir. ...Lakin şəxsiyyət də dövrün, zamanın ən mühüm xüsusiyyətlərini ifadə edərək onu səciyyələndirir. Cəfər Cabbarlı məhz belə xadim idi, o, yeni həyat yaradılmasının mürəkkəb, çətin, lakin müzəffər prosesini öz istedadının bütün qüdrəti ilə əks etdirmişdir, əsərlərində öz dövrünün fəlsəfəsini və psixologiyasını, dövrlər arasındakı qırılmaz əlaqəni, xalqın tarixi müqəddəratının rəşadətli səhifələrini açıb göstərmişdir” [8, s.165–167].

1970-ci illərdə ölkə başçısı ədəbiyyatın, yazıçıların yaradıcılığının respublikanın ictimai-siyasi həyatı ilə bağlılığına, onların problemlərdən kənara çəkilməməyi, xalq qarşısında məsuliyyət daşıdıqlarını heç vaxt unutmayacaqlarını yeri düşdükcə xatırladırdı. Heydər Əliyevə görə, Azərbaycan yazıçılarının əsas qayğısı zəmanə və müasirlər haqqında əsərlər yaratmaq olmalıdır. Bu əsərlərin qəhrəmanları da yüksək təfəkkürlü, əməyi ilə ölkəsinin maddi-mənəvi sərvətlərini artıran, həyatı gözəlləşdirən insanlar olmalıdır.

1980-ci illərdə bir sıra mədəniyyət xadimlərinə fəxri adlar verilir. Onların arasında yazıçı və şairlər də var idi; xalq yazıçısı Süleyman Rəhimov “Xalqlar Dostluğu” ordeninə, yazıçı İmran Qasmov, İlyas Əfəndiyev “Xalq yazıçısı” fəxri adına, yazıçı Xalidə Hasilova “Qırmızı Əmək Bayrağı” ordeninə, yazıçı İshaq İbrahimov “Əməkdar incəsənət xadimi” fəxri adlarına layiq görülürlər. Ölkə rəhbəri Heydər Əliyev onların hər birinin yaradıcılıq yolunu qiymətləndirmiş, özünün bədii təhlil süzgəcindən keçirmişdir.

**Heydər Əliyev və müstəqillik dövrü Azərbaycan ədəbiyyatı**

Heydər Əliyevin Azərbaycana ikinci hakimiyyəti dövründə − 1990-cı illərdə bütün sahələrdə olduğu kimi, ədəbiyyat sahəsində də milli ruh, milli canlanma özünü göstərdi. Milli özgürlüyünə qovuşan xalqın düşüncəsinin, təfəkkürünün, ruhunun formalaşmasına təsir göstərən, bütün proseslərin önündə gedən, insanları arxasınca aparan ən güclü vasitə − söz, ədəbiyyat idi. Bəxtiyar Vahabzadənin, Xəlil Rzanın, Məmməd Arazın, Yusif Səmədoğlunun əsərləri və digər əsərlər açıq-açığına xalqa milli oyanış hissləri aşılayır: milli ruhu oyadır, milli dirçəlişi gücləndirir, vətənə sədaqət, vətənə sevgi, azərbaycanlı olmaq hisslərini formalaşdırırdılar. Heydər Əliyev

bunu bilirdi. O, M.Araz, B.Vahabzadə şeirlərini sevir, onların yaradıcılıq gecələrində iştirak edirdi. M.Arazın yaradıcılıq gecəsində ulu öndər demişdi: "...İnsanlara şeir qədər, ədəbiyyat qədər, mədəniyyət nümunələri qədər güclü təsir edən, yəni insanların mənəviyyatına, əxlaqına, tərbiyəsinə, fikirlərinin formalaşmasına bu qədər güclü təsir göstərən başqa bir vasitə yoxdur. Bu vasitədən xalqımız keçmişdə də istifadə edibdir. Bizim mütəfəkkir insanlarımız, şəxsiyyətlərimiz, böyük alimlərimiz, yazıçılarımız məhz bununla fəxr edirlər ki, onlar xalqın içindən çıxaraq böyük mədəniyyət, ədəbiyyat, şeir nümunələri yaradaraq xalqı oyadıblar, qaldırıblar, ruhlandırıblar, mübarizəyə dəvət ediblər" [2, s.364].

Bu mənada Heydər Əliyev B.Vahabzadə, M.Araz və X.R.Ulutürkün adlarını fərəhlə çəkirdi. 1995-ci ildə hər üç sənətkarı ulu öndər müstəqil Azərbaycanın ən yüksək mükafatı – "İstiqlal" ordeni ilə təltif edir. Heydər Əliyevə görə, bu sənətkarlar xalqda milli oyanış, milli dirçəliş, milli ruhun canlanması üçün öz yaradıcılıqları ilə çox işlər görmüş, əvəzsiz xidmət göstərmişlər. İnsanlara şeir qədər, ədəbiyyat qədər, mədəniyyət nümunələri qədər güclü təsir edən, əxlaqına, mənəviyyatına, tərbiyəsinə, fikirlərinin formalaşmasına təsir göstərən ikinci bir vasitənin olmadığını ulu öndər yaxşı bilirdi. O deyirdi: "Məmməd Araz, Bəxtiyar Vahabzadə, Xəlil Rzanın qəhrəmanlığı (mən bu sözü tam cəsarətlə deyirəm) elə ondan ibarətdir ki, onları heç bir şey qorxutmayıbdır. Onların qarşısını heç bir şey kəsməyibdir. Onlar öz işlərini görüblər. Xırda-xırda, çox incə, çox zərif görüblər və məhz bu incəliyə, zərifliyə, nazikliyə görə də sizin bu fikirləriniz bizim vətənpərvər insanlarımızın, xalqımızın ürəyinə yol tapıbdır" [8, s.252].

**Nəticə / Conclusion**

Ədəbiyyatı xalqın milli sərvətlərindən hesab edən Heydər Əliyev onun xalqımıza böyük faydalar gətirdiyinə inanır və bununla fəxr edirdi. O, xalqa yol göstərmək, cəmiyyətdə olan nöqsanları aradan qaldırmaqla ədəbiyyatın, bədii sözün imkanlarını, gücünü, milli oyanışın, dirçəlişin, milli özünüdərkin xalqa ilk növbədə ədəbiyyatdan keçdiyinə əmin idi. Bu gün ümummilli lider Heydər Əliyevin azərbaycançılıq ideologiyasının, milli-mənəvi, əxlaqi-estetik dəyərlərin formalaşmasında bədii ədəbiyyatın rolu, təsiri və mahiyyəti haqqında fikirləri ədəbiyyatşünaslıqda dəyərli mənbələrdən hesab olunur.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Əliyev H. (1997). Müstəqilliyimiz əbədidir. Çıxışlar. Nitqlər. Bəyanatlar. Məktublar. Müsahibələr. II kitab. May, 1994. Red. Ramiz Mehdiyev, Hidayət Orucov. Bakı, Azərnəşr. 604 s.
2. Əliyev H. (1997). Müstəqilliyimiz əbədidir. Çıxışlar. Nitqlər. Bəyanatlar. Məktublar. Müsahibələr. III kitab. Dekabr, 1994. İyun, 1995. Red. Ramiz Mehdiyev, Hidayət Orucov. Bakı, Azərnəşr. 488 s.
3. Əliyev H. (1998). Müstəqilliyimiz əbədidir. Çıxışlar. Nitqlər. Bəyanatlar. Məktublar. Müsahibələr. VIII kitab. Noyabr, 1996. Mart, 1997. Red. Ramiz Mehdiyev. Bakı, Azərnəşr. 488 s.
4. Əliyev H. (2006). Müstəqilliyimiz əbədidir. Çıxışlar. Nitqlər. Bəyanatlar. Müsahibələr. Məruzələr. Məktublar. Müraciətlər. XIX kitab. Yanvar, 1999. Aprel, 1999. Red. Ramiz Mehdiyev. Bakı, Azərnəşr. 528 s.
5. Əliyev H. (2012). Müstəqilliyimiz əbədidir. Çıxışlar. Nitqlər. Bəyanatlar. Məktublar. Müsahibələr. XXXIX kitab. Red. Ramiz Mehdiyev. Bakı, Azərnəşr. 480 s.
6. Əliyev H. (2012). Müstəqilliyimiz əbədidir. Çıxışlar. Nitqlər. Bəyanatlar. Məktublar. Müsahibələr. XLII kitab. Red. Ramiz Mehdiyev. Bakı, Azərnəşr. 472 s.
7. Əliyev H. (2002). Təhsil millətin gələcəyidir. Tərtib edənlər: M.Mərdanov, Ə.Quliyev. Bakı, Təhsil. 580 s.
8. Əliyev H. (1999). Ədəbiyyatın yüksək borcu və amalı. Tərtibçi: V.Quliyev. Bakı, Ozan. 496 s.
9. Əliyev K. (2008). Hüseyn Cavid: həyatı və yaradıcılığı. Bakı, Elm və təhsil. 324 s.
10. Əlizadə M. (2006). Heydər Əliyevin inamı və idrakı. Bakı, Bakı Universiteti Nəşriyyatı. 228 s.
11. “Kommunist” qəzeti. (1976, 27 may).

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 28–35
doi.org/10.48445/x5166-5521-6355-z

D İ L Ç İ L İ K   M Ə S Ə L Ə L Ə R İ

# İslam Səfərli yaradıcılığında dil və üslub xüsusiyyətləri

***Sədaqət Həsənova***
Filologiya üzrə elmlər doktoru, professor, Əməkdar müəllim, Naxçıvan Dövlət Universiteti. Azərbaycan. E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**XÜLASƏ**
Məqalədə Azərbaycanın nəğməkar şairi İslam Səfərlinin yaradıcılığından danışılır, əsərlərindəki dil və üslub xüsusiyyətləri təhlil olunur. Şairin ədəbi dildəki mövqeyini müəyyənləşdirmək üçün şeirlərindəki bir sıra söz və ifadələrdən bəhs edilir. Yaradıcılığının linqvistik cəhətdən araşdırılması onu göstərir ki, şair, milli sözləri qoruyan və onları aktivləşdirən söz sənətkarıdır. Məqalədə ədibin aforistik ifadələr və poetik sintaksis nümunələr yaratması məsələsinə də toxunulur.

**AÇAR SÖZLƏR**
dil, söz, poeziya, üslub, ifadə

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 17.10.2023
qəbul edilib: 22.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 28–35
doi.org/10.48445/x5166-5521-6355-z

LINGUISTIC ISSUES

# Language and stylistic characteristics of Islam Safarli

***Sadagat Hasanova***
Doctor of Philology, Professor, Honored teacher, Nakhchivan State University.
Azerbaijan. E-mail: sedagethesenova@gmail.com
https://orcid.org/0000-0002-0839-8469

**ABSTRACT**
The article talks about the work of Azerbaijan's songwriter Islam Safarli. For this purpose, its language and stylistic features are analyzed. In order to determine the position of the poet in the literary language, a number of words and phrases in his poems are discussed. Linguistic analysis of Islam Safarli's work shows that he is a word artist who preserves and activates national words. The article also touches on the poet's creation of aphoristic expressions and examples of poetic syntax.

**KEYWORDS**
language, word, poetry, style, expression

**ARTICLE HISTORY**
Received: 17.10.2023
Accepted: 22.11.2023

*Vətən üçün, xalq üçün*
*Söz qalacaq dünyada.*
*İ.Səfərli*

**Giriş / Introduction**

İslam Səfərli Azərbaycan ədəbi dilində öz dəsti-xətti olan şairlərdəndir. Onun özünəxas dil və üslub xüsusiyyətləri bizə bu fikri söyləməyə əsas verir. "Təzə sözlü olarsan, öz izinlə yerisən" − deyən şair, oxucu zövqünü oxşayan, əsərlərində düşüncə, duyğu və söz ahəngi bir-birini tamamlayan sənətkarlardandır. Onun yaradıcılığının dilçilik baxımından araşdırılması ədəbi-bədii dilimizin müəyyən bir dövrünün dərindən öyrənilməsi baxımından faydalıdır. Ümumiyyətlə, adi dildə az görünüb, az dərk edilənlərin şeir dilində özünü qabarıq şəkildə ifadəsi və daha çox hiss olunması mənasında ayrı-ayrı sənətkarların yaradıcılığının araşdırmalara cəlb olunması hər dövrdə aktualdır. Qeyd edək ki, bu, bədii dilimizin hərtərəfli öyrənilməsi və tanınmasında olduqca əhəmiyyətlidir.

**Əsas hissə / Main part**

İslam Səfərli söz və məna seçimi bacarığı ilə tanınan, şeirlərinə çox sayda nəğmələr bəstələnən şairlərdəndir. Onun əsərləri hiss və həyəcanların ahəngli ifadəsi və emosional zənginliklə səciyyəvidir:

Torpağın ətrini sinəmə çəkdim,
Dodağım gül açdı, ürəyim çiçək.
Xəzər sahilində bir çinar əkdim,
Söyüdlər nazlandı gülümsəyərək.
Dəniz mahnısını oxudu sanki
Ətəyi ləpəli, qırçınlı Bakı...
Kükrədi ilhamım, qaynadı qanım,
Sənə qurban canım, Azərbaycanım! [4, s.13]

Bu misralar ürəyində vətən sevgisi daşıyan insanları həyəcanlandırmaya bilməz. İslam Səfərlinin vətən mövzusunda olan əsərlərini oxuduqca düşünürsən ki, bu söz və kəlamlar insanları birliyə çağırır. Mənalı fikirlərin arxasında həssas bir şair ürəyi dayanır. Bu ürəkdən qopan sözlər poeziyanın dəyərini əks etdirir:

Ağ bir şərid kimi uzanıb gedir,
Dumanlı, çiskinli, günəşli yollar,

Bəzisi həyatdan usanıb gedir,
Mənimsə yollarda hekayətim var.
El özü qoruyar axarlı şeiri,
Dağlar quzey qarı sərində saxlar.
Bağrıma basmasam hər qarış yeri,
Torpaq öz sirrini dərində saxlar [4, s.13].

Yolları, dağları, torpağı obrazlaşdıran şairin poetik nəfəsi özünəməxsusdur. Başqa söz sənətkarlarının üslubunda yazmaq ədib üçün qəbuledilməzdir. Belə bir düşüncə sahibi olan İslam Səfərli sözün qüdrətini duyur və onu oxucusuna hiss etdirməyi bacarır. Sözlərə qaynar və rəngarəng bədii həyat bəxş edən şair dilə aydınlıq gətirməklə yanaşı, əsərlərində fərqli bir musiqi ovqatı da yaradır:

Mən qartalam,
Qartal zirvələr gəzər.
Mən vüsalam,
Vüsal hicranı bəzər.
Mən bir ayam,
Aya ulduz yaraşar.
Mən sevdaya
Sevdalı qız yaraşar.
Mən sənsizəm,
Sənsiz könlüm açılmaz.
Mən dənizəm,
Dəniz tufansız olmaz [4, s.47].

Dil faktlarının yaratdığı həyəcanlar sözlərin təkrarı ilə müşayiət edilərək şeirə həssas münasibət yaradır. “Təkrar konkret mövzunun vacib cəhətləri barədə poetik məlumatların sadəcə ritmik təsviri deyil. Əgər o, poetik mənadan məhrum olsaydı, adi tavtoloji söz yığını təsiri bağışlayardı. Burada təkrar ideya-estetik təsəvvürün zənginləşməsinə yönəldilmiş bədii-təhlil obyektinin, onun məğzinin, mahiyyətinin parlaq şəkildə ifadəsinə xidmət göstərir” [2, s.241].

İslam Səfərlinin eyni əsərində bir sözün dəfələrlə işlənməsi ilə tez-tez qarşılaşırıq. Lakin bu, oxucunu yormur, əksinə, fikrin poetik mənasına yönəldiyindən dəyərli üslub faktı hesab olunur. Fikrin düzgün və estetik ifadəsində təkrarın böyük əhəmiyyəti vardır. Bu anlamda, şairin yaradıcılığında təkrarlanmalar üstünlük təşkil edir.

Əsir xəfif-xəfif səhər mehləri,
Atır rubəndini qızıl dan yeri,
Sən yar gülşənisən, mən eşq şairi,
Şirin laylalarla gəl oxşa məni,
Ey odlar Vətəni, odlar Vətəni! [4, s.36]

İslam Səfərlinin poetik dili təsdiq edir ki, təkrar və həmcins üzvlər tələffüzdə xüsusi çalar yaradır. Dil materiallarının şeirə uğurla sığışdırılması, psixoloji durumların sözlə ifadəsi, təravətli deyim, sözə qayğılı münasibət şairin yaradıcılığında diqqət çəkən cəhətlərdəndir. Fərdi üslub obrazlı mənimsəmənin orijinal üsullarla təqdimi, əks olunması və göstəricisi kimi şairin ədəbi dildəki mövqeyini dəqiq müəyyənləşdirir.

Qar yağdı, qapını yaman aldı qış,
Əlinə bir qırıq kaman aldı qış.
Payızdan əlborcu duman aldı qış,
Qayalar bürcündə mən yalçın ollam,
Dumanlı dağlarda harayçın ollam [4, s.46].

Yuxarıda şeirdən verilən bir bənddə “harayçı” sözü diqqətimizi cəlb etdi. Dilimizin aktiv lüğət fonduna daxil olan “haray” sözü bir neçə mənada istifadə edilir. Həm nida, həm də “qışqırıq” və “kömək” mənalarında olan leksik-qrammatik vahid olaraq bu söz hamıya məlumdur. İslam Səfərlinin dilindəki “harayçı” “Azərbaycan dilinin izahlı lüğəti”ndə “haraya gələn”, “köməyə gələn”, “özünü haraya çatdıran” mənalarında qeyd olunmuşdur [1, s.331]. Çağdaş ədəbi-bədii dilimizdə onun fəal işlənmə məqamları ilə demək olar ki, şairin yaradıcılığında qarşılaşırıq:

Xoşbəxtsən, bir şirin duyğuya düşsən,
Nisgildən ayrılıb, arzuya düşsən.
Gümüş Ay nurunda sən suya düşsən,
Zərif ləpələrdə mən qırçın ollam,
Sonalar gölündə harayçın ollam [4, s.46].

Dilimizdə “harayçı” sözünün sinonimi olan “köməkçi” daha işləkdir. İslam Səfərli “harayçı” sözünə canlılıq verərək onu poetik dil tapıntısı səviyyəsinə yüksəltmişdir. Doğrudan da, şeirin dilində “harayçı” əvəzinə “köməkçi” sözü işlənsəydi, bəlkə də bu qədər gözəl səslənməz və bədiilik yaranmazdı:

Mən Dədə Qorqudam, ozan şairəm,
Eşqini göylərə yazan şairəm.

İslamam, zirvədə süzən şairəm,
Səni ley çalanda bir laçın ollam,
Çalmalı dağlarda harayçın ollam! [4, s.47]

Dəyərləri qorumağın, onlara kömək etmək istəyinin bundan daha dolğun ifadəsinə rast gəlmək çətindir. Hələ şeirin sonunda nida işarəsindən başqa, üç nöqtənin qoyulması fikrin ifadə təsirinin, fəal düşüncənin, təfəkkür təhlilinin əlamətidir. Bu, adi durğu işarəsi deyil, söz və ifadə hökmündə, fikir sanbalında olan faktordur. Ədəbi dilin, demək olar ki, bütün üslublarında üç nöqtənin çox sayda mənaları özünü göstərir. Burada qrammatik mövzuları bədii dilə gətirən və onları poetik şəkildə, lakin dilçi alim mövqeyində izah edən mərhum şairimiz Qabilin "Üç nöqtə" şeiri yada düşür:

İncə mətləb kodlarıdır üç nöqtə,
Hər biri bir qıfılbənddi, aç görək!
Lap bir məktəb açarıdır üç nöqtə,
Bu məktəbin təlimindən qaç görək!...

Mənaların açmasıdır üç nöqtə,
Açıldıqca şərhə qalmaz ehtiyac.
Təxəyyülün uçmasıdır üç nöqtə,
Simurqa da daha olmaz ehtiyac [3, s.48].

İslam Səfərlinin yaradıcılığında sözün məqama uyğun olaraq işlədilməsi məzmun mükəmməlliyi, forma uğuru kimi diqqəti cəlb edir və poetik təsiri qat-qat gücləndirir. Dil-üslub yoxsulluğundan uzaq olan şair ifadə təravəti və təqdim orijinallığı ilə seçilir. Əslində, fərdi yaradıcılıq keyfiyyətlərinin əsasında da forma-üslub xüsusiyyətlərinin orijinallığı dayanır.

Şairin dilində diqqət çəkən sözlərdən biri də "açarçı" sözüdür:

Deyirəm, gün gələydi,
(sözlərimə inanın!)
siz hücum etdiyiniz,
elm adlanan qalanın
açarçısı olaydım! [4, s.42]

Maraqlıdır ki, işlənmə passivliyinə malik olsa da, bu söz də dilimizin lüğətlərində "açar düzəldən" mənasında göstərilmişdir [1, s.37]. İslam Səfərlinin yadda qalan keyfiyyətli cəhətlərindən biri budur ki, o, dildəki bir sıra sözləri, xüsusilə də milli

leksik-qrammatik vahidləri sıradan çıxmağa qoymur, öz poetik dilində aktivləşdirir. “Baxar” sözü bu mənada maraq doğurur:

Bulaqların bir səmtədir axarı,
“Salvartı”nın xoş görünür baxarı,
Biçənəkdən at səyirdib yuxarı,
Yalmanına yata-yata gəlmişəm,
Mərcan gözlü Batabata gəlmişəm [4, s.70].

“Baxar” milli sözdür, lakin təəssüf ki, biz onun əvəzinə alınma “mənzərə” ifadəsini o qədər çox işlədirik ki, artıq bu söz unudulmaqdadır. Var olsun bədii dilimiz ki, belə sözləri unudulmağa qoymur. Bu işdə söz sənətkarlarımıza borcluyuq.

Bəzən dilimizdə işlənən sözlər alınma olsalar belə, İslam Səfərlinin dilində elə doğmalaşırlar ki, sanki onlarla yenicə tanış olursan. Bu proses bədii dili qeyri-poetik ünsürlərdən xilas edir. Dilimizdə “nazəndə” sözü ilə müqayisədə “nazlı” sözü daha çox işlənir və bu, bədii dilimizin tarixən yadda qalan faktlarındandır. Lakin çağdaş poeziyamızda “nazəndə” sözünü şirin-şirin işlədən, ona bədii həyat bəxş edən İslam Səfərlidir:

Dəydi saçlarıma bahar kuləyi,
Nazəndə sevgilim, yadıma düşdün.
Hərənin baxtına bir gözəl düşər,
Sən də təkcə mənim adıma düşdün,
Nazəndə sevgilim, yadıma düşdün [4, s.147].

İslam Səfərlinin yaradıcılığı bir daha göstərir ki, poeziya sözün şöhrətini, hikmətini, qüdrətini yaşadır. Sözdən uzaqda poeziyanın mövcudluğu mümkün deyildir.

İslam Səfərli şeirinin dayaqları saf sözlərdir. Dildən məqsədəuyğun şəkildə istifadə, səs və məna əlvanlığı, ədəbi dil normalarından istifadə sərbəstliyi, sözlərin misralarda düzgün sıralanması şairin poetik dilinə xas olan cəhətlərdəndir. Onun yaradıcılığında poetik mətləb sözlərin məna çalarları ilə tarazlaşır. “İdeya məzmununu kamil ifadə formasına salmaq, sözü obraza çevirmək şeir yaradıcılığının ən ilkin əlamətidir və elə bunun üçündür ki, obrazyaratma vasitəsi olan dil və üslub şeir yaradıcılığının mərkəzi problemidir” [2, s.34-35]. Bədii dilimizdə “Xəzər”, “Naxçıvan” kimi onlarla toponimi, “güzər”, “qırçın” kimi sözləri obrazlaşdıran şair şeirlərində gerçəkliyə poetik münasibətinin incə məqamlarını ifadə etmişdir. Onun “Naxçıvan” mövzusundakı əsərlərinin ruhu, ahəngi, coşqusu, vətən təranələrini oxuyan bir şair ürəyinin hərarəti bunu deməyə əsas verir ki, İslam Səfərli “Naxçıvanın Səməd Vurğunu”dur:

Çöllərindən kecən mənəm,
Söz qoşmamış keçəmmənəm,
Sularından içən mənəm,
Mənim barlı Naxçıvanım,
Xoş baharlı Naxçıvanım [4, s.60].

Dil faktlarının yaratdığı həyəcanlar fikirləri sərrastlaşdırır, insanın vətənə olan məhəbbət hisslərini coşdurur və bu duyğuları ürəyin əbədi ehtiyacına çevirir:

Vurulduqca bu sevimli yurda mən,
Rübabımı köklәmişəm burda mən.
Mənə şeir çələngini bəxş edən,
Yaraşıqlı bir məkana gəlmişəm.

Ovçu kimi mən dolana-dolana,
Qalxıb Araz qırağından bu yana.
Baba yurdum gözəl Nəqşi-cahana,
– Ana yurdum Naxçıvana gəlmişəm [4, s.60].

Tam məsuliyyətlə deyə bilərik ki, Azərbaycanı tərənnüm edən şeirlərində Səməd Vurğun hansı qüdrət sahibidirsə, Naxçıvanla bağlı əsərlərində də İslam Səfərli odur.

**Nəticə / Conclusion**

İslam Səfərlinin şeirlərini "nəğmələr poeziyası" adlandırmaq yerinə düşər. Burada sözün içində gizlənən mənalar ritmlərlə açılır. Şairin şeirləri öz-özlüyündə həzin və düşündürücü bir nəğmədir. Bu poeziya həssas və gözəl bir şair ürəyini tanıda bilir. Bu mənada, poeziyanı "insan qəlbinin dili" hesab edənlər necə də düzgün mövqedə dayanmışlar. İslam Səfərli ədəbi dilimizdə heç kəsə bənzəməyən, başqalarının üslubuna qarışmayan, özünəxas deyim tərzi olan şairlərdəndir. Onun dilindəki hikmətli ifadələr: "könlümün tərlanı", "sevda beşiyi", "sülh alayı" kimi poetik sintaksis faktlar ədəbi dilimizə bəxş etdiyi töhfələrdəndir.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Azərbaycan dilinin izahlı lüğəti. (2006). Bakı, Şərq-Qərb. 792 s.
2. Hüseynov M. (2008). Dil və poeziya. Bakı, Elm. 434 s.
3. Qabil. (2004). Seçilmiş əsərləri. Bakı, Şərq-Qərb. 248 s.
4. Səfərli İ. (2005). Seçilmiş əsərləri. Bakı, Lider. 224 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 36–42
doi.org/10.48445/h6261-4819-3211-u

DİLÇİLİK MƏSƏLƏLƏRİ

# Müasir Azərbaycan ədəbi dilində toponimik vahidlərin formalaşmasının leksik üsulları

***Həmzə Əliyev***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, "Azərbaycan dili və onun tədrisi texnologiyası" kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: hemze.eliyev1965@mail.ru
https://orcid.org/0000-0003-2344-8388

***Ədalət Abbasov***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, "Azərbaycan dili və onun tədrisi texnologiyası" kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: abbasov-edalat@mail.ru
https://orcid.org/0000-0002-9704-1874

**XÜLASƏ**
Azərbaycan toponimik vahidlərinin işlənmə coğrafiyası son dərəcə geniş olduğu kimi, yaranma üsulları da müxtəlifdir. Bu isə toponimlərin formalaşma üsullarının təsnifat sistemini yaratmış olur. Toponimlərlə bağlı araşdırmaların genişlənməsinə baxmayaraq, toponimikanın elmi-nəzəri prinsiplərinə riayət olunmur. Məhz bu istiqamətdə aparılan araşdırmaların əksəriyyətində səciyyəvi xüsusiyyətlər mövcuddur. Qeyd edək ki, tədqiqatların təsnifatında bəzi metodik nöqsanlar da özünü göstərməkdədir. Ümumiyyətlə, toponimlərə sistemli şəkildə yanaşıldığı üçün onun tədqiqi zamanı bəzi mühüm məsələlər ya araşdırma prosesindən kənarda qalmış, ya da tamamilə unudulmuşdur.

**AÇAR SÖZLƏR**
toponimik vahid,
leksik üsul,
onomastik leksika,
oykonim və oronim,
semantik element,
linqvistik prinsip,
lüğət tərkibi

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 05.11.2023
qəbul edilib: 10.12.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 36–42
doi.org/10.48445/h6261-4819-3211-u

LINGUISTIC ISSUES

# Lexical methods of formation of toponymic units in modern Azerbaijani literary language

***Hamza Aliyev***
Doctor of Philosophy in Philology, Associate Professor, Department of "Azerbaijani laguage and its teaching technology", Azerbaijan State Pedagogical University.
Azerbaijan. E-mail: hemze.eliyev1965@mail.ru
https://orcid.org/0000-0003-2344-8388

***Adalat Abbasov***
Doctor of Philosophy in Philology, Associate Professor, Department of "Azerbaijani language and its teaching technology", Azerbaijan State Pedagogical University.
Azerbaijan. E-mail: abbasov-edalat@mail.ru
https://orcid.org/0000-0002-9704-1874

**ABSTRACT**
The geography of development of toponymic units of Azerbaijan is extremely wide, and the methods of creation are also diverse. This created a classification system of toponym formation methods. Despite the expansion of research on toponyms, the scientific-theoretical principles of toponymics are not followed. It is in this direction that most of the researches have characteristic features. It should be noted that there are some methodological flaws in the classification of studies. In general, due to the systematic approach to toponyms, during its study, some important issues were either left out of the research process or completely forgotten.

**KEYWORDS**
toponymic unit, lexical method, onomastic lexicon, oikonym and oronym, semantic element, linguistic principle, vocabulary composition

**ARTICLE HISTORY**
Received: 05.11.2023
Accepted: 10.12.2023

**Giriş / Introduction**

Müasir dövrdə Azərbaycan toponimləri haqqında çox sayda məqalə və kitablar yazılmışdır. Onların arasında toponimlərin linqvistik aspektdən şərhi xüsusilə fərqlənir. Dilçilikdə toponimlər təsnifata uyğun olaraq ayrı-ayrı istiqamətlərdə araşdırılır.

**Əsas hissə / Main part**

Azərbaycan toponimik vahidlərinin işlənmə coğrafiyası geniş olduğu kimi, onların yaranma və formalaşma üsulları da zəngindir. Bu müxtəliflik aşağıdakı təsnifatı əmələ gətirir.

**Leksik yolla yaranan toponimlər**

Toponimlərlə bağlı çoxsaylı araşdırmaların aparılmasına baxmayaraq, toponimikanın elmi-nəzəri metod və prinsiplərinə o qədər də ciddi riayət olunmur, araşdırmalar yalnız məhdud aspektdə – ya tarixi, ya coğrafi, ya da dilçilik istiqamətində aparılır. Nəticə etibarilə toponimlər toponimik səviyyədə deyil, göstərilən sahələr üzrə müxtəlif müstəvilərdə araşdırılır:

1) Toponimika ilə leksikologiyanın tədqiqat obyekti və predmeti, metod və prinsipləri eyniləşdirildiyindən birinci ikincinin tərkib hissəsi, həmçinin onun mühüm bölmələrindən biri hesab edilmiş, metod və prinsipləri fərqləndirilməmişdir. Yaddan çıxarmaq olmaz ki, müstəqil bir elm kimi toponimikanın özünəməxsus tədqiqat obyekti və predmeti, metod və prinsipləri mövcuddur. Onların leksik vahid olması isə məsələnin yalnız bir qütbünü təşkil edir.
2) Toponimlərə sistemli şəkildə yanaşılmadığından bu sahə ilə bağlı bir sıra məsələlər ya araşdırmalardan kənarda qalmış, ya da yanlış sonuclar əldə edilmişdir. Qeyd edək ki, yalnız müstəqil linqvistik araşdırma yolu ilə toponimlərin dilçilik əlamətləri kəşf edilə bilər.
3) Əksər tədqiqatlarda makro və mikronimlərin səciyyəvi cəhətləri diqqətdən kənarda qalmış, onlar ayrı-ayrı xüsusiyyətli obyektlərin adları kimi müxtəlif formalarda araşdırılmışdır.
4) Oykonim və oronimlərin toponim (coğrafi ad), hidronimlərin isə onomastik leksik qrup kimi araşdırılmasının məsələnin tam həlli üçün o qədər də əhəmiyyəti yoxdur.

Şəxs adı bildirən xüsusi isimlər heç bir sözdüzəldici (leksik) şəkilçi qəbul etmədən coğrafi ad kimi istifadə edilir. Onlar da öz spesifik xüsusiyyətləri baxımından iki qrupa ayrılır:

1) *Şəxs məzmunlu ən sadə xüsusi isimlərlə ifadə olunmuş toponimlər*: Çoban (Quba rayonu), Ağa (Qusar rayonu). Oronimlər – Şıxı (Qəbələ rayonu), İsrail (Oğuz rayonu), Qasım (Quba rayonu).

2) *Şəxs məzmunlu mürəkkəb xüsusi isimlə ifadə olunmuş toponimlər*: Komponentlərin leksik və morfoloji xarakterinə görə bu toponimlər öz növbəsində bir neçə qrupa bölünür:

a) Hər iki komponenti xüsusi isimdən ibarət olan toponimlər: oykonimlər – Ağamirzə (Şəki rayonu), Məmmədrza (Şəki rayonu), Kiçik Pirəli (Qusar rayonu), Kiçik Qaramurad, Böyük Qaramurad (Gədəbəy rayonu); oronimlər – Fatmaqarı (Quba rayonu), Əmircan (Qax rayonu).

b) Birinci komponenti keçmiş dövrlə əlaqədar ictimai-dini vəzifə, titul-mövqe, obyekt və s. bildirən toponimlər: oronimlər – Mirbaba, Pirqulu, Pirismayıl, Şıxəli baba (Quba rayonu).

c) Birinci komponenti ayama, peşə, məşğuliyyət adı bildirən isimlərdən ibarət toponimlər: oykonimlər – Mirzə, Gülüş, Alı (Molla Şıxlı, Bağça Əli (Quba rayonu)).

Dilin lüğət tərkibində olan bütün sözlərin leksik üsulla yaranmasında olduğu kimi, toponimlərin də əmələ gəlməsi ümumi linqvistik prinsiplər əsasında mümkün olur.

“Leksik yolla söz yaradıcılığı prosesində sözlər dilə heç bir qrammatik vasitələrin köməyi olmadan daxil olur. Bu sözlər mənbəyindən məzmun və formaca uzaqlaşır, yeni məzmunlu və formalı sözlər kimi işlənir” [2, s.43].

Azərbaycan paleotoponimiyası qədim türk leksik-semantik elementləri ilə də zəngindir. Belə leksik vahidlərin müxtəlif növ adlarının (obyekt adlarının) tərkibində mühafizə etdikləri arxaik məna çalarlarını isə həm qədim türk abidələri və qohum türk dilləri materialları əsasında, həm də coğrafi obyektin özünün bilavasitə müəyyən səciyyəvi cəhətlərinə diqqət yetirməklə konkretləşdirmək olur. “Deməli, linqvistik cəhətdən müstəsna rolu olan, müstəqil araşdırmaya ehtiyacı olan problemin müəyyənləşdirilməsində etimoloji metodun imkanlarından istifadəyə çox ehtiyac vardır” [3, s.37].

Bu baxımdan toponimik laya aid olan kifayət qədər makro və mikrotoponimlərin (oykonim, oronim və hidronimlərin) birinci komponentlərinin əvəzində işlənən “ağ”, “qara” və “sarı” sözləri xüsusi maraq kəsb edir. Qeyd etdiyimiz leksik vahidlər yüzlərlə coğrafi adın komponentində yalnız rəng anlamında deyil, digər arxaik mənanın müəyyənləşdirilməsində də mühüm rol oynayır.

“Faktlar göstərir ki, qeyd edilən sözlər iki və çoxkomponentli yer adlarının sadəcə birinci tərkib hissəsi mövqeyində iştirak edərək adlarını ifadə etdikləri ayrı-ayrı obyekt növlərinin yerlərində çıxış edir və sahənin həcmini – böyük və kiçikliyini, hündür və alçaqlığını, dərin və ya dayazlığını və s. funksiyasını icra etmək məqsədi daşıyır” [5, s.247]. Bir sözlə, qeyd edilən topokomponentlər bir çox yer adlarında, müasir Azərbaycan dili və onun dialekt və şivələri üçün səciyyəvi olan rəng mənasında

işləndiyi halda, böyük bir qrup coğrafi adlarda isə arxaik sayılan, bəzən isə yalnız daşlaşmış ifadələrin tərkibində saxlanan bir çox digər anlamlar da ifadə edir.

Beləliklə, nəticə etibarilə deyə bilərik ki, ağ, qara və sarı tərkibli leksik vahidləri semantik məzmununa görə aşağıdakı kimi təsnif etmək olar:

1) *"Ağ" sözünün məna çalarları*

a) Ağdaş (Quba rayonunun Qonaqkənd oronim və orooykonimlər), Ağcüyür (orooykonim) və respublikanın müxtəlif bölgələrində bəzi Ağqaya, Ağtəpə, Ağdaş, Ağbulaq və s. oronim və orooykonimlərin tərkibindəki "ağu" sözü rəng mənasını bildirir.

b) "Ağ" komponenti Ağkənd (Zəngilan), Ağdaban (Kəlbəcər), Ağqışlaq, Ağkilsə (Göyçə) və s. oykonimlərin tərkibində "kiçik, kiçicik, balaca", Ağyazı (Qax), Ağyoxuş (Xaçmaz) və s. orooykonimlərin, eləcə də Ağdaş dağı, Ağsal (Şərur) oronimlərin tərkibində "kiçik, balaca", çox da böyük olmayan (Ağdərə) arxaik çalarlarını qoruyub saxlamışdır.

Qeyd edək ki, "ağ" komponentli hidronimlərdə bu sözlərin ifadə etdiyi semantik çalarlar haqqında toponimistlər arasında vahid fikir yoxdur. Professor A.N.Kononovun fikrincə, haqqında bəhs edilən söz coğrafi adların tərkibində "axmaq", "tökülmək" feili ilə əlaqədardır.

2) *"Qara" sözünün məna çalarları*

A.N.Kononovun qeyd etdiyi kimi, "qara" sözü türk dillərində ən çox aşağıdakı mənalarda işlənir: 1) "qara", "qaranlıq", "zülmət", "tutqun", "şərt", "kədərli", "bədbəxt"; 2) "mal-qara", "yığın", "xalq", "camaat", "qoşun"; 3) "quru", "torpaq"; 4) "təpə", "hündür təpə" [6, s.96].

Azərbaycanın bu komponentli toponimlərinin tərkibində onun ən çox mühafizə olunmuş mənaları bunlardır:

a) Məlumdur ki, istər müasir Azərbaycan ədəbi dilində, istərsə də onun dialekt və şivələrində "qara" sözü yalnız rəng anlamında istifadə edilir. Məsələn, Qaradonlu, Qaraşallı, Qaraqoyunlu, Qaratorpaq (Şəki) orooykonimlərin və etnooykoniminin Azərbaycan ərazisində geniş yayılan bir sıra nümunələrinə rast gəlirik.

b) "Qara" sözünün arxaik məna çalarları dilin başqa yaruslarından fərqli olaraq toponimik layında daha çox saxlanılmışdır. Qeyd etmək lazımdır ki, rəngarəng toponim və mikrotoponimlərin əsasən birinci komponenti kimi işlənən "qara" sözünün konkret toponimlərin tərkibində onun mənbələrdə qeyd olunan "rəng", "siluet", "yas", "səda" (ibtidai), "sıravi", "torpaq", "təpəlik", "dağlıq yer", "kütlə" və s. mənalarından hansını daşıdığını müəyyənləşdirmək bir qədər çətindir. Şübhəsiz ki, etimoloji təhlil nəticəsində onların bir çoxunu bərpa etmək mümkündür. Araşdırma nəticəsində aydın

olmuşdur ki, "qara" komponenti Qarağac, Qarağacı fitonimik oykonimlərin Qaraağaclıq, fitonimik oronimin, Qaraağac mənasında Qarabağ düzü və Qaraağac yaylası oronimlərində Qarabağlar, Qarabağlı mənasında işlənmişdir.

"Qara" sözü müsbət relyef quruluşlu obyekt adlarında (zirvə, dağ, təpə və s.) və həmin yolla yaranan bir sıra başqa toponimlərdən, eləcə də bu qəbildən olan coğrafi adlardan törənən oykonim və hidronimlərin tərkibində "uca", "hündür", "yüksək", "şiş" mənasını ifadə edir. Həmin komponentin müasir dil və dialektlərimiz baxımdan arxaik sayılan məna çalarlarına aşağıdakıları misal göstərmək olar:

a) Toponimlərin tərkibində: Qaraqaya (Qax rayonunda zirvə), Qaraqaya dağı (Şamaxı rayonunda dağ), Qaradağ (Gədəbəy rayonunda dağ) və s.

b) Müsbət relyef quruluşlu obyekt adlarından törənən hidronimlərin tərkibində: Qaraqaya çay (Əsgəran rayonunda Ballıca çayının qolu).

"Toponimlər sistemində "qara" sözünün Azərbaycan dilində tarixən geniş işlənmiş arxaik semantika çalarlarını Qarabulaq (Daşkəsən, Quba, Şəki, Şərur, İsmayıllı, Şəmkir və s. rayonlarında bulaqlar), Qarabulaqçay (Xanlar rayonunda çay), Qaraarx (Şəmkir rayonunda kanal) və s. hidronimlər indiyə kimi qoruyub saxlayan toponimlərdir" [1, s.198].

3) *"Sarı" sözünün məna çalarları*

Müasir Azərbaycan dili və onun dialekt və şivələrində, əsasən rəng mənasında işlənən, lakin toponimik adlarda bu məna ilə yanaşı, bir sıra əlavə çalarlar ifadə edən topokomponentlərdən biri də "sarı" sözüdür.

a) Bu söz bir sıra hidronimlərin, xüsusilə yeraltı qaynaqların və onlardan qidalanan çay və arx adlarının, məsələn, Sarıbulaq (Gədəbəy, Kəlbəcər, Şamaxı, Xanlar və s. rayonlarda bulaqlar), Sarısu (Oğuz, Daşkəsən, Gədəbəy, İmişli, Xanlar və s. rayonlarında bulaqlar).

b) "Sarı" sözü relyef quruluşlu obyekt növü bildirən bir sıra terminlərə əlavə edilməklə yaranan oronimlərdə və onlardan törənən oykonim və hidronimlərdə, məsələn, Sarıqaya (Azərbaycanın müxtəlif rayonlarında qaya və dağ; Zərdab rayonunda kənd), Sarıdağ (Şahbuz rayonunda dağ), Sarıyal (Gədəbəy və Xanlar rayonlarında zirvə və dağ) mənalarında işlənmişdir.

"Leksik üsulla yaranan toponimlərin leksik-toponimik xarakterinin şərhində Masallı toponimlərinin üzərində dayanmağı da məqsədəuyğun hesab edirik. Məsələn, burada toponimlərin müəyyən qismi mənşəcə talış dili ilə əlaqədardır" [4, s.63]. Oykonimlər içərisində şəxs adı ilə bağlı (Əminli, Qədirli, Qasımlı, Allahyarlı, Yusifli və s.) etnonimlərlə yanaşı (Çaxırlı, Təklə, Tuklə, Ərəb və s.), roonim (Qarğalıq), relyeflə (Çayqırağı, Meşəkənarı, Küllütəpə, Arvadı – Al-Vadi sözlərinin

birləşməsindən yaranmışdır) bağlı adlardan yaranan oykonimlər də vardır. Antropoykonimlər içərisində əsil addan başqa, həmçinin titul (Sıxla – Şeyxlər sözündəndir), kiçiltmə ad (İsi, Xallıcakı və s.), əsl-ad, titul (Səmə xanlı, Kərbihüseyli və s.) adlardan düzələn oykonimlər də diqqət çəkir.

Masallı oykonimləri zəngin qrammatik quruluşa malikdir. Onlar Azərbaycan dilinin digər sözləri kimi sadə, düzəltmə, mürəkkəb sözlər və söz birləşmələri ilə ifadə olunur.

Hal-hazırda sadə oykonim hesab edilən Nimələv, Dənbəlov, Ərkivan, Masallı, Miyaniki və s. kimi adlar vaxtilə düzəltmə və mürəkkəb sözlər olmuşdur. Düzəltmə söz formasında olan oykonimlər əsasən *-lı*$^{4}$ (Əminli, Dəlləkli, Qasımlı, Allahyarlı və s.); *-lıq*$^{4}$; *-lar*$^{2}$ (Qarğallıq, Qəriblər, Şıxlar) şəkilçiləri vasitəsilə yaranmışdır.

Xüsusi adların bu aspektdə təsdiqi sırf linqvistik xarakter daşıyır. Müxtəlif fərqləndirici işarələrdən ibarət olan omonlar dil vahidi kimi formalaşmış, dilə aid bütün qanun və normaları özündə əks etdirirlər.

**Nəticə / Conclusion**

Gəldiyimiz qənaətə əsasən deyə bilərik ki, Azərbaycan toponimikasının tədqiqi tarix, coğrafiya və digər elmlərlə bağlı olmuş olsa belə, əsas etibarilə dilçilik elminin predmetidir. Onun formalaşmasında müxtəlif üsul və metodlardan istifadə olunsa da, leksik üsul daha məhsuldardır.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Adilov M. (2020). Azərbaycan zoonimləri haqqında. IX cild. Bakı, Elm və təhsil. 448 s.
2. Adilov M., Mərdanov V. (2019). Uşaq və şeir. Bakı, Elm. 240 s.
3. Əliyev H., Abbasov Ə. (2021). Qarabağın azad toponimikası. Bakı, ADPU-nun mətbəəsi. 414 s.
4. Qurbanov A. (1990). Azərbaycan onomastikasının inkişaf perspektivləri. Azərbaycan onomastikası problemləri. Bakı, APİ-nin mətbəəsi. 304 s.
5. Quliyev Ə., Vəliyev S. (1990). Qədim türk toponimiyasına dair. Azərbaycan onomastikası problemləri. Bakı, APİ-nin mətbəəsi. 304 s.
6. İsrafilova R., Məşədiyev Q., Cəfərov Q. (1987). Azərbaycan dilinin onomastikası (oçerklər). Bakı, Elm. 188 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 43–50
doi.org/10.48445/e1102-4855-5639-z

D İ L Ç İ L İ K   M Ə S Ə L Ə L Ə R İ

# Nəsimi dilinin linqvistik-poetik çalarları

***Rəhman Quliyev***
Filologiya üzrə fəlsəfə doktoru, baş müəllim, "Azərbaycan dili və pedaqogika" kafedrası, Bakı Mühəndislik Universiteti. Azərbaycan.
E-mail: rquliyev@beu.edu.az
https://orcid.org/0009-0009-7130-8196

**XÜLASƏ**
Orta dövrün başlanğıcı sayılan XIII əsrdən etibarən anadilli poeziyanın inkişafını müşahidə edirik. Poeziyamızda ərəb-fars dilləri ilə yanaşı, ədəbiyyatımızın, ümumən mədəniyyətimizin ən böyük hadisəsi sayılan ana dilinin canlanmasını dövrün doğma dildə yazan söz sənətkarlarının yaradıcılığında müşahidə edirik. Anadilli poeziyanın formalaşmasında mühüm rol oynayan mükəmməl yaradıcılığa malik sənətkarlar arasında İmadəddin Nəsimi xüsusilə fərqlənir. Tükənməz yaradıcılıq xəzinəsinə malik Nəsimi poeziyası indiyədək ayrı-ayrı dilçi, tənqidçi və ədəbiyyatşünas alimlər tərəfindən müxtəlif aspektlərdən tədqiq edilərək işıqlandırılsa da, hələ də geniş təhlilə ciddi zərurət duyulur.

**AÇAR SÖZLƏR**
anadilli mühit, dövrün dil xüsusiyyətləri, ədəbi-bədii dil, polisemantiklik, linqvopoetik çalar, hürufizm

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 08.10.2023
qəbul edilib: 14.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO.4, VOL. 278, 43–50
doi.org/10.48445/e1102-4855-5639-z

LINGUISTIC ISSUES

# Linguistic-poetic shades of Nasimi language

***Rahman Guliyev***
Doctor of Philosophy in Philology, Head teacher, Department of "Azerbaijani language and Pedagogy", Baku Engineering University. Azerbaijan.
E-mail: rquliyev@beu.edu.az
https://orcid.org/0009-0009-7130-8196

**ABSTRACT**
We observe the development of native language poetry from the 13th century, which is considered the beginning of the Middle Ages. In addition to the Arabic-Persian languages in our poetry, we see the revival of our mother tongue, which is considered the greatest phenomenon of our literature and culture in general, in the works of the artists of the time who wrote in their native language. Imameddin Nasimi stands out among the artists with excellent creativity who play an important role in the formation of native language poetry. Although Nasimi's poetry, which has an inexhaustible treasure of creativity, has been studied and illuminated from various aspects by individual linguists, critics and literary scholars, there is still a serious need for extensive analysis.

**KEYWORDS**
native language environment, language characteristics of the time, polysemanticity, linguopoetic shades, hurufizm

**ARTICLE HISTORY**
Received: 08.10.2023
Accepted: 14.11.2023

## Giriş / Introduction

Tarixən ictimai-siyasi hadisələrin dinamikliyi hər bir dövrü səciyyələndirən, həmin dövr üçün aktual olan hadisələrlə zəngin olur. Öz spesifikliyi baxımından zamanın nəbzi ilə bir vuran belə hadisələr rəngarəngliyinə görə (iqtisadi, ictimai-siyasi, ədəbi-mədəni və s.) diqqəti cəlb edir. Digər tarixi-milli hadisələrlə zəngin olan orta dövr, eyni zamanda milli ədəbi-mədəni hadisələrin canlanması baxımından da fərqlənir. “Belə ki, orta dövrün başlanğıcı sayılan XIII əsrdən anadilli poeziyanın inkişafını müşahidə edirik. Poeziyamızda ərəb və fars dilləri ilə yanaşı, ədəbiyyatımızın, ümumən mədəniyyətimizin ən böyük prioritet hadisəsi hesab edilən ana dilinin canlanmasını dövrün doğma dildə yazan söz sənətkarlarının yaradıcılığında görürük” [6, s.387]. Anadilli mühitin formalaşmasında mühüm rol oynayan mükəmməl yaradıcılığa malik sənətkarlardan İmadəddin Nəsimi xüsusi ilə fərqlənir.

Azərbaycan söz sənətkarları və şairləri arasında həyatı daha çox əfsanə və rəvayətlərdən ibarət olması ilə fərqlənən Nəsimi poeziyamız tarixində əsasən anadilli fəlsəfi qəzəlin banisi kimi tanınır. Tükənməz bir xəzinə olan Nəsimi yaradıcılığı tənqidçi, dilçi və ədəbiyyatşünas alimlərimiz tərəfindən müxtəlif aspektlərdə tədqiq edilərək işıqlandırılsa da, hələ də tam araşdırılmamış, xüsusilə ana dilimizin qlobal səviyyədə inkişaf etdiyi bir dövrdə bu zəngin xəzinənin mükəmməl tədqiqinə ciddi ehtiyac yaranmışdır. Məqalənin ərsəyə gəlməsi zərurəti də məhz bu ehtiyacdan irəli gəlmişdir.

## Əsas hissə / Main part

Məqalənin tədqiqat hədəfi olan linqvistik və poetik çalarlar birtərəfli təhlil edilərsə, yarımçıq və bitkin olmayan bir araşdırma hasil olar. Bu nöqsanlarla qarşılaşmamaq və bütöv xarakterli, bitkin məzmunlu tədqiqat əsəri ərsəyə gətirmək üçün aşağıdakı tədqiqat üsullarından faydalanmaq daha münasib hesab edilir:

1. Hər hansı bir söz ustasının yaradıcılığından məqsədəuyğun nümunələr seçməklə fikrini əsaslandırmaq.
2. Söz sənətkarının dilinin tədqiqini zamanın ədəbi-bədii mühitinin konyukturasına müvafiq araşdırmaq. Daha dəqiq desək, dövrün dil-üslub xüsusiyyətlərini nəzərə almaq.
3. Həmin dövrdə hakim dil funksiyasını yerinə yetirən dillərin aborigen dilə təsir dərəcəsinin nəzərə alınması. Alınma leksikanın istifadə dairəsinin müəyyənləşdirilməsi.
4. XIV–XV əsrlərdə hakim ideologiyanın hegemon fəaliyyəti və sosial təsir gücü bir sıra təriqətlərin meydana çıxmasına səbəb olmuşdur. Nəsiminin yaşayıb- yaratdığı

dövr Azərbaycanda, həmçinin Yaxın və Orta Şərqdə dini-fəlsəfi cərəyan kimi məşhur olan hürufiliyin geniş yayılması ilə yadda qalır. Bu da, şübhəsiz, digər janrlarda yazdığı şeirləri ilə yanaşı, anadilli fəlsəfi qəzəllərin meydana çıxması zərurətinin meydana gəlməsini də doğurmuşdur.

Nəsimi lirik şairdir. Şairin mövcud bədii irsini təhlil etdikdə iki cəhət xüsusilə diqqəti cəlb edir:

1. Yüksək poetizm; 2. Sözün polisemantikliyi. Birinci istiqamət – sözün obrazlı, ikinci aspekt isə sözün dilçilik üstünlüklərinin təzahürü kimi səslənir. Şairdə hər iki sənətkarlıq səriştəsi vəhdətdə canlandırılır. Daha açıq desək, mövzu və janrından asılı olmayaraq istənilən şeirində linqvopoetik çalarlar rəngarəng müstəvilərdə ifadə edilir.

Hər iki aspektdə fikir və mülahizələrimizi şairin müxtəlif şeirlərindən götürülmüş aşağıdakı misralarla əsaslandırmağa çalışaq:

Qanı ğəflət bir ayıq?
Qanı əsrüklərin cəmində huşyar?

İctimai ədalətsizliyə üsyan edən şairin bu misralarında zülm və haqsızlığa, ictimai bərabərsizliyə, hərc-mərcliyə sərt etiraz ifadə edilmişdir.

Yaxud:

Qanı həqqi bilən bir gerçək ər kim,
Ola doğru anın dilində göftar?

Təbii bir hisslə çıxış edən şair həqiqəti, insanpərvərliyi, doğruluğu öz idealı kimi təbliğ edir. Soydaşlarını bu tərəqqipərvər əməllərə səsləyən sənətkar öz zəmanəsində “əhdü-peymanı bütün yarın”, “sözü və işi vəhdətdə” olan vəfalı insanların olmamasını təəssüflə qeyd edir:

Qanı əhdində ol sabitqədəm kim,
Qoyun anın adın doğru vəfadar?

Qeyd edilən kiçik poetik misralarda cəmiyyətdəki ədalətsizliyə etiraz sədaları, haqsızlığa qarşı barışmazlıq notları ilə yanaşı, kədərli münasibət də öz bədii ifadəsini tapmışdır:

Hərgiz zəmanə kimsəni xoşnud qılmadı,
Hər feil namüvafiqü nacəvab, –

deyərək şair insan həyatını yoxsulluq və ehtiyac içərisində keçirməsindən, zülm altında yaşamasından kədərləndiyini bildirir.

Göründüyü kimi, Nəsimi poetik ustalığındakı uğuru ilə bərabər, söz sənətkarlığındakı müvəffəqiyyətini vəhdətdə inikas etdirir. Əslində şeirlərindəki obrazlılıq, bədii zənginlik şairin məhz söz ustalığından qaynaqlanan təfəkkür prosesidir. Nəsimi şeirlərinin linqvistik araşdırmaları üzərindən gəldiyimiz qənaətə görə, şair söz sərrafıdır. Belə ki, sözün bütün semantik çalarları – həqiqi və məcazilik, tək və çoxmənalılıq, omonimlik və sinonimlik çeşidlər və s. Nəsimi qəzəllərində öz zəngin ifadəsini tapmışdır.

Ümumxalq dilinin zəngin xəzinəsindən maksimum bəhrələnən şair bu gün üçün arxaik leksik vahid sayılan, lakin şairin yaşayıb-yaratdığı əsrdə (və ümumən orta əsrlərdə) ümumişlək olan sözlərdən geniş müstəvidə istifadə etmişdir. Belə poetik taktika söz sənətkarının ümumxalq dilinə, milli dilə olan sevgisinin təzahürü kimi dəyərləndirilməyə layiqdir.

Ümumən baxdıqda görürük ki, Nəsiminin şeirlərində işlətdiyi milli leksik vahidlərin əksəriyyəti yazılı ədəbiyyatımızın ilk nümunəsi sayılan ana kitabımız "Kitabi-Dədə Qorqud"da mövcuddur. Bunlardan bir neçəsi yuxarıda təhlil etdiyimiz şeirdə qeyd edilmişdir: "Qanı", "Əsrük", "huşyar", "qılmaq". Həmin sözlər eyni leksik-semantik funksiyanı yerinə yetirirlər.

"Qanı həqqi bilən bir gerçək ər kimi", "Qanı əsrüklərin cəmində huşyar", "Hərgiz zəmanə kimsəni xoşnud qılmadı".

Nəsimi yaradıcılığının tədqiqi zamanı müşahidə etdiyimiz kifayət qədər belə nümunələr şairin ana dilinə o zamankı terminlə desək, "türk dili"nə (indiki Azərbaycan dilinə) sonsuz sevgisinin göstəricisidir.

Bədii söz sənətinin solmaz, gözəl incilərini yaradan Nəsimi Azərbaycan ədəbiyyatı tarixinə yeni bir üslub, deyim tərzi gətirmiş, poeziyamızı yeni surət və lövhələrlə zənginləşdirmişdir. Şairin şeirlərində işlətdiyi istiarə, məcaz, bənzətmə və bədii mübaliğələr əlvan və rəngarəngdir. Ana dilindən alınan bu bədii ifadələr canlı dilimizin özü kimi aydın və gözəldir" [6, s.336].

Yaxma məni fəraqilən, çünki mən, ey yüzü qəmər,
Xalisü müxlis olmuşam eşqi-rüxündə zər kimi.

Bəşəri dəyərlərə diqqət çəkmək məqsədilə şair məna dərinliyi ilə bərabər, zahiri cəhətləri də ön plana çəkir. Əslində fikrin, ifadə tərzinin bu üsulla qüvvətləndirilməsi məqsədəmüvafiq vasitələrdən sayılır. Qazi Bürhanəddindən sonra Nəsimi türk əruzunun rəngarəng poetik üsullarla mükəmməl səviyyəyə çatmasında səciyyəvi bəhrlərdən istifadə etməklə onun dinamik inkişafında xüsusi rola malikdir. Misralarda sözlərin ahəngi, sözdaxili alliterasiya – sait və samit səslərin ardıcıl düzümü və s. bədii

təsvir və ifadə vasitələri bütövlükdə fikrin poetik funksiyasını aktivləşdirir:

Yüzünü məndən nihan etmək dilərsən, etməgil!
Gözlərim yaşın rəvan etmək dilərsən, etməgil!
Bərgi-nəsrin üzrə müşkin zülfünü sən dağıdıb,
Aşini bixanıman etmək dilərsən etməgil!

Təhlil zamanı məna gözəlliyi (məcazilik, polisemantiklik, dərin və bitkin məna ifadə etmək qabiliyyəti) ilə forma keyfiyyəti (ritm, qafiyə, oynaqlıq və s.) vəhdət təşkil edir ki, bu da ümumilikdə ekspressivizmin gücləndirilməsinin təzahürü hesab edilə bilər.

"Nəsimi Azərbaycan şeirinin inkişafında əhəmiyyətli rol oynamış ustad sənətkarlardandır. Onun yaradıcılığı Azərbaycan bədii dilinin canlı xalq dili hesabına zənginləşməsini, şeirin bədii ifadə vasitələri, forma cəhətdən qüvvətlənməsinə yardım etmişdir" [7, s.19–20].

Yaradıcılığını tədqiq etdikdə diqqəti cəlb edən ilk araşdırma hədəfi kimi Nəsiminin insana məhəbbəti tərənnüm edən misilsiz lirikası ilə qarşılaşırıq. Bu lirik bədii xəzinə istər poetik çalarlarının rəngarəngliyi, istərsə də dilinin zənginliyi ilə fərqlənir. İnsan gözəlliyinin əsrarəngiz tərənnümü, bir sözlə, insana məhəbbət Nəsimi lirikasının əsas obyektidir.

Cahan yüzün günəşindən münəvvər olmuşdur,
Səba saçın qoxusundan müəttər olmuşdur.
Ləbin qatında kim, ondan utanır abi-həyat,
Şəkər sözün, nə deyim, çün mükərrər olmuşdur.

Şairin lirikası haqqında söylədiyimiz fikrin gerçəkliyini qeyd etdiyimiz nümunələrin məzmununda ifadə edilən səmimi və saf insan duyğularının tərənnümü əsasında da görmək mümkündür.

Nəsimi lirikasında aparıcı mövqeyə malik olan qəzəllərində insana sevgi və səmimi münasibətin ifadəsi ilə bərabər, insanı kamil olmağa çağırış motivləri də xüsusi yer tutur. Bu motiv şairin fəlsəfi məzmun daşıyan şeirlərində daha çox yer alır. "Kamil insan" qayəsi Nəsimi yaradıcılığınının hürufilik təliminə yiyələnməsindən irəli gəlir. "Nəsiminin nəzəriyyəsində – hürufilik təriqətində insan yaranmışların ən alisi, ən öndə gedənləri adlanır. Bu nəzəriyyədə insan müqəddəs sayılır və qeyd olunur ki, kamil insan Tanrı dərgahına yüksələ bilər" [2, s.16].

Mən mülki-cahan, cahan mənəm, mən,
Mən həqqə məkan, məkan mənəm, mən ...

...Mən surəti-mənidə həqqəm, həqq,
Mən həqqi əyan, əyan mənəm, mən.

Məzmunca olduğu kimi, beytlərin bir-biri ilə poetik və linqvistik əlaqələri də diqqəti cəlb edir. Misralardakı fəlsəfi məna ("lirik mən", yəni insan olmasa, yer üzünün, dünyanın heç bir mənası olmaz) sözün təsir gücü ilə poetik səviyyəyə qalxaraq bədii situasiyanı, ekspressiv zirvəni formalaşdırır. Nəticədə məna, poetik və linqvistik əlaqə fikir predmetinin ideya formasında ifadəsini ("Tanrı öz mənasını insanın surətində bəyan etmiş, buna görə də insan əyan olan, görünən Tanrıdan başqa bir şey deyildir") təzahür etdirir.

Nəsimi poeziyasında sözün diri, dinamik olması onun (sözün) yaradıcılıq qayəsinin, sənətkarlıq ruhunun ifadəsi meyarına əsaslanır. Şübhəsiz, sənət mexanizmini canlandıran söz müqəddəs sayılır, məna inkişafı mütəhərrik xarakter daşıyır. Bu qənaətimizi aşağıdakı nümunə də məna çəkisi baxımından təsdiq edə bilər:

Söylə, ey ziba ki, zibadır sözün,
Ərşü ərrəhmanü tahadır sözün,
Gəl ki, əsmavü müsəmmadır, sözün!
Nəfəseyi-nitqi, Məsihadır sözün.

**Nəticə / Conclusion**

Nümunədən də aydın görünür ki, Nəsimi şeirlərində istifadə edilən söz və ifadələr ümumxalq dil təfəkkürünün süzgəcindən keçən və düşüncədə ümumişlək leksika kimi sabitləşən lüğəvi vahidlərdir. Bədii təsvir və ifadə vasitələri əsasında poetik üslubu reallaşdırmaq məqsədilə şairin poeziyasında semantik dəyişmələr də geniş müşahidə edilir.

Nəsimi dilinin yüksək poetik funksionallıq və obrazlılıqla zənginliyi qənaətinə gələn tədqiqatçılar (xüsusilə dil tarixçiləri) bu dil potensialını haqlı olaraq XIII–XIV əsrlər Azərbaycan ədəbi dilinin yekunu kimi qeyd etmişlər. Nəsimi dilinin poetik səviyyəsi xüsusi sistem təşkil edir. Bu sistemin əsas meyarı şairin istifadə etdiyi sözü, mənanı, fikri qarşıya qoyduğu sənətkarlıq amalına, irəli sürdüyü ideyaya uyğun təqdim etməsindədir:

Bağrımı doğrar fəraqın xarı, ey cənnət gülü!
Növbahar olsun, gül olsun, arada xar olmasın!

Qeyd etdiyimiz kimi, bu misralarda sözlə məna arasında qeyri-müvafiq, yerində işlənməyən linqvistik situasiya görünmür. Şairin yaradıcılıq zirvəsində dayanan

linqvistik ekspressivizm məhz bu cür dil mühitindən, misilsiz sənətkarlıqdan qaynaqlanır.

Aparılan tədqiqat işləri və təhlillərin yekunu olaraq demək mümkündür ki, Nəsimi poeziyasının gücü onun yaradıcılığında linqvistik və poetik xüsusiyyətlərinin vəhdətdə (linqvopoetik formada) təqdim edilməsindədir. Ümumiyyətlə, poetik situasiyanın kulminasiya səviyyəsində mövcudluğunu təmin etmək üçün bu iki mühüm aspektin birinin digərini tamamlaması vacib şərtlərdəndir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Abbasov Ə., Quliyev R. (2019). Nəsimi üslubunda sakral leksika. "Dil və ədəbiyyat" beynəlxalq elmi-nəzəri jurnal. Bakı, №2 (110), s.5–8.
2. Adilqızı S. (2019). Nəsiminin əsərlərinin dili. "Hərbi and" qəzeti, №44 (814), s.16.
3. Dəmirçizadə Ə. (1979). Azərbaycan ədəbi dilinin tarixi (I hissə). Bakı, Maarif. 268 s.
4. Xudiyev N. (1995). Azərbaycan ədəbi dili tarixi. Bakı, Maarif. 496 s.
5. Qasımova R. (2023). Arxaizmlərin semantikasında baş verən dəyişmələr. "Azərbaycan dili və ədəbiyyat tədrisi" elmi-metodik jurnal, № 1 (275), s.91–97.
6. Səfərli Ə., Yusifli X. (2008). Azərbaycan ədəbiyyatı tarixi. Ozan, 696 s.
7. Nəsimi İ. (1962). Seçilmiş şeirlər. Azərbaycan uşaq və gənclər ədəbiyyatı. Bakı, 194 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 51–59
doi.org/10.48445/v3573-3641-6308-v

**M E T O D İ K A**

# Ədəbiyyat dərslərində İsmayıl Şıxlının həyat və yaradıcılığının öyrənilməsinin metodik imkanları

***Bilal Həsənli***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Əməkdar müəllim, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. E-mail: bilalhasanli@yahoo.com
https://orcid/org//0000-0002-6964-0546

**XÜLASƏ**
Məqalədə ədəbiyyat dərslərində görkəmli yazıçı İsmayıl Şıxlının həyat və yaradıcılığının öyrənilməsi yolları işıqlandırılır. Təcrübə göstərir ki, yazıçının həyat və yaradıcılığının öyrənilməsi, əsərlərinin təhlili zamanı interaktiv metodlardan istifadə, müəllifin öz əsərlərində qaldırdığı tarixi, siyasi və mənəvi problemlərin müzakirəsi şagirdlərin mövzunu dərindən mənimsəməsinə kömək edir. “Dəli Kür” romanında XIX əsrdə Azərbaycan kəndində baş verən ziddiyyətli proseslər Cahandar ağanın timsalında təsvir edilir. Əsərin təhlili zamanı şagirdlərdə romanda həyat həqiqətləri, xalqımıza xas olan mənəvi dəyərlərin yüksək sənətkarlıqla əks etdirilməsi barədə qənaət formalaşdırılır.

**AÇAR SÖZLƏR**
roman, ədəbiyyat, dərs, müəllim, şagird, yazıçı, nəsr, məzmun, təhlil

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 03.11.2023
qəbul edilib: 16.12.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 51–59
doi.org/10.48445/v3573-3641-6308-v

METHODS

# Methodological possibilities of learning the life and creativity of Ismayil Shikhly in literature lessons

***Bilal Hasanli***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Honored teacher, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: bilalhasanli@yahoo.com
https://orcid.org/0000-0002-6964-0546

**ABSTRACT**
The article highlights the ways of studying the life and work of a prominent writer Ismail Shykhli in literature lessons. Practice shows that the use of interactive methods in studying the life and work of a writer, analyzing works in literature lessons, discussing important historical, political and national-moral problems raised by the author with students more effectively. In the novel "Dali Kur", the conflicting processes that took place in the Azerbaijani village in the 19th century are described in the example of Jahandar agha. During the analysis of the work, students come to the conclusion that the novel reflects the realities of life and spiritual values inherent in our people.

**KEYWORDS**
novel, literature, lesson, teacher, student, writer, prose, content, analysis

**ARTICLE HISTORY**
Received: 03.11.2023
Accepted: 16.12.2023

## Giriş / Introduction

Ümumtəhsil məktəblərinin ədəbiyyat dərslərində görkəmli yazıçı İsmayıl Şıxlının həyat və yaradıcılıq yolu, bədii nəsrlərindən – "Dəli Kür" romanı və "Namərd gülləsi" hekayəsi öyrənilir. Sənətkarın həyat və yaradıcılığının tədrisi zamanı şagirdləri mövzunu dərindən mənimsəməyə, müstəqillik və fəallıq göstərməyə sövq edən interaktiv təlim metodları və iş formalarından məqsədyönlü şəkildə istifadə imkanlarının müəyyənləşdirilməsi qarşıda mühüm metodik problem kimi dayanır.

## Əsas hissə / Main part

IX sinifdə şagirdlərə İ.Şıxlının "Namərd gülləsi" hekayəsi tədris edilir, müstəqil mütaliə üçün isə "Sapı özümüzdəndir", "Mənim rəqibim" əsərləri tövsiyə olunur. "Namərd gülləsi" hekayəsinin öyrənilməsinə ayrılmış 3 dərs saatının aşağıdakı kimi planlanlaşdırılması məqsədəuyğundur:

‒ Əsərin məzmununun öyrənilməsi ‒ 2 saat

‒ Əsərin təhlili – 1 saat

Əsərin məzmununun öyrənilməsinə ayrılmış ilk dərsdə motivasiyanın yaradılmasına fərqli yollarla nail olmaq mümkündür: bədii əsərin müvafiq parçasından (İ.Şıxlı haqqında) internetdə yerləşdirilmiş videomaterialdan istifadə, əsərdən dramatik epizoddan (Niftalı koxanın Mürşüdlə qarşılaşması) xatırlatma, hekayəyə çəkilmiş illüstrasiyalardan istifadə, eləcə də dərslikdəki "Yada salın" başlıqlı suallar əsasında yığcam müsahibənin aparılması yolu ilə.

Şagirdlər dərs zamanı əsərin evdə oxunmuş 3-cü və 4-cü parçalarını cütlük şəklində bir daha nəzərdən keçirir, kiçik qruplarda sual və tapşırıqlar üzrə araşdırma aparır, təqdimatlar hazırlayırlar:

1. Oxuduğunuz parçaların məzmunu üzrə mətnkənarı suallara cavab verin.
2. Üçüncü və dördüncü parçaları hissələrə ayırın, ad verin.
3. Hansı xüsusiyyətlər bu əsərin epik növdə, hekayə janrında yazıldığını göstərir?
4. Müəyyənləşdirdiyiniz bədii təsvir və ifadə vasitələrini cədvəldə qeyd edin.
5. Əsərdə diqqətinizi daha çox cəlb edənləri və bunun səbəbini ikihissəli gündəlikdə qeyd edin.
6. Müəyyənləşdirdiyiniz hissələrdən birinin məzmununu ətraflı nəql edin.

Müəllim qrupların işinə nəzarət edir, lazım gəldikdə tövsiyələr verir, hər bir şagirdin fəaliyyətinə və bu fəaliyyətin ümumi işə verdiyi töhfənin nədən ibarət olduğuna diqqət yetirir. Obrazların təhlili zamanı onların xarakteri, hərəkət motivləri, müəllifin münasibəti diqqət mərkəzində olur.

Müzakirə zamanı aydınlaşır ki, əsərdə iki fərqli dünyagörüşü, iki həyat mövqeyi qarşı-qarşıya qoyulur. Konfliktin bir tərəfində Niftalı koxa, Kərəm, digər tərəfində isə Mürşüd obrazı dayanır. Niftalı koxanın atası dilənçi kökündə qapısına pənah gətirmiş Mürşüdə münasibətdə milli əxlaq qanunlarından çıxış edir. Niftalı koxa milli xarakteri təcəssüm etdirən surətdir. Onun ailəsində bütövlük, bir-birinə dayaq durmaq ruhu hakimdir. Belə bir mühitdə boya-başa çatan Niftalı koxa həm də el-obanın təəssübünü çəkir. Odur ki yoxsulluğun daşını atmış, yavaş-yavaş əlinə pul gəlmiş Mürşüdün öz ailəsini incitdiyini eşidəndə dözmür, onu doğru yola qaytarmağa cəhd edir. Mürşüd ona kobud cavab versə də bu nanəcibliyin qarşısında Niftalı koxa soyuqqanlılıq göstərərək ağsaqqal nümunəsi sərgiləyir. Müzakirə zamanı qeyd edilir ki, elinə, obasına, doğma yurda məhəbbəti Niftalı koxanın həyatının son anında daha qabarıq şəkildə nəzərə çarpır. O, son dəfə ana Kürə, Ceyrançöl düzənliyinə, sahil boyu uzanan Qarayazı meşələrinə, kənd evlərinə, biçənəklərə, kövşənlərə, dərz tayalarına, mal-qara haylayan uşaqlara diqqətlə baxır, ona əziz olan hər şeylə vidalaşır.

Şagirdlərin diqqəti belə bir cəhətə cəlb edilir ki, zaman dəyişir, cəmiyyətdə mərdlik, kişilik qanunları sınağa çəkilir. Artıq cəmiyyətin müqavimətindən, etirazından çəkinməyən Mürşüdlər cəmiyyətə namərdlik toxumu səpir. Mürşüdün Niftalı koxaya namərdcəsinə güllə atması heç bir insanlıq meyarlarına sığmır. Bütün bunlar onun şərəfsiz ölümünün yaxınlaşacağına oxucuda heç bir şübhə yaratmır. Şagirdlər Kərəm surətini də milli-mənəvi dəyərlərə münasibət müstəvisində təhlil edirlər. Həyat, hadisələrin gedişi bir vaxtlar dost olmuş, uşaqlıq illərini birlikdə keçirmiş Niftalı koxa ilə Kərəmi düşmənə çevirmişdir. Lakin həyatda bir-birinə əks mövqelərdə dayansalar da, hər ikisi mərdlik, kişilik qanunları ilə yaşayır. Kərəmin Niftalı koxanın harayına yetişməsi, ona kömək etmək arzusu, Niftalının mərd gülləsi ilə ölmək istəyi məhz bu dəyərlərə bağlılıqdan irəli gəlir.

Şagirdlərə aydın olur ki, əsərdəki konfliktin mayasında xalqın formalaşmış, zamanın sınaqlarından çıxmış mərdlik qanunlarından uzaqlaşmaq meyilləri və bu cəhdlərə etiraz, müqavimət durur.

Müəllimin tapşırığı ilə tənqidçi A.Hüseynovun belə bir fikrinə də münasibət bildirilir: “Olduqca mürəkkəb, geniş və ziddiyyətli bir məna ifadə edən “kişilik” anlayışı ...əslində mənəvi-əxlaqi keyfiyyətlər kompleksidir. Odur ki milli psixologiyanın bir ünsürü kimi yox, bəlkə də müəyyən ünsürlərin məcmusu, ümumiləşdirici təcəssümü kimi alınmalıdır” [6, s.141].

“Tətbiq. Müzakirə. Yaradıcı iş” başlığı altında verilmiş tapşırıq üzrə iş zamanı şagirdlərin “Namərd gülləsi” hekayəsinin müasir dövrdə əhəmiyyəti barədə mülahizələrinin dinlənilməsi, mərdlik və namərdlik anlayışlarını öz müşahidələrinə,

həyat təcrübələrinə əsasən şərh etmələri faydalıdır. Şagirdlər bu qənaətə gəlirlər ki, hekayənin əhəmiyyəti oxucunu öz soykökünə bağlığa, milli dəyərlərə tapınmağa səsləməsindədir. Biz xalqımızın milli yaddaşında kök salan mərdlik qanunlarını bilməli və onları öz əməllərimizdə yaşatmalıyıq. Niftalı koxa, Kərəm kimi insanların əxlaqı, mənəviyyatı mövcud müasir və mürəkkəb dövrdə insana sanki yol göstərir, xeyirxahlıq, mərhəmətlilik, mərdlik haqqında dərindən düşünməyə sövq edir.

XI sinif ədəbiyyat dərslərində yazıçının həyat və yaradıcılıq yolu, XIX əsrin ikinci yarısında Azərbaycanda mövcud olan mürəkkəb tarixi şəraitdə baş verən hadisələrdən bəhs edən “Dəli Kür” romanı tədris olunur. Sənətkarın həyat və yaradıcılıq yoluna həsr olunan dərs saatının motivasiya mərhələsində şagirdlərin ədib haqqında əvvəlki bilikləri müsahibə vasitəsilə aşkara çıxarılır, Azərbaycan Respublikası Prezidentinin “Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında” Sərəncamı əsasında İsmayıl Şıxlının məktəb və rayon kitabxanalarına paylanmış “Seçilmiş əsərləri” nümayiş etdirilir. Şagirdlərə ədibin həmin kitabından araşdırma zamanı əlavə mənbə kimi istifadə qaydaları ilə bağlı tövsiyələr verilir.

Motivasiyanın digər variantı İsmayıl Şıxlı haqqında “Kürə qovuşan ömür” filmindən bir epizodun nümayiş etdirilməsi və yığcam fikir mübadiləsinin aparılmasıdır. Qazanılmış biliklərin təkrarı əsasında şagirdlərin fəal iştirakı ilə araşdırılacaq problem müəyyənləşdirilir: İsmayıl Şıxlının həyat və yaradıcılıq yolunda hansı cəhətlər diqqəti daha çox cəlb edir?

Dərslikdəki sualların (İ.Şıxlının həyat yolunun başlanğıcı hansı cəhətləri ilə diqqəti cəlb edir? Yazıçının bədii yaradıcılığında müharibə mövzusu necə əks olunmuşdur? “Ayrılan yollar” romanında hansı problemlər öz bədii həllini tapmışdır? Yazıçının sonrakı illərdə yazdığı nəsr əsərlərində hansı problemlər diqqət mərkəzinə çəkilmişdir?) və onların aydınlaşdırılmasına istiqamət verən cavabların oxusu ilə araşdırmaya başlanılır. Mətnin oxusunu fərqli formalarda (fərdi və cütlük şəklində) həyata keçirmək mümkündür. Kiçik qruplar yaratmaq, hər qrupa fərqli suallar həvalə etmək vaxta qənaət baxımından daha əlverişlidir. Kiçik qruplarda aşağıdakı tapşırıqlar üzrə təqdimat hazırlanması məqsədəuyğun hesab edilir:

1. Təqdimat zamanı tədqiqatçıların aşağıdakı fikirlərinə münasibət bildirin. Fikrinizi əsaslandırın:

a) İ. Şıxlının öz əsərlərində yaratdığı vüqar, əzəmət, kişilik timsalı olan obrazların ən yaxşılarında o böyük yazıçının, fədakar insanın öz xasiyyət və xarakterindən, nurlu simasından səciyyəvi bir əlamət var (Bəkir Nəbiyev).

b) İsmayıl Şıxlı “Ayrılan yollar”da dövrün ideoloji çərçivələrindən çıxmağa müəy-

yən cəhdlər göstərmiş, amma buna hələ tam nail ola bilməmişdi və ola da bilməzdi (İntiqam Qasımzadə).

2. Öyrəndiklərinizlə bağlı fikir mübadiləsi və müzakirə aparın.

Kiçik qrupların araşdırmasına ayrılan vaxt başa çatdıqdan sonra təqdimatların mübadiləsi və müzakirəsi aparılır. Birinci sualla (İ.Şıxlının həyat yolunun başlanğıcı hansı cəhətləri ilə diqqəti cəlb edir?) bağlı mənbələrdən istifadə edən şagirdlər ilk növbədə ədibin şeir, sənət ocağı Qazaxda anadan olmasını və orada orta və ali təhsil almasını qeyd edirlər. Qazax Müəllimlər Seminariyasında təhsil alarkən bu pedaqoji məktəbdəki ədəbiyyat dərnəyində fəal iştirakı, S.Vurğun, O.Sarıvəlli kimi şairlərin çıxışlarını, məsləhətlərini dinləməsi onun ədəbiyyata marağını artırmış, ilk qələm təcrübələrinin meydana çıxmasına səbəb olmuşdur. İndi də ədibin arxivində gənclik illərində yazdığı şeir dəftəri qalmaqdadır.

Mövzu ilə əlaqədar əlavə mənbələrlə iş zamanı şagirdlər İ.Şıxlının Azərbaycan Pedaqoji İnstitutunda ədəbiyyat müəllimi kimi səmərəli pedaqoji fəaliyyətindən minlərlə tələbə üçün böyük şəxsiyyət və pedaqoq idealına çevrilməsindən, elmi tədqiqatlarından, ali məktəb üçün çap etdirdiyi dərs vəsaitlərindən xalqımızın milli müstəqillik uğrunda apardığı mübarizəyə verdiyi töhfəsindən söz açırlar.

“Yazıçının bədii yaradıcılığında müharibə mövzusu necə əks olunmuşdur?” sualı ilə əlaqədar əlavə mənbələrdən bəhrələnən şagirdlər qeyd edirlər ki, müharibə başlayanda İ.Şıxlı pedaqoji ali məktəbdə təhsilini yarımçıq qoyub 1942-ci ildə cəbhəyə yola düşmüş, orada amansız ölüm-dirim döyüşləri, müharibənin məhrumiyyətləri, faciələri, verdiyi həyat təcrübəsi ədibin 1945-ci ilin noyabr ayına kimi qeydlər apardığı gündəliklərdə öz əksini tapmışdır. Bu həyat dərsləri ədibin sonrakı yaradıcılığında – cəbhə hekayələrində, “Kerç sularında” povestində, “Cəbhə gündəlikləri”ndə, “Odlu çarpazlar” kinossenarisində öz əksini tapmışdır.

“Sənətkarın sonrakı illərdə yazdığı nəsr əsərlərində hansı problemlər diqqət mərkəzinə çəkilmişdir?” sualı üzrə müzakirədə əlavə mənbələrdən istifadə edilərək “Dəli Kür” romanı, “Mənim rəqibim”, “Məni itirməyin, “Ölüləri qəbiristanda basdırın”, “Namərd gülləsi”, “Sapı özümüzdəndir”, “Qızıl ilan”, “Köynək” əsərləri və onların ideya-məzmunu ilə bağlı fikirlər söylənilir. Qeyd edilir ki, həmin əsərlərdə həyati problemlər, milli-mənəvi dəyərlər, cəmiyyətdə, insan davranışında olan ziddiyyətli məqamlar əks olunmuşdur.

“Ayrılan yollar” romanında hansı problemlər öz bədii həllini tapmışdır?” sualının müzakirəsi zamanı bu əsərin ədibin yaradıcılığının ilk mərhələsinin məhsulu olduğu qeyd edilir. Kənd, kolxoz mühitinə həsr olunan bu roman yazıçının əsərin obrazlar sistemi, süjet və kompozisiyası, dil-üslub xüsusiyyətləri kimi bədii sənətkarlıq məsələ-

lərində püxtələşdiyini göstərirdi.

Müəllimin istiqamətləndirici sualları əsasında nəticə çıxarılıb ümumiləşdirmə aparılmasına vaxt ayrılır. Şagirdlərdə belə qənaət yaradılır ki, İ.Şıxlının ibrətamiz həyat yolu, zəngin yaradıcılığı onu ədəbiyyatımızın görkəmli simalarından birinə çevirmişdir. O, xalq ruhunun, davranış və düşüncə mədəniyyətinin daşıyıcısı kimi bu gün də gənc nəsil üçün örnəkdir. Yazıçının bədii əsərləri üçün realizm, aktuallıq, müasirlik baxımından problem seçimində dəqiqlik, həyat həqiqətlərinin bədii əksi səciyyəvidir.

"Dəli Kür" romanı üzrə dərsdə hadisələrin baş verdiyi dövr haqqında şagirdlərdə dolğun təsəvvür yaratmaq üçün IX sinifdə "Azərbaycan tarixi" fənni üzrə qazanılmış biliklər xatırladılır: "Rus hökuməti ali müsəlman təbəqəsinin nümayəndələrini bütün idarə işlərindən kənarlaşdırsa da, bununla kifayətlənmədi. 1841-ci ildə əvvəlcə *Qazax, Şəmşəddil* və *Borçalı ağalarının*, sonra da *Xəzər vilayəti bəylərinin* torpaqlarının müsadirəsinə başlandı. Bu zorakılıq aktları Şimali Azərbaycanın hər yerində böyük narazılıqla qarşılandı. Hökumətə qarşı kütləvi xalq çıxışları baş verdi. Ali təbəqənin və kəndlilərin birgə çıxışları hökuməti bərk təşvişə saldı...

Rusiyanın müstəmləkəsi olan *Azərbaycanın ali müsəlman təbəqəsinə daxil olan bəylər rus zadəganları ilə bərabər hüquqlara malik deyildilər. Onların ali hakimiyyət orqanlarında təmsil olunmalarına imkan verilmirdi.* Rus hakimiyyəti xalqın müstəmləkə rejiminə qarşı çıxışlarında fəal iştirakına görə bəy və ağalara artıq etibar etmirdi. Ona görə də onları bütün idarə işlərindən kənarlaşdırdı. Rusiya Şimali Azərbaycanda milli və dini ayrı-seçkilik siyasəti yeridirdi. Torpaqlarımız parçalandığından "Azərbaycan" adlı inzibati-ərazi anlayışı hər hansı rəsmi sənəddə işlədilmirdi. Hətta ali müsəlman zümrəsinin nümayəndələri də siyasi cəhətdən hüquqsuz idilər. Onlar yüksək dövlət vəzifələrinə buraxılmırdılar. Azərbaycanlı gənclərə dövlət silah etibar etmir, onları orduya çağırmırdı. Dövlət idarələrində bütün işlər rus dilində aparılırdı. Köçürmə və ruslaşdırma siyasəti yeridilirdi. Dinimiz və din xadimlərimiz çox sərt polis nəzarəti altına alınmışdı. Şirvanşahlar sarayı və Şəki Xan sarayı kimi nadir tarixi abidələrimiz at tövləsinə, anbara çevrilmişdi… XIX əsrin son rübündə Şimali Azərbaycanda rus müstəmləkə əsarətinə qarşı milli azadlıq hərəkatı başlandı" [7, s.21, 26, 42].

Şagirdlərin diqqəti əsərdə təsvir edilən hadisələrin mərkəzində dayanan Cahandar ağa surətinə yönəldilir. Müzakirə zamanı qeyd edilir ki, rus imperiyasının Qafqazın mənimsənilməsi planları Cahandar ağanın da taleyində öz əksini tapır. Torpaqlarının qəsb edilməsinə qarşı çıxan Cahandar ağa yalnız varlı, nüfuzlu bir mülkədar deyil, həm də cəmiyyyətdə baş verənlərə, pristava, hakim təbəqəyə, kənd ruhanisinə münasibətdə

öz mövqeyi olan güclü bir insandır. Cahandar ağanın ziddiyyətli bir obraz olması, xarakterindəki ikilik onun mənəvi dəyərlərə fərqli münasibətində − Mələyin qaçırılmasında, qonaqları – Çernyayevski və Əhmədi xilas etməsində, Şahnigarın hərəkətinə amansız münasibətdə, təhsilli olmağın, dil öyrənməyin əhəmiyyətini dərk etməsində, oğlu Şamxalı evdən qovmasında, sonbeşiyi Əşrəfi Qori Seminariyasında rusca təhsil almağa göndərməsində, yalı və quyruğu qırxılmış Qəmər atı uçuruma aparıb güllə ilə vurmasında büruzə verir.

Şagirdlər əsərdən nümunələr gətirərək qeyd edirlər ki, Cahandar ağa ötkəmdir, iradəlidir, sözündən dönən, hədə-qorxu qarşısında tərəddüd edən, geri çəkilən deyil. Çarizmin Azərbaycanda məkrli siyasətinin mahiyyətinin dərk edilməsində onun dünyagörüşünün məhdudluğu üzə çıxır. Yalnız öz torpaqları, əkin yerləri, meşə və qoruqlar padşahlığın ov yeri elan olunanda, sahibinin bu yerlərə daxil olması qadağan ediləndə Cahandar ağa bu məsələnin ictimai-siyasi səbəbləri barədə düşünməyə, etiraz etməyə başlayır.

## Nəticə / Conclusion

Əsərin təhlili şagirdləri bu qənaətə gətirir ki, müəllif öz qəhrəmanına rəğbətlə yanaşır. Onun faciəli taleyinin timsalında xalqımızın tarixinin mürəkkəb bir dövrünün ziddiyyətləri, həqiqətləri əks etdirilmişdir. Romanda xalqımızın həyat tərzi, milli xüsusiyyətləri, adət-ənənələrinin təsvirinə xəlqilik, realizm mövqeyindən yanaşılması onun ideya-bədii dəyərini artırır, ədəbiyyatımızda yeni bir hadisə kimi dəyərləndirməyə əsas verir.

Təcrübə göstərir ki, ədəbiyyat dərslərində sənətkarın həyat və yaradıcılığının tədrisi zamanı interaktiv müzakirə metodlarından, fərqli iş formalarından istifadə şagirdlərin mövzu üzrə biliklərə dərindən yiyələnməsinə, fəallıq, müstəqillik göstərməsinə, mülahizələrin əsaslandırmasına nail olmaq baxımından çox əhəmiyyətlidir.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Azərbaycan Respublikası Prezidentinin "İsmayıl Şıxlının 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncamı. http://xalqqazeti.com/az/news/14330
2. Əliyev S., Həsənov B., Mustafayeva A., Verdiyeva N. (2016). Ədəbiyyat. IX sinif. Müəllim üçün metodik vəsait. Bakı, Bakınəşr.
3. Həbibbəyli İ., Əliyev S., Həsənov B., Mustafayeva A. (2018). Ədəbiyyat. XI sinif üçün dərslik. Bakı, Bakınəşr.
4. Həsənov B., Əliyev S., Mustafayeva A., Verdiyeva N. (2016). Ədəbiyyat. IX sinif. Dərslik. Müəllim üçün metodik vəsait. Bakı, Bakınəşr.
5. Həsənov B., Mustafayeva A., Əliyev S. (2018). Ədəbiyyat. XI sinif. Müəllim üçün metodik vəsait. Bakı, Bakınəşr.
6. Hüseynov A. (1983). Müxtəlifliyin birliyi. Bakı, Yazıçı. 141 s.
7. Mahmudov Y., Əliyev Q., Abdullayev M., Hüseynova L., Cabbarov H. (2017). Azərbaycan tarixi. 9-cu sinif üçün dərslik. Bakı, Şərq-Qərb.
8. Şıxlı İ. (2006). Seçilmiş əsərləri. Bakı, Çaşıoğlu.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 60–68
doi.org/10.48445/l7888-7712-0307-f

METODİKA

# Müasir dərslərdə təlimin keyfiyyətinin yüksəldilməsi

*Fəridə Səfərəliyeva*
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, “Azərbaycan dili və onun tədrisi texnologiyası” kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: f.safaraliyeva@mail.ru
https://orcid.org/0000-0003-1161-5759

**XÜLASƏ**
Bu gün ölkəmizdə sivil, dünyəvi dövlət quruculuğunun əsas şərti milli təhsilimizin necə qurulacağı, təhsil sistemimizin necə idarə olunacağından asılıdır. Bu baxımdan hazırda ölkəmizin dövlət təhsil sistemində aparıcı istiqamətlərin, strateji məqsədlərin, gözlənilən nəticələrin düzgün müəyyənləşdirilməsi, aparılan təhsil islahatının konseptual istiqamətlərinin dəqiqləşdirilməsi vacibdir. Çünki aydın milli təhsil, tərbiyə konsepsiyası olmadan təhsilimizin beynəlxalq standartlara uyğunlaşması, dünya təhsil sisteminə inteqrasiyası mümkün deyildir. Bu baxımdan müstəqil və ardıcıl inkişaf prinsipləri olan ölkələrdən biri kimi Azərbaycanda da bu istiqamətdə işlər aparılır, cəmiyyətin tələb və ehtiyaclarına uyğun nəticələrdən ibarət şəxsiyyətyönümlü təhsil sisteminin yaradılmasına səy göstərilir.

**AÇAR SÖZLƏR**
fəal interaktiv təlim,
müasir dərs, iş formaları

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 20.10.2023
qəbul edilib: 27.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 60–68
doi.org/10.48445/l7888-7712-0307-f

METHODS

# Improving the quality of training in modern lessons

***Farida Safaraliyeva***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Department of "Azerbaijani language and its teaching technology", Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: f.safaraliyeva@mail.ru
https://orcid.org/0000-0003-1161-5759

**ABSTRACT**
The main condition for building a civilized, secular state in our country today depends on how our national education will be built, how our education system will be managed. From this point of view, it is important to correctly determine the leading directions, strategic goals, expected results in the state education system of our country, to clarify the conceptual directions of the educational reform being carried out. Because without a clear concept of National Education and upbringing, it is impossible for our education to adapt to international standards and integrate into the world education system. In this regard, as one of the countries with independent and consistent development principles, work is underway in this direction in Azerbaijan. Efforts are being made to create a personality-oriented education system consisting of results in accordance with the requirements and needs of society.

**KEYWORDS**
active interactive training, modern lesson, forms of work

**ARTICLE HISTORY**
Received: 20.10.2023
Accepted: 27.11.2023

## Giriş / Introduction

Son 30–40 il ərzindəki elmi-texnoloji tərəqqi, innovasiyalar və modernləşmə nəticəsində praktiki bilik və vərdişlərlə zənginləşməyən, sırf nəzəri xarakter daşıyan təhsil öz fundamental əhəmiyyətini itirməkdədir. Bu baxımdan təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Səriştə − əldə olunmuş bilik və bacarıqları praktiki fəaliyyətdə effektiv və səmərəli tətbiq etmək qabiliyyətidir. O, şəxsin qazandığı bilik və bacarıqların konkret fəaliyyətin nəticəsinə çevrilməsini təmin edir. Səriştəyə əsaslanan təhsil sosial-iqtisadi inkişafa daha effektli xidmət göstərir.

## Əsas hissə / Main part

Kurikulumların məzmunu texnoloji irəliləyişin gətirdiyi yenilikləri nəzərə almaqla daim inkişaf etdirilir ki, bu da müxtəlif təhsil pillələrində spesifik yanaşma tələb edir. Burada ümumi təhsil pilləsində şəxsiyyətin hərtərəfli formalaşdırılması prioritet olduğu halda, ali təhsildə əmək bazarının cari və gələcək tələbləri əsas götürülür. Ali təhsil kurikulumunun daimi inkişafı əmək bazarı subyektlərinin tələblərinin sistematik öyrənilməsini vacib edir. Təhsilin inkişafında mühüm irəliləyişlərə nail olmuş ölkələrin təcrübəsi göstərir ki, informasiya-kommunikasiya texnologiyalarına əsaslanan, yaradıcı düşüncəni inkişaf etdirən və təhsilalanın fərdi xüsusiyyətlərini nəzərə alan müasir, fəal-interaktiv təlim metodları daha yüksək nəticələr verir. Həmin məqsədlə, davamlı olaraq mütərəqqi tədris metodlarının yaradılması və müəllimlərin səriştəsinin artırılması təhsil siyasətində mühüm yer tutur. Məlum olduğu kimi, kurikulumlarda ilkin olaraq təlimin məzmunu öz əksini tapır. Təlimin məzmunu ənənəvi proqramlardan fərqli olaraq, nəticələr formasında verilir, bu nəticələr şagirdlərin yiyələnəcəkləri bilik və fəaliyyəti konkret ifadə etməklə çox şəffaf xarakter daşıyır. Mahiyyət etibarilə bacarıqlardan ibarət olan bu nəticələr minimum tələb kimi təsdiq olunduğundan həm də standart hesab edilir. Bu gün ümumtəhsil məktəblərində tədrisin yeni üsullarla aparılması köhnə təhsil sisteminin metodlarına dayanaraq daha mükəmməlini yaratmaq üçün, doğma ana dilimizin fonetik sisteminin, leksik tərkibinin və qrammatik quruluşunun dərindən öyrənilməsi üçün geniş imkanlar açmışdır.

Azərbaycan dili təliminin əsas məqsədi şagirdlərə dilimizin fonetik, qrammatik quruluşuna, leksikasına, frazeologiyasına, söz yaradıcılığına, üslubiyyat, nitq mədəniyyəti və digər bölmələrinə dair müvafiq nəzəri biliklər verməkdən və bu biliklər zəminində onlarda hərtərəfli nitq hazırlığı, öz fikrini şifahi, eyni zamanda yazılı olaraq sərbəst, dəqiq və düzgün ifadə etmək bacarıqları yaratmaqdan ibarətdir.

Kurikulumun həyata keçirilməsində şagird nailiyyətlərinin obyektiv qiymətləndirilməsi və stimullaşdırılmasının təmin edilməsi üçün milli, ümumbəşəri dəyərin nəzərə alınması, ümumi inkişafı, meyl və maraqları nəzərə almaqla şagirdlərə əlverişli təlim şəraitinin yaradılması zəruridir. Bu zaman şagirdlər aktiv, tədqiqatçı mövqeyi tutur, müəllim tərəfindən şagirdlər üçün yeni biliklərin müstəqil olaraq əldə olunması, mənimsənilməsi şəraiti yaradılır. Bu cür fəal təlimdə şagirdlərdə aktiv, yaradıcı düşünmə qabiliyyəti və yeni biliklərə sərbəst yiyələnmək yolları birləşdirilmiş olur. Belə iş forması şagirdlərə problemin birgə həll edilməsini, bir-birinin fikrinə hörmətlə yanaşmağı, müstəqil öyrənməyi öyrədir. Pedaqoji prosesin qanunauyğunluqlarından biri məhz problemli situasiya ilə əlaqədardır. Pedaqoji prosesdə problemli situasiyanı adətən müəllim yaradır, özü də onu açır, şagirdlərə isə dinləmək, müəllimin mühakiməsini izləmək qalır. Belə hallarda şagirdlər problemli situasiyada yaradılmış ziddiyyəti duysalar da, onun araşdırılmasına fəal qoşulmur, o qədər də zehni gərginlik keçirmirlər. Bu cür hallarda öyrənənlər problemin həllinin iştirakçısına deyil, müşahidəçisinə çevrilirlər. Şagirdlər problemli situasiyada ziddiyyətin yaradılması və ifadə olunması işinə fəal şəkildə qoşulub ziddiyyəti aradan qaldırmaq işinə cəlb edildikdə bu zaman fərqli pedaqoji nəticə alınır: şagirdlər dərindən düşünməli, cavab tapmalı, fikirlərini əsaslandırmalı, ziddiyyətdəki yeniliyi dərindən dərk etməli olurlar. Qanunauyğunluq belədir: problemli situasiyada ziddiyyətin yaradılmasına, həmçinin aradan qaldırılmasına şagirdlər fəal cəlb edildikdə onların zehni fəallığı xeyli güclənir, ziddiyyətdən doğan fikrin yeniliyini şüurlu formada başa düşürlər. Həmin qanunauyğunluğun qanun formasında ifadəsini pedaqoqlar belə şərh edir: problemli situasiyadakı ziddiyyətin duyulması və aradan qaldırılması qanunu.

Müasir dərsdə müəllim uşaqlarda yaradıcı təxəyyülü inkişaf etdirməyə və idraki müstəqilliyə xidmət göstərən problemli suallara, düşündürücü məsələlərə xüsusi yer verməlidir. Belə dərs şagirdlərdə müəyyən bacarıq və vərdişləri formalaşdırır. Müasir dərs bir növ müəllimin dərsə ciddi hazırlaşmasını tələb edir. Buna görə də müəllim hansı priyomlardan necə və nə zaman istifadə edəcəyini əvvəlcədən müəyyənləşdirməli, sinifdə səsləndirdiyi informasiyanın strukturunu öncədən düşünməli, mövzuya dair yardımçı, fakt və hadisələri əsas məsələnin həllinə yönəltməyi bacarmalı, dövrün mühüm ictimai-siyasi hadisələrindən baş açmalıdır. Müasir dərs uşaqların dünyagörüşünü inkişaf etdirməli, onların əqidəcə mətinləşməsinə şərait yaratmalı, dərsdə əyanilikdən və müxtəlif mənbələrdən alınmış əlavə məlumatlarla onların dərketmə qabiliyyətini artırmalıdır. Ümumiyyətlə, interaktiv təlim prosesi elə təşkil olunmalıdır ki, şagirdlər biliyi tədqiqat yolu ilə əldə etsin. İnteraktiv təlim dərsdə meydana çıxan şagirdlərarası öyrənmə ünsiyyəti və əməkdaşlığı,

müəllim-şagird birliyini nəzərdə tutur. İnteraktiv metodlar isə təlim prosesində öyrənmə və anlaşmaya, bacarıq və keyfiyyətlərə şagirdlərin yiyələnməsini həyata keçirən üsullar, tərzlər, işlər, yanaşmalar, vasitələrdir.

Bu təlim prosesində sinif (auditoriya) qrup və cütlər formasında problemin həlli yollarına dair axtarışa çıxarılır, qruplar əldə olunmuş nəticələri işçi vərəqlərində qeyd edir, sonra onun təqdimatını həyata keçirirlər. Təqdimatlar bitdikdən sonra bu tədqiqat nəticələri arasında rabitə yaradılır, məlumatlar sistemləşdirilir və ümumi bir şəkildə təsnif olunur. Bundan sonra həmin yekunlarla tədqiqatın başlanğıcında şagirdlərin irəli sürdüyü ilkin fərziyyələrlə müqayisələr aparılır. Şagirdlər (öyrənənlər) hansıların üst-üstə düşdüyünü, nələrin isə yeni olduğunu müşahidə edir, ümumi nəticəyə gəlirlər və öyrəniləcək mövzuya çıxaracaq problem qoyularaq motivasiya yaradılır. Motivasiya isə təhriketmə deməkdir. Yəni şagirdlərin (auditoriyanın) təlim-dərketmə marağını problemin həllinə doğru fəal, canlı şəkildə istiqamətləndirir. Onun digər vəzifəsi isə tədqiqat sualını formalaşdırmağa şərait yaratmaqdır. Məhz həmin tədqiqat sualı ilkin fərziyyələr irəli sürməyə və tədqiqat işlərini təşkil etməyə imkan yaratmış olur. Tədqiqat sualı məhz tədqiqat işinin həyata keçirilməsini tələb edir. Çox vaxt ibtidai sinif müəllimləri motivasiya qurur, amma tədqiqat sualını ortaya qoymaqda çətinlik çəkirlər. Tədqiqat işlərinin nəticələri işçi vərəqlərində qeyd olunur və təqdimatlar həyata keçirilir. Sonra təqdim olunan məlumatlar təşkil və təsnif olunur. Alınan qənaətlər ilkin fərziyyələrlə müqayisə olunaraq nəticələr çıxarılır. Yeni pedaqoji texnologiya fəal təlimə əsaslanır. Fəal təlimin modeli müəyyən olunan komponentlərlə şərtlənir. Bura fəal təlimin məzmunu, metodları, öyrədici mühit, qiymətləndirmə daxildir. Təlimin məzmunu nəyi öyrətmək, metodları necə öyrətmək, öyrədici mühit hansı şəraitdə öyrətmək, qiymətləndirmə ayrı-ayrı komponentlərin səmərəliliyini müəyyən edən amillərə uyğun olaraq nəticəni aşkarlayır.

Dərsdə müasir təlim metodlarından istifadə bu gün müasir dərsin xarakterik xüsusiyyətlərindəndir. Həyat məktəb, müəllim və şagirdlər qarşısında yeni tələblər qoyduğuna görə bu məsələlərin üzərinə təkrar-təkrar qayıtmaq lazım gəlir. Müasir dərs elmi-texniki tərəqqinin tələblərini təmin edən, inkişaf etməkdə olan müstəqil dövlətimizdə cəmiyyətin məqsədlərinə cavab verən və psixoloji-pedaqoji elmlərin nailiyyətlərini nəzərə alan dərsdir. Müasir dərsdə qavranılmış biliklər, yeni biliklərin mənimsənilməsində bir komponent kimi həyata keçirilməli, dərsdə biliklə fəaliyyətin dialektik əlaqəsi və asılılığı, sualların obyektiv həqiqətdən doğması və düşündürücü olması, şagirdlərin yaradıcı təfəkkürünün fərqləndirici xüsusiyyətinin mütləq nəzərə alınması, şagirdlərin idrak fəaliyyətindəki müstəqilliyi əsas götürülməlidir.

Dünyada gedən qloballaşma cəmiyyətin bir çox sahələrinə öz təsirini göstərir.

Təhsildə aparılan islahat məhz həmin zərurətdən yaranmışdır. Təhsilin keyfiyyətini yüksəltmək, yeni pedaqoji texnologiyaları öyrənib onlardan səmərəli istifadə etmək başlıca vəzifə kimi qarşıda dayanır. Yeni pedaqoji təfəkkürün başlıca prinsipləri − demokratikləşmə, humanistləşdirmə, fərdiləşdirmə, diferensiallaşdırma, inteqrasiya şəxsiyyətin formalaşdırılması və inkişaf etdirilməsini həyata keçirir. Metod olaraq interaktivlik təlim prosesində müəllim və şagird arasında işin gedişi mövzudan, şərhdən, dialoqdan, rollu oyundan həmin anda meydana çıxan yanaşma, izah, dialoq və s. asılıdır. Yəni bu tərz əvvəldən planlaşdırılmır, işin – təlim prosesinin gedişi bu məqamı ortaya çıxarır və daha çox şagirdin müstəqilliyi, müdaxiləsi ilə baş verir. Digər tərəfdən, interaktivlik şagirdlərin özləri arasında da ola bilər. Əsas cəhət odur ki, bu prosesdə əməkdaşlıq edən öyrənənlər və öyrədən eyni hüquqlu mövqedə dayanırlar. Təbii ki, müəllim öyrədən olaraq bələdçi, fasilitator, məsləhətçi funksiyasını yerinə yetirir; şagirdlərin işlərinə müdaxilə etmədən problemləri qoyur, istiqamət verir, nəzarət edir, amma təlim tapşırıqları üzərində şagirdlər diskussiya apararaq işləyirlər. Təlimlə tərbiyənin vəhdəti də müasir dərsin qarşısında qoyulmuş mühüm tələbdir. Dərs şagirdlərin mənəvi inkişafına, əxlaqca təkmilləşməsinə, vətənpərvərlik, insanpərvərlik, əməksevərlik ruhunda yetişməsinə xidmət göstərməlidir. Müasir dərs milli təhsilin yaradılmasına yönəlməlidir. Pedaqoq Nurəddin Kazımov haqlı olaraq qeyd edir ki, müəllimin məqsədyönlü, planlı və mütəşəkkil rəhbərliyi altındakı şagirdlərin öyrəndiyi bilik və bacarıqlar təsadüfi biliklər toplusu deyil, birbaşa cəmiyyətin sonrakı inkişafına yönəlir [2, s.131]. Sözsüz ki, şəxsiyyəti ilk növbədə ailə, mühit, daha sonra məktəb formalaşdırır.

İbtidai sinif şagirdlərinin yaradıcılıq, tədqiqatçılıq bacarıqlarını üzə çıxarmaq, müstəqil işin səmərəliliyinin zəruri şərtlərindən biri də verilmiş tapşırıqların xaraktercə müxtəlif olmasıdır. Materialın mənimsənilməsində qavrayışın müxtəlif növləri – görmə, eşitmə, hərəki qavrayış iştirak etməlidir. Məsələn, müəllim işi elə tərtib etməlidir ki, şagirdləri öyrəndikləri faktları təhlil və müqayisə etməyə, qaydaları bütün hallara tətbiq etməyə alışdırsın. Məsələn, qrammatik anlayışları möhkəmlətmək üçün şagirdləri müvafiq sözlərin altından xətt çəkməyə, ayrı-ayrı sözlər arasındakı oxşarlıq və fərqi tapmağa və s. yönəltmək faydalı nəticə verir. Hər bir müstəqil işin nəticəsi yoxlanılmalıdır. Bu zaman təkcə vərdişin və bacarığın yaranma səviyyəsi deyil, onun anlaşılma dərəcəsi, öz hərəkətini nəzəri nəticələrlə əsaslandırmaq bacarığı da aşkara çıxarılmalıdır.

İnteraktiv təlim metod və üsullarının (qruplar, cütlər, rollar, əqli hücum, nəticə və s.) tətbiqi tədris prosesini xeyli intensivləşdirir, onu hər bir şagird üçün maraqlı edir, dərsdə fəallığın maksimum artmasına zəmin yaradır, bununla da təlimin inkişafetdirici

aspektini xeyli dərəcədə gücləndirir. Məsələn, III sinif Azərbaycan dili dərsliyində cütlərlə və qruplarla iş formasında xeyli sayda tapşırıqlar əks olunmuşdur:

Şagirddən müəllimin təqdim etdiyi təmsilləri oxumaq və suallar əsasında təqdimat hazırlamaq tələb olunur.

I qrup: Siçan və Dəvə

II qrup: Ağıllı Qarışqa

III qrup: Ayı və Şir

IV qrup: Sincab və Balıq

1. Oxuduğunuz mətn hansı xüsusiyyətlərə görə təmsil hesab olunur?
2. Təmsildə hansı mənfi xüsusiyyətlərdən danışılır?
3. Təmsildən hansı ibrətamiz nəticəyə gəlmək olar? [1, s.92]

İbtidai siniflər üçün yazılmış Azərbaycan dili dərsliyinə nəzər saldıqda görürük ki, burada kifayət qədər müxtəlif janrlı bədii əsərlər öz əksini tapmışdır.

Dərsliyin başqa bir çalışmasında verilmiş xüsusiyyətlərə uyğun gələn sözləri müəyyən etmək tapşırılır.

**Cütlərlə iş**

1. İsimdir, ümumidir, konkretdir.
2. İsimdir, xüsusidir, *hara*? sualına cavab verir.
3. İsimdir, ümumidir, mücərrəddir.
4. Feildir, keçmiş zamandadır, inkardadır.
5. Feildir, indiki zamandadır, təsdiqdədir.
6. Feildir, gələcək zamandadır, təsdiqdədir.

*A) Şəki B) aparmadı C) qaçır Ç) fikir D) qələm E) oxuyacaq* [1, s.93].

Dərslik şagirdlərdə fəal müstəqil idraki (əqli) fəaliyyətin oyanmasına, təfəkkür və qabiliyyətin inkişafına istiqamətlənməlidir. Təlim-tərbiyə prosesində interaktiv təlim metodlarının tətbiqi sürətlə dəyişən və inkişaf edən müasir dövrdə yaşamaq, fəaliyyət göstərmək, əməkdaşlıq etmək, qərar qəbul etmək kimi bacarıqları əks etdirən kompetensiyaların formalaşması orta təhsilin məqsəd və vəzifələrinə yeni münasibəti əks etdirir. Hazırda həm metodik, həm də elmi-pedaqoji, psixoloji cəhətdən təkmil olan müəllimlərimiz yeniliyin və müasirliyin nədən ibarət olmasını dərk edir, öz dərslərində tətbiq edərək müasir dərs və onun təşkilinə verilən tələblərdən geniş istifadə edirlər [Mehrabov A. Bakı, 2007].

Əgər əvvəllər bilikləri əldə etmək üçün şagirdi iki əsas bilik mənbəyi (müəllim və dərslik) qane edirdisə, bu gün həmin mənbələr çoxsaylı məlumat mənbələri ilə müqayisədə geridə qalır. Bu səbəbdən müasir təlimin başlıca vəzifələrindən biri öyrənməyi öyrətməkdir, yəni şagirdləri bilikləri müstəqil əldə etməyə

yiyələndirməkdir. Yalnız təlim metodlarının keyfiyyətcə dəyişdirilməsi, onların şəxsiyyətə, onun tələbatlarına yönəldilməsi, bilikləri mənimsəmə zamanı yaradıcı təfəkkürdən fəal istifadə edilməsi şəraitində təlim böyük səmərə verə bilər. Eyni zamanda şəxsiyyətyönümlü belə tədris prosesi inkişaf proseslərinin keyfiyyətinə də təsir edəcək: idraki və sosial fəallığı artırmaqla şəxsiyyətin dəyərlərini və vərdişlərini formalaşdıracaq. Bu tələblərin nəzərə alınması məhz məhsuldar, yaradıcı təfəkkürü və yeni biliklərə müstəqil yiyələnmə üsullarını özündə birləşdirən fəal (interaktiv) təlim texnologiyalarına üstünlük verməyi tamamilə zəruri edir [Veysova Z. Bakı, 2009].

## Nəticə / Conclusion

Dünya təcrübəsi göstərir ki, fəal (interaktiv) təlim metodu dərsin keyfiyyətinin artırılması məqsədilə güclü vasitə ola bilər. Bu metod şagirdlər üçün dərsi maraqlı və cəlbedici edir. Fəal (interaktiv) təlim həm məzmunun öyrənilməsinin, həm də tətbiqinin səmərəliliyini artırır, şagirdlərin dərketmə fəaliyyətini daha da fəallaşdırır. Artıq Azərbaycanda müasir təlim metodlarının tətbiqi layihəsi həyata keçirilir. Son illərdə respublikamızda fəal dərslərin hazırlanması, planlaşdırılması və onların həyata keçirilməsi üçün vacib olan ilkin təcrübə toplanmış, müəllimlərdə əsas bilik, bacarıq və vərdişlər formalaşmışdır. Keçirilən monitorinqlər göstərir ki, fəal (interaktiv) təlim metodlarını həyata keçirərkən müəllimlər bir çox problemlərlə qarşılaşırlar.

Bəzi müəllimlər, xüsusən də metodistlər yanlış olaraq düşünürlər ki, fənnin tədrisi şagirdlərdə yalnız müvafiq biliklər, bacarıq və vərdişlər formalaşdırmalıdır; psixoloji qüvvələri inkişaf etdirməyin isə onlara dəxli yoxdur. Belə bir yanlış əhvali-ruhiyyə şagirdlərin psixoloji inkişafına ciddi ziyan vurur. Halbuki təlim zamanı şagirdlərdə diqqəti, iradəni, təfəkkürü, təxəyyülü və s. psixoloji qüvvələri inkişaf etdirmədən mənimsəmənin səviyyəsini yüksəltmək olduqca çətinləşir. Belə ki, yenilikləri həyata keçirərkən təcrübənin yayılmasına və mübadiləsinə böyük ehtiyac duyurlar. Müəllimlərin yenilikləri həyata keçirmələrində təcrübələri artdıqca və bu işə daha çox müəllim cəlb olunduqca yeni metodiki tövsiyələrə, tədris materiallarına və digər metodiki məlumat mənbələrinə ehtiyacları artır. Əminliklə demək olar ki, fəal (interaktiv) təlimin xüsusiyyətlərinin hər bir müəllim tərəfindən istifadəsi şagirdlərin dərs zamanı idrak fəallığını və əməkdaşlıq həvəsini artıracaq.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. İsmayılov R., Nurullayeva Ü., Zahidova Ş., Bayramova İ., Xanalıyeva A., Cəlilova K. (2022). Ümumtəhsil müəssisələrinin 3-cü sinifləri üçün Azərbaycan dili fənni üzrə dərslik (2-ci hissə). 103 s.
2. Kazımov N. (2011). Məktəb pedaqogikası. 458 s.
3. Kərimov Y. (2009). Təlim metodları. Bakı, Nasir.
4. Mehrabov A. (2007). Azərbaycan təhsilinin müasir problemləri. Bakı, Mütərcim.
5. Veysova Z. (2009). Fəal interaktiv təlim. Müəllim üçün vəsait. Bakı, 149 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 69–78
doi.org/10.48445/g1171-9746-2346-y

**M E T O D İ K A**

# “Üslubiyyat və ritorika” fənninin mövzusu, məqsəd və vəzifələri

***Nəsrəddin Musayev***
Dissertant, AMEA Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutu.
Azərbaycan. E-mail: musayev.n@mail.ru
https://orcid.org/0000-0001-9704-1615

**XÜLASƏ**
Məqalədə “Üslubiyyat və ritorika” fənninin tədrisini şərtləndirən amillər, fənnin tədrisinin məqsəd və vəzifələri, ümumi kompetensiyaların, peşə kompetensiyalarının məzmunu, habelə təhsil proqramının və fənn üzrə təlimin nəticələrindən bəhs olunur. Belə qənaətə gəlinir ki, natiqlik sənətinin bir elm sahəsi kimi təşəkkül tapdığı dövrdən başlayaraq düzgün, aydın, səlis və məntiqi danışanlar cəmiyyət tərəfindən həmişə yüksək qiymətləndirilmişdir. Mədəni nitqə yiyələnmək üçün leksik-qrammatik normaların tələblərinə əməl etməklə bərabər həm də nitq üslubi cəhətdən düzgün qurulmalı, bir sözlə, elə sözlər və ifadələr seçilməlidir ki, fikrin düzgünlüyünə və aydınlığına xələl gəlməsin. İstər şifahi, istərsə də yazılı nitqdə hər bir sözün leksik, qrammatik mənasını, etimologiyasını bilmək tələb olunur. Ünsiyyət zamanı üslubi cəhətdən zəngin nitqə malik olmaq üçün ədəbi dilin normalarını və dil vahidlərinin üslubi keyfiyyətlərini də mükəmməl bilmək lazımdır.

**AÇAR SÖZLƏR**
üslubiyyat, ritorika, yazılı ünsiyyət, şifahi ünsiyyət, üslubi vasitə, üslubi norma

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 17.10.2023
qəbul edilib: 21.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 69–78
doi.org/10.48445/g1171-9746-2346-y

METHODS

# The topic, goals and duties of the subject of "Stylistics and rhetoric"

***Nasraddin Musayev***
Dissertatist, Institute of Literature named after Nizami Ganjavi of ANAS. Azerbaijan.
E-mail: musayev.n@mail.ru
https://orcid.org/0000-0001-9704-1615

**ABSTRACT**
The article focuses on the facts that intend to determine the teaching of the subject "Style and rhetoric", the goals and objectives of teaching the subject, the content of general competencies, professional competencies, as well as the results of the educational program and training in the subject. It comes to the kind of conclusion that, since the art of public speaking was formed as a field of science, true, clear, fluent and logical speakers have always been highly appreciated by the society. In order to possess advanced speech, in addition to complying with the requirements of lexical-grammatical norms, the speech should contain stylistically correct form too, in other words, the words and expressions should be chosen in a way that the correctness and clarity of the thought are not losing their value. It is required to have information about the lexical, grammatical meaning and etymology of every word used in both oral and written speech. In order to have a stylistically rich speech during communication, it can be considered as an obligatory need to know the norms of the literary language and the stylistic qualities of language units perfectly.

**KEYWORDS**
stylistics, rhetoric,
written communication,
oral communication,
stylistic means,
stylistic norm

**ARTICLE HISTORY**
Received: 17.10.2023
Accepted: 21.11.2023

## Giriş / Introduction

"Üslubiyyat və ritorika" fənninin tədrisində məqsəd təhsilalanlara gələcəkdə tabeçiliyində olan insanlarla, iş yoldaşları və rəhbər işçilərlə ünsiyyət problemini həll etməyi öyrətməkdir. Fənn tətbiqi xarakterlidir. Onun məqsədi həm də gündəlik işgüzar və akademik fəaliyyətləri qurmaq üçün zəruri şərait yaratmaq, təhsilalanlarda müvafiq psixoloji və əxlaqi keyfiyyətləri formalaşdırmaqdır. Yazılı və şifahi ünsiyyət prosesində üslubi çalarlarla zəngin, düzgün, dəqiq və ifadəli nitqə malik olmaq, ünsiyyət zamanı ədəbi tələffüz, vurğu, intonasiya, emosiya və s. məsələlərin nəzərə alınması və onlara əməl olunmasına riayət etmək, Azərbaycan dilinin üslubları və ritorikanın əsasları haqqında qazanılan bilikləri gələcək fəaliyyətlərində tətbiq etmək bacarığına nail olmaq da üslubiyyat və ritorika fənninin məqsədlərinə daxildir.

"Üslubiyyat və ritorika" fənni fikri məntiqi cəhətdən formalaşdırmağa və düzgün ifadə etməyə, dilin müxtəlif səviyyələri üçün qəbul edilmiş normalar əsasında mədəni nitq vərdişlərini yaratmağa, danışıq etikasını və diskussiya mədəniyyətini, şifahi və yazılı ünsiyyəti öyrətməyə kömək edir. Bu fənnin tədrisinin digər vəzifəsi ədəbi dilin funksional üslublarının öyrənilməsi ilə bağlı nəzəri və praktiki məsələlərin, onlara aid sərbəst yaradıcılıq işlərinin yerinə yetirilməsi üçün bilik, bacarıq və vərdişlərin mənimsənilməsinə xidmət etməkdir. Fənni mənimsəməklə Azərbaycan dilinin üslubları və mədəni nitq üçün zəruri olan bilik, bacarıq və vərdişlər qazanmaq olar.

## Əsas hissə / Main part

Mövzunun aktuallığı, hər şeydən öncə, dilçilik elminin mühüm sahələrindən biri olan üslubiyyatın yaranma və inkişaf tarixinin tədqiqata cəlb olunması ilə səciyyələnir. Bu elm sahəsinin yaranması və inkişaf tarixi ilə bağlı müxtəlif zamanlarda həm dünya, həm də Azərbaycan dilçiləri müəyyən araşdırmalar aparmışdır. Azərbaycan dilçiliyində ayrı-ayrılıqda üslubiyyatla bağlı çox sayda dəyərli tədqiqat işlərinin olmasına, leksik və qrammatik üslubiyyat sahəsində zəngin araşdırmaların aparılmasına baxmayaraq, üslubiyyatın yaranma və inkişaf tarixi ilə bağlı araşdırmalar azlıq təşkil edir. Ölkəmizdə dilçiliyin üslubiyyat bölməsi haqqında ilk sistemli tədqiqatlar dilçi-alim Əbdüləzəl Dəmirçizadəyə məxsusdur. Sonralar isə müxtəlif dövrlərdə Afad Qurbanov, Türkan Əfəndiyeva, Qızqayıt Mustafayeva və başqalarının tədqiqatlarında üslubiyyatın bəzi məsələləri ilə bağlı əhəmiyyətli məsələlərdən bəhs olunmuşdur. Azərbaycan üslubiyyatının inkişaf tarixinin tədqiqi məsələsi bu cəhətdən xüsusi aktuallıq kəsb edir. Natiqlik sənətinin bir elm sahəsi kimi təşəkkül tapdığı dövrdən başlayaraq düzgün, aydın, səlis və məntiqi danışanlar cəmiyyət tərəfindən də

həmişə yüksək qiymətləndirilmişdir. Bu cür danışığa isə, şübhəsiz, mədəni nitqə verilən tələblərə uyğun danışıq qabiliyyətli insanlar malik ola bilərlər. Mədəni nitqə yiyələnmək üçün leksik-qrammatik normaların tələblərinə əməl etməklə bərabər həm də nitq üslubi cəhətdən düzgün qurulmalı, bir sözlə, sözlər və ifadələr düzgün seçilməlidir ki, fikrin düzgünlüyünə və aydınlığına xələl gəlməsin. İstər şifahi, istərsə də yazılı nitqdə hər bir sözün leksik, qrammatik mənasını, etimologiyasını bilmək tələb olunur. Ünsiyyət zamanı üslubi cəhətdən zəngin nitqə malik olmaq üçün ədəbi dilin normalarını və dil vahidlərinin üslubi keyfiyyətlərini də mükəmməl bilmək lazımdır.

Tədqiqatçı Qızqayıt Mustafayeva qeyd edir ki: "Ədəbi dilin əsasını ümumxalq dili vahidləri və hamı üçün ümumi olan cəhətlər təşkil edir. Lakin bir sıra məhdud sahələrlə əlaqədar ədəbi dil ifadəlilik vasitələri sisteminə görə müxtəlif qollara ayrılır ki, buna da ədəbi dilin üslubları deyilir" [8, s.17].

Üslubların tarixi qədim olsa da, üslubiyyatın yaranması XX əsrin birinci rübünə təsadüf edir. Praqa funksional dilçilik məktəbinin banisi Villem Mateziusdan başlayaraq müasir dövrümüzədək üslubiyyatla bağlı bir çox tədqiqatlar aparılsa da, həm üslub, həm də üslubiyyat haqqında hamının qəbul etdiyi birmənalı fikir yoxdur. Bəzi tədqiqatçılar məsələyə ədəbiyyatşünaslıq prizmasından yanaşaraq üslubiyyatı ədəbiyyat nəzəriyyəsinə aid etsələr də, akademik V.V.Vinoqradov "bədii üslub məhz bədii dillə yaranır, elə buna görə də üslubiyyat daha çox dilçilik sahəsinə aid edilməlidir" – deməklə üslubiyyat elminin müstəqil dil sahəsi olduğunu sübuta yetirdi.

Azərbaycan ədəbi dilində də üslubların tarixinin qədim olmasına baxmayaraq, üslubiyyatın fundamental araşdırılması XX əsrin birinci rübünə təsadüf edir. Bu sahədə müəyyən cəhdlər edilsə də (məsələn, A.Tağızadə, X.S.Xocayev. Müxtəsər üslubiyyat (red: B.Çobanzadə), 1933), ilk sistemli və əsaslı tədqiqatlar Ə.Dəmirçizadəyə məxsusdur. Onun "Azərbaycan dilinin üslubiyyatı" (1962) əsəri dilimizdə bu sahədə ilk fundamental tədqiqat əsəridir. Müəllif bu əsərində yazır: "Üslubiyyatda səslərin, sözlərin, ifadələrin, cümlələrin və eləcə də bütün qrammatik qaydaların məhz məna və təsir qüvvəti cəhətindən ölçülüb seçilməsi və hansının daha üstün, məqsədə daha çox uyğun olmasını müəyyənləşdirmək yolları aydınlaşdırılır. Buna görə də, demək olar ki, üslubiyyatda geniş mənada sinonimlər, yəni məna və məzmunca yaxın olan, yaxud nisbi mənada eyni olan ifadələr, sözlər, qrammatik vasitələr tutuşdurulur və hansının işlədilməsinin məqsədə daha uyğun olduğu müəyyənləşdirilir [4, s.22].

Üslubiyyatın yaranması və inkişaf tarixi ilə bağlı professor Nadir Abdullayev yazır: "XIX əsrdə Azərbaycanda M.Ş.Vazeh, M.F.Axundov, A.A.Bakıxanov, Q.Zakir kimi praktik natiqlər, bu sahənin nəzəriyyəçiləri yetişmişdir. M.F.Axundov özünün bədii və elmi yaradıcılığında mədəni nitq, natiqlik məharəti, fəsahətli kəlam, nitqin müxtəsərliyi

və aydınlığı, səhnə dili, dilimizin orfoqrafiya və orfoepiya normaları və s. haqda elmi-nəzəri fikirlər, mülahizələr söyləmişdir... XIX əsrin sonu və XX əsrin əvvəllərində yaşayıb fəaliyyət göstərən qabaqcıl, mütərəqqi ziyalılar, maarifçilər, müəllimlər dilimizin saflığı, yad təsirlərdən qorunması, bu dildə danışmağın zəruriliyi, təlimin Azərbaycan dilində aparılmasının vacibliyi və s. məsələlərlə bağlı çox faydalı fikirlər söyləmişlər...” [1, s.23].

Üslubiyyata nəzərən *üslub* (stil) daha qədim və geniş anlayışdır. Üslub termin kimi bir işi, fəaliyyəti həyata keçirmək üçün üsul, yol, vasitə, tərz anlamını ifadə edir, müəyyən olunmuş istifadə tərzini, yolunu bildirir. Musiqidə, rəssamlıqda, heykəltəraşlıqda, memarlıqda bu anlayışa tez-tez təsadüf edilir. Məsələn, klassik musiqi üslubu, rəngli boya üslubunda yaradılmış rəsmlər, İtaliya heykəltəraşlıq üslubu, Şərq üslubunda tikilmiş binalar və s. Nitq üslubu isə ünsiyyətlə bağlıdır. Bu səbəbdəndir ki, “üslubsuz nitq yoxdur, hər bir nitq (istər şifahi, istərsə də yazılı) həm ədəbi dilin normaları daxilində həm də özünəməxsus tərzə malikdir” [6, s.3]. Dil üslublarının hamısı dilin inkişaf səviyyəsindən asılıdır. “Üslub bir məfhum kimi qədim Yunanıstanda meydana gəlmiş, sonralar dünya dilçiliyində müxtəlif səviyyələrdə tədqiq olunmuşsa da, Azərbaycan dilçiliyində XX əsrin əvvəlində tədqiqat meydanına çıxmışdır. İlk əvvəllər “dilin gözəlliyi”, “yazıçının fərdi üslubu”, “ünsiyyət manerası”, “gözəl nitq”, “axıcılıq, dəqiqlik”, “ədəbi axın” haqqında elm kimi dərk olunmuşdur. Üslubiyyat bir elm kimi üslublar haqqında nəzəriyyə olub, fikrin sözlə ifadəsinin daxili aspektini öyrənir. Bu baxımdan üslubiyyat ədəbiyyat və dilin kəsişməsində özünü reallaşdırır” [5, s.7–8].

Azərbaycan dilinin üslubları dil vasitələrindən məqsədəuyğun və nizamlı şəkildə istifadə edə bilmək tələbatından yaranmışdır. “Dilin üslubiyyatı dilin üslubu quruluşunu – yəni üslublar sistemini həm sinxron, həm də diaxron planda, nitq üslubiyyatı isə nitq üslublarını, yəni əsas janrlar çərçivəsində kompozisiya sistemini, yaxud ictimai nitqin konstruktiv növlərini öyrənir” [3, s.108]. “Dilçiliyin digər sahələrindən fərqli olaraq üslubiyyat ədəbi dilin normalarının həm müstəqil, həm də şərti məqsədəuyğunluq əsasında istifadə edilməsi mümkün olan variantlarını tədqiq edir. Dilin ifadəlilik vasitələrindən məqsədəuyğun surətdə istifadə etmək, normaların pozulması şərtlərini tapıb onların qarşısını almaq üçün yollar göstərmək və müəyyən qrammatik formanın ona xas olmayan vəzifə və mənada işlədilməsinə yol verməmək üslubiyyatın əsas vəzifəsidir” [7, s.108].

Dildə üslubi normaların əsasını mədəni nitqə verilən əsas tələblər təşkil edir. Bu normalar ədəbi dilin normaları ilə bilavasitə bağlıdır. Çünki nitq prosesində ədəbi dil normalarının hər hansı birinin pozulması üslubi normaların pozulmasına səbəb olur.

Üslubi normaların tələblərinə riayət olunması isə kommunikator və respientlər, yazıb oxuyanlar arasında ən münasib dil ünsiyyətinə şərait yaradır. Ona görə də üslubiyyatın bir elm sahəsi kimi öyrənilməsində üslubi normaların, onların əsas ölçü vahidləri olan düzgünlük, dəqiqlik, məntiqilik, estetikliyin mühüm əhəmiyyəti vardır. Çünki ədəbi dil normaları çərçivəsində fəaliyyət göstərən düzgünlük olmasa, ünsiyyətin dəqiqlik, məntiqilik və aydınlıq kimi kommunikativ keyfiyyətləri pozular.

Nitqi üslubi cəhətdən düzgün qurmaq həm də cümlələrin qrammatik normaya uyğun düzgün qurulması, sözlərin düzgün işlədilməsi deməkdir. N.Q.Çernışevskinin sözləri ilə desək, "ifadənin qeyri-dəqiqliyi və dolaşıqlığı, əlbəttə, fikrin dolaşıqlığına təsir göstərir. Dil şüurun ifadə formasıdır; dil düzgün deyildirsə, deməli, şüur da qüsurludur. Əgər nitq səliqəsiz və anlaşılmazdırsa, deməli, orada fikrin özü də qeyri-dəqiqdir" [2, s.374]. Lakin bununla belə, düzgünlük üçün yalnız qrammatik qaydalara əməl etmək kimi tələb qoymaq olmaz. Əslində, ədəbi dilin digər normalarının tələb və şərtlərinə də əməl olunmalıdır. Nitqin düzgünlüyü üçün başlıca şərtlərdən biri də fikrin reallıqla bağlılığı, gerçəkliyi olduğu kimi ifadə etmək səriştəsidir.

Nitqin ilk və əsas şərti olan dəqiqlik gerçəklik və təfəkkürlə əlaqənin, fikrin dil vasitələri ilə düzgün verilməsinin göstəricisidir. Dəqiqlik sözlərin semantikasını, sinonimliyi, çoxmənalılığı, terminləri, müxtəlif funksional üslubları və qrammatik formaları yaxşı bilməklə mümkündür.

Nitq söyləyən obyektiv gerçəkliyi doğru və inandırıcı əks etdirən fikirlər ifadə edə, dediklərini dəlillərlə, sübutlarla və faktlarla əsaslandıra bilirsə, deməli, üslubi normanın məntiqilik tələbinə əməl edir. Elmi informasiyalar məntiqə əsaslandığı üçün məntiqilik nitqin ən mühüm keyfiyyəti hesab olunur. Ümumi cəhətlərinin çoxluğunu nəzərə alsaq, məntiqiliyin dəqiqliklə daha çox bağlı olduğunu deyə bilərik. Dəqiqlik mətnin mənası, nitqin semantik bütövlüyü, məntiqilik isə nitqin semantik strukturu ilə səciyyələnir [1, s.127]. Nitqi üslubi cəhətdən düzgün ifadə etmək üçün məntiqin eyniyyət, ziddiyyət, üçüncünü istisna və yetərli əsas qanunlarını mükəmməl bilmək tələb olunur. Üslubi normanın ölçü vahidlərindən biri olan estetiklik özündə nitqin obrazlılığı, emosional keyfiyyəti və təsirliliyini ehtiva edir.

Üslubi vasitə dedikdə, dilin rəngarəng, zəngin üslubi imkanlara malik olan obrazlı vahidləri və məcazları nəzərdə tutulur. Məcazlarla yanaşı, dildə üslubi keyfiyyəti zənginləşdirmək üçün ən uyğun ifadələri seçmək imkanı verən sinonimlər də çox geniş üslubi imkanlara malikdir. Doğrudan da, seçmə prinsipi üslubiyyatın ən əsas prinsipidir. Sinonimlik dilin bütün üslubi layları üçün xarakterikdir. Frazeologizmlər də üslubi vasitələrə daxildir. Sinonim cərgəni təşkil edən leksik vahidlər içərisində frazeologizm ən ifadəlisi sayıldığından seçmə prosesi zamanı olduqca vacibdir.

*Fənnin tədrisində digər məqsədləri belə ümumiləşdirmək olar:*

- mənadan doğan forma rəngarəngliyinin dilin üslubi imkanları əsasında yarandığını, nitq mədəniyyətinə yiyələnməyin əhəmiyyətini və önəmini öyrətmək;
- danışanın və ya yazanın dil vasitələrindən, onun fonetik, leksik və qrammatik imkanlarından məqsəd və məqama uyğun istifadə edəbilmə tərzini mənimsətmək;
- nitqi mədəni nitqə verilən tələblərə uyğun qurmaq səriştəsini aşılamaq;
- nitq prosesində fonetik hadisə və qanunların rolunu öyrətmək;
- verbal və qeyri-verbal ünsiyyətin əhəmiyyətini, onlardan yerində istifadənin nitqin keyfiyyətinə təsirini göstərmək.

*Ümumi kompetensiyaların məzmunu*

– Fənni digər fənlərlə əlaqələndirməyi bacarmaq, onun təhsil proqramında yeri və rolu haqqında məlumatları, fənnin əsas elmi-praktiki məsələlərinin tətbiqini öyrənmək;
– Kollektivdə işləmək qabiliyyəti;
– Komandada iş, problemin həllinə, ortaq yanaşmaya nail olmaq qabiliyyəti;
– Digər sahələrin mütəxəssisləri ilə ünsiyyət bacarığı;
– Peşəkar fəaliyyətini planlaşdırmaq və təşkil etmək, gələcək təhsilini və mövcud bacarıqlarını təkmilləşdirmək, vaxtı idarə etmək və tapşırıqları vaxtında tamamlamaq qabiliyyəti;
– Bilik və bacarıqlarını inkişaf etdirmək məqsədilə vəziyyəti və özünü yenidən qiymətləndirmək və özünütənqid bacarığı;
– Cəmiyyətdə öz rolunu tənqidi qiymətləndirmək bacarığı (özünü dərketmə kompetensiyası);
– Beynəlxalq arenada işləmək qabiliyyəti;
– Mədəniyyətlərarası dialoqa hazır olmaq;
– Fikrini düzgün və yığcam ifadə etmək;
– Kollektivdə öz həmkarları ilə birgə işləməyi, optimal qərarlar qəbul etməyi bacarmaq, idarəetmə metodlarına yiyələnmək;
– Mürəkkəb problemlərin həlli məqsədilə problemə aid fərqli yanaşmalardan istifadə etmək, sadalanan kompetensiyalar əsasında kompleks və ədalətli qərarların qəbulu bacarığına yiyələnmək.

*Peşə kompetensiyalarının məzmunu*

– İxtisas dilini, onun müxtəlif aspektlərini və funksional üslubları dərindən öyrənmək;
– Dilin spefikası, mahiyyəti və funksiyaları barədə müfəssəl biliyə sahib olmaq;

- Dilin və yazının mənşəyi; dilin funksiyaları; dil və cəmiyyət; dil və mədəniyyət arasında qarşılıqlı əlaqə haqqında ətraflı biliyə sahib olmaq və bu sahələrdə müxtəlif nəzəriyyələri mənimsəmək;
- Struktur dil vahidləri və onların nitq prosesində yerinə yetirdiyi funksiyalarla bağlı bilik əldə etmək;
- Dilşünaslıq sahələrində tətbiq edilən ümumi metod və üsulları mənimsəmək və kiçik həcmli tədqiqatlarda tətbiq edə bilmək;
- Dilçilik elminin nəticələrini praktikaya tətbiqetmə bacarığına yiyələnmək.

*Təhsil Proqramının təlim nəticələri*

- Yüksək yaradıcı və tənqidi təfəkkürə, vətənpərvərliyə, geniş erudisiyaya, sosial-siyasi məsuliyyətə, yazılı və şifahi nitq vərdişlərinə yiyələnmək;
- Emprik və analitik tədqiqat vərdişlərini inkişaf etdirmək; müqayisə, qarşılaşdırma, analiz və sintez kimi elmi-akademik bacarıqlar formalaşdırmaq; sahə işi, məlumatın toplanması, emalı və sistemləşdirilməsi vərdişlərini əldə etmək;
- Dilin müxtəlif funksional üslublarını müvafiq situasiyalarda uğurla tətbiq edə bilmək; dil vərdişlərini praqmatik-kommunikativ, mədəniyyətlərarası ünsiyyət, sosiolinqvistik kompetensiya baxımından istifadə edə bilmək; bütün bunların əsasında konkret dil materialını və mətnin qurulması xüsusiyyətlərini təhlil edə bilmək;
- Dilin tarixi inkişaf mərhələlərini əks etdirən mətnləri ayırd etmək; ədəbi qaynaqlarda müvafiq dövrü əks etdirən dil xüsusiyyətlərini anlamaq və təhlil edə bilmək;
- Dilin sistemini, strukturunu, mahiyyətini, funksiyalarını, eləcə də dil vahidlərinin özəlliklərini anlamaq; bunların elmi izahını verə bilmək; bunları mətn daxilində ayırd etmək və təhlil etmək;
- Bədii təsvir və ifadə vasitələrini mənimsəmək, ayırd edə bilmək, yazılı və şifahi nitq prosesində – lazım gəldiyində və ya verilən tapşırığın bir hissəsi kimi tətbiq edə bilmək.

*“Üslubiyyat və ritorika” fənni üzrə təlim nəticələri*

- Üslubiyyata aid spesifik anlayışları və onların arasındakı fərqləri müəyyənləşdirmək;
- Müxtəlif mətnlərdə və nitqdə istifadə edilən üslubi vasitələri və onların konteksdəki funksiyasını müəyyənləşdirmək, üslubi analizin prinsiplərini təsvir və müzakirə etmək;
- Müvafiq funksional üslublarda mətnlər tərtib edə bilmək üçün uyğun stilistik va-

hidləri seçib tətbiq etməyi bacarmaq;

– Ritorik vasitələrdən istifadə etməklə nitqin məntiqiliyini və inandırıcılığını təmin etmək;
– Gündəlik və peşəkar diskursda istifadə edilən ritorik vasitələri və xüsusiyyətləri müəyyən edə bilmək;
– Öyrənilən dilin ifadəlilik imkanlarını, üslubi kateqoriyaların nitq fəaliyyətində tətbiq metodlarını mənimsəmək, ritorik tələblərə riayət etmək və mədəni nitq qabiliyyəti nümayiş etdirmək.

**Nəticə / Conclusion**

Yuxarıda qeyd olunanlardan belə nəticəyə gəlmək olar ki, istər şifahi, istərsə də yazılı nitq üslubi cəhətdən düzgün qurulmalı, yəni danışarkən elə sözlər seçilməlidir ki, fikir dəqiq və aydın ifadə olunsun. Danışan və ya yazan işlətdiyi hər bir sözün nəzərdə tutulan fikrin ifadəsi üçün nə dərəcədə əhəmiyyətli olmasını nəzərə almalıdır. Həm danışıqda, həm də yazıda hər hansı bir söz öz həqiqi mənasından başqa digər mənalarda da işlədilir. Mənadan doğan forma rəngarəngliyi dilin üslubi imkanları əsasında yaranır ki, bütün bunlar üslubiyyat bəhsində öyrənilir. Azərbaycan dilinin üslubi imkanlarından yerində, ünsiyyətin tələblərinə uyğun istifadə etməyi, ədəbi dilimizin ifadə vasitələrindən konkret şəraitlə bağlı yararlanmağı bacarmalıyıq.

Dil vahidlərinin üslubi keyfiyyətləri müxtəlifdir. Bu keyfiyyətlər dilin fonetikası, leksikası və qrammatikasının imkanları sayəsində yaranır, nitqə üslubi çalarlıq gətirir, onu səlis, çevik, mənalı və kəsərli edir, estetik təsir gücünü artırır. Hər bir şəxs yazılı və şifahi ünsiyyət prosesində üslubi çalarla zəngin, düzgün, dəqiq və ifadəli nitqə malik olmalı, ədəbi tələffüz, vurğu, intonasiya, emosiya və s. məsələlərin nəzərə alınması və onlara əməl olunması qaydalarını bilməlidir. Ali təhsil pilləsində yeni olan “Üslubiyyat və ritorika” fənninin proqramı hazırlanarkən bu məsələlər nəzərə alınmış, natiqlik sənəti və üslubiyyat haqqında anlayışlar, nitq vərdişlərinin aşılanması, natiqlik sənətinin xüsusiyyətləri, natiqin təfəkkür və davranış mədəniyyəti, nitqində obrazlılıq, karyeranın artırılmasında natiqliyin rolu və s. məsələlərin öyrənilməsinə imkan verən mövzulara üstünlük verilmişdir.

Bu fənn tələbələrin istər yazılı, istərsə də şifahi nitqinin inkişafına geniş imkanlar yaradır, Azərbaycan dilinin üslubları və natiqlik sənətinin əsasları haqqında qazanılan bilikləri gələcək fəaliyyətlərində tətbiq etmək bacarığı aşılayır. Proqramın tərkib hissələri məntiqi cəhətdən bir-birini tamamlayır. Sonda verilən əhatəli ədəbiyyat siyahısı proqramdan daha səmərəli istifadə etmək üçün şərait yaradır.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Abdullayev N. (2013). Nitq mədəniyyətinin əsasları. Bakı, Elm və təhsil, s.23.
2. Babayev A. (2015). Azərbaycan dili və nitq mədəniyyəti. Bakı, "Gənclik" nəşriyyatı. 572 s.
3. Bayramov A., Məhərrəmov Z., İsgəndərzadə M. (2015). Azərbaycan dili və nitq mədəniyyəti. Bakı, ULU, s.108.
4. Dəmirçizadə Ə. (1962). Azərbaycan dilinin üslubiyyatı. Bakı, Azərtədrisnəşr, s.22.
5. Hacıyeva N. (2018). Azərbaycan dilinin fonetik üslubiyyatı (fil. ü. f. dok. e. dər. al. üçün təq. ed. dis-nın avtoreferatı). Bakı, s.7–8.
6. Həsənova S. (2005). Nitq mədəniyyəti və üslubiyyat. Bakı, ADPU-nun nəşriyyatı, s.3.
7. Hüseynova N., Musayev N. (2018). Azərbaycan dili və nitq mədəniyyəti. Bakı, Elm və təhsil, s.108.
8. Mustafayeva Q. (2010). Azərbaycan dilinin üslubiyyatı. Bakı, Elm, s.17.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 79–84
doi.org/10.48445/a4109-1873-0238-z

**Q R A M M A T İ K A**

# Müəyyən şəxsli sual cümlələrində qrammatik vasitələr

***Ədalət Abbasov***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, "Azərbaycan dili və onun tədrisi texnologiyası" kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: abbasov-edalat@mail.ru
https://orcid.org/0000-0002-9704-1874

**XÜLASƏ**
Sual cümlələri tarixən müxtəlif üsul və vasitələrlə formalaşmışdır. Onlar nəqli cümlədən sonra kommunikativ-situativ tələbə görə geniş istifadə edilən cümlə növüdür. İntonasiyanın rəngarəngliyi və qrammatik xüsusiyyətlərinin zənginliyi cəhətdən müxtəlif növlərə malik sual cümlələrini bir-biri ilə yaxından bağlı olan üç mühüm əlamətə görə təsnif etmək mümkündür:

1. qrammatik quruluşuna görə.
2. ifadə məqsədinə görə.
3. ümumi xarakterinə görə.

**AÇAR SÖZLƏR**
semantik çoxcəhətlik, suallıq semantikası, qrammatik inteqrasiya, leksik-semantik üsul, əvəzlikli sual cümləsi

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 19.10.2023
qəbul edilib: 28.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 79–84
doi.org/10.48445/a4109-1873-0238-z

GRAMMAR

# Grammatical devices in certain personal interrogative sentences

***Adalat Abbasov***
Doctor of Philosophy in Philology, Associate Professor, Department "Azerbaijani language and technology of its teaching", Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: abbasov-edalat@mail.ru
https://orcid.org/0000-0002-9704-1874

**ABSTRACT**
Interrogative sentences have historically been formed in a variety of ways and means. Interrogative sentence is a type of sentence that is widely used due to the communicative-situational requirement after the transfer sentence. It is possible to classify interrogative sentences of different types in terms of the variety of intonation and the richness of grammatical features according to three important signs that are closely related to each other:

1. according to the grammatical structure.
2. according to the purpose of expression.
3. by its general character.

**KEYWORDS**
semantic diversity, interrogative semantics, grammatical integration, lexical-semantic method, interrogative sentence with a pronoun

**ARTICLE HISTORY**
Received: 19.10.2023
Accepted: 28.11.2023

## Giriş / Introduction

Sual cümlələrinin tarixən necə inkişaf etdiyini (materiallar əsasında) izlədiyimiz zaman məlum olur ki, onlar müxtəlif üsul və ya vasitələrlə ifadə edilmişdir. Azərbaycan dilçiliyində sadə cümlələrin təsnifi bu məsələnin açılmasında böyük önəm daşıyır.

## Əsas hissə / Main part

Yuxarıda qeyd etdiyimiz kimi, sual cümlələri nəqli cümlədən sonra ünsiyyətdə geniş istifadə edilən cümlə növüdür. Bu cümlələr xüsusən də şifahi nitqdə ifadə məqsədinin, əhatə dairəsinin semantik çoxcəhətliyi baxımından və aktivlik dərəcəsinə görə fərqlənir. İntonasiyasının rəngarəngliyi və qrammatik xüsusiyyətlərinin zənginliyi cəhətdən müxtəlif növlərə malik sual cümlələrini bir-biri ilə yaxından bağlı olan üç mühüm əlamətə görə təsnif etmək olar:

1. qrammatik cəhətdən quruluşuna görə.
2. ifadə məqsədinə görə.
3. ümumi xarakterinə görə.

Qarşıya qoyduğumuz məqsədin uğurlu tədqiqinə nail olmaq üçün təsnifatın birinci növü üzrə araşdırmanı daha münasib hesab edirik.

Sadə cümlənin sintaktik modeli həmin cümlələrin (müxtəlif strukturlu sual cümlələrinin) qrammatik struktur (quruluş) xüsusiyyətləri əsasında təşəkkül tapdığı kimi, sual cümlələrinin modal və intonasiya semantikasına məxsus əlamətləri də eyni analoji sintaktik hadisə nəticəsində formalaşaraq təzahür edir.

Sual cümlələrinin qrammatik quruluşu dedikdə, elə bir vasitə nəzərdə tutulmalıdır ki, bu cümlələrin formalaşmasında onlar əsas olsun.

Suallıq semantikası bəzi cümlələrdə öz funksiyasını leksik-semantik, başqa bir sual cümlələrində sintaktik-morfoloji, bəzilərində isə yalnız sintaktik üsulla yerinə yetirir. Sualın leksik-sintaktik üsul ilə ifadəsinə sual əvəzlikləri, sual zərfləri və intonasiya; sintaktik-morfoloji ifadəsinə *-mı*$^{4}$ ədatı və intonasiya; yalnız sintaktik üsul ilə ifadəsinə isə intonasiya aiddir. Azərbaycan dilində sual formalaşdıran bu cür üsullar sual cümləsinin semantik əlvanlığı qədər müxtəlifdir.

Beləliklə, təsnifində mövqeyinə və roluna görə prioritet təşkil edən qrammatik quruluşa əsasən sual cümlələrinin qrammatik vasitələri bunlardır:

1. sual intonasiyası.
2. söz sırası.

Sual cümləsinə məxsus intonasiya bu cümlələrin hər birində müxtəlif formalarda təzahür edir.

“Sözlər, qrammatik kateqoriyalar və intonasiya ünsiyyət vasitəsi üçün nitq prosesində fikir ifadə edən cümlənin ayrı-ayrı komponentləridir. Nitq prosesindəki cümlənin daimi və çox vacib komponentlərindən biri olan intonasiya cümlədən ayrı, müstəqil şəkildə mövcud deyildir. Başqa sözlə, “İntonasiyasız cümlə olmadığı kimi, cümləsiz də intonasiya mövcud deyildir” [3, s.160].

İntonasiyada başqa cümlənin digər qrammatik vasitələrinin hamısı ayrı-ayrılıqda (paralinqvistik elementlər – mimika və jest istisna olmaqla) cümlədən kənar halda mövcud ola bilir. İntonasiya isə cümlədə nitq prosesində məzmun ifadə edərkən özünü göstərir.

Sual cümlələrinin özünəməxsus sual intonasiyası olur. Bu intonasiya onları başqa cümlə növlərindən ayıran əsas vasitədir.

**Sual intonasiyasının köməyi ilə yaranan sual cümlələri**

Bu cümlələrdə sualın mənası ilə bağlı olan söz yüksək tonda tələffüz edilir. İntonasiya istisna olmaqla, burada xüsusi bir qrammatik vasitə iştirak etmir. Məsələn:

Danışmırsan, yoxsa dillər baxışsın?
Gah xəncərdir, gah da mildir baxışın.
Həm öldürür, həm dirildir baxışın,
Nə sehrkar bir cəlladsan, a zalım! [1, s.286]

– De görüm neylədin, oxudun o məktubu?
– Hə... – Şəfəq müəllimə duruxdu. – Oxudum.
– Lap axıracan oxudun? [6, s.161]

Sual cümlələrinin bu növü qrammatik quruluşu cəhətdən nəqli cümlələrə bənzəyir. Şifahi nitqdə məqsədin tələbindən doğan intonasiyanı dəyişməklə bu cür cümlələri nəqli cümlələrə çevirmək mümkündür. Yazılı nitqdə isə bu cümlələrin suallıq məzmununun birbaşa ifadəçisi olan durğu işarəsini – sual işarəsini götürdükdə həmin cümlələr tələffüz edildikdə nəqli cümlələr kimi səslənir. Beləliklə, bu cümlələrin qrammatik inteqrasiyası başqa qrammatik vasitələrin hesabına deyil, yalnız onların intonasiyasının dəyişməsi hesabına yaranır.

**Sual şəkilçilərinin köməyi ilə yaranan sual cümlələri**

Belə cümlələr sintaktik-morfoloji üsulla yaranır. Bu tip sual cümlələrinin formalaşmasında *-mı*$^4$ ədatı və intonasiya əsas vasitə sayılır. *-mı*$^4$ ədatı ilə işlənən sual cümlələrində sualın əsas ifadə vasitəsinin intonasiya olması şübhəsizdir. Belə ki, *-mı*$^4$ şəkilçisi ilə yaranan sual cümlələrində bu ədatı (şəkilçini) işlətmədən də məntiqi vurğu və intonasiyanı dəyişməklə eyni məzmunlu sual əmələ gətirmək mümkündür. Lakin bu

ədatı başqa ədatlar kimi modallıq xatirinə deyil, məhz sual xatirinə və yalnız sual cümlələrində işləndiyi üçün suallığın ifadə vasitələrindən biri hesab etmək zərurəti ortaya çıxır. Məsələn:

Yağır ayrılığın yağışı, qarı,
O görüş, o həsrət isinəcəkmi?
Bir də aramızda bu havaları
İsidən məhəbbət isinəcəkmi? [6, s.285]

Adiləni od götürdü. O, özünü saxlaya bilmədi:

– Axı kiməsə vermisinizmi? Bu yoldaşlar kimdir, axı? Gedib soruşummu? [4, s.160]

Tədqiqat materiallarına əsasən deyə bilərik ki, sual şəkilçiləri sual cümlələrinin xəbərləri ilə işlənir. Bu şəkilçilərin hansı sözlərlə işlənməsi məntiqi vurğudan asılıdır. Cümlədə vurğu hansı sözün üzərinə düşürsə, həmin şəkilçilər də daha çox o sözlərlə işlənir. Sual şəkilçiləri ilə əmələ gələn sual cümlələrində intonasiya ilə əmələ gələn sual cümlələrindən fərqli olaraq xüsusi intonasiyadan istifadə edilmir. Bu cümlələrdə xəbərin son hissəsini uzatmağa da ehtiyac olmur.

**Sual əvəzliklərinin köməyi ilə yaranan sual cümlələri**

Bu növ sual cümlələri leksik-sintaktik üsul ilə formalaşır. Onlar işlənmə dərəcəsinə görə sual cümləsinin digər növlərinə nisbətən daha aktiv və ən geniş yayılmışdır.

Əvəzliyin köməyi ilə yaranan sual cümlələrində cümlə üzvlərindən biri, bəzən də bir neçəsi məlum olmur. Alınacaq cavabla naməlum üzv müəyyənləşdirilir. Bu növ cümlələrdə məntiqi vurğu həmişə sual əvəzliyinin (zərfin) üzərinə düşür. Əvəzliyin köməyi ilə yaranan sual cümlələrində isə ayrı-ayrı sözlərin nə cür ifadə edilməsindən asılı olmayaraq cavab hər dəfə sual əvəzliyi ilə ifadə olunmuş cümlə üzvünə aid olur. Bu sual cümlələrində nə xüsusi sual şəkilçilərindən istifadə edilir, nə də ayrıca sual intonasiyası olur. Bunlar xüsusi sözlərin – sual əvəzliklərinin köməyi ilə əmələ gəlir. Məsələn:

Bu oyunda kim uduzdu, kim uddu,
Peşimanı kim olacaq, nə bilim?.. [1, s.286]

Fərid cırnadı:

– Uşaq niyə oluram? Aramızda cəmi iki yaş fərq var [5, s.50].

"Əvəzlikli sual cümlələri cümlə üzvlərindən müəyyən qisim məlum olmayanda işlənir. Məlum olmayan məfhum belə halda cümlə xaricində olur. Sual həmin məlum olmayan cümlə üzvünə verilir və o, alınacaq cavabla müəyyən edilir. Əvəzlikli sual cümləsinin

işlədilməsində məqsəd həmişə eynidir: danışana məlum olmayan şey və hadisələri, hal, hərəkət və əlamətləri və s. müəyyən etmək” [3, s.59].

**Nəticə / Conclusion**

Nitq mədəniyyətinin formalaşmasında sadə cümlənin digər növləri kimi sual cümləsinin də özünəməxsus mövqeyi vardır. Digər sadə cümlələrlə, xüsusilə nəqli cümlə ilə müqayisədə sual cümləsi aktiv şəkildə işlədilmir. Çünki hər nitq prosesində fikri tam olaraq sual formasında ifadə etmək qeyri-mümkündür. Buna baxmayaraq, fikrin ifadəsində, həmçinin onun müsahibə aydın və dolğun şəkildə çatdırılmasında sual cümləsinin böyük rolu vardır. Bu səbəbdən sual cümləsi nitq mədəniyyətində özünəməxsus mövqeyə malikdir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Abbasov Ə.M. (2017). Sual cümləsinin sintaktik-modal semantikası. “Azərbaycan dili və ədəbiyyat tədrisi” elmi-metodik jurnal, №2. Bakı, s.35–39.
2. Budaqova Z.İ. (1977). Azərbaycan dilində durğu işarələri. Bakı, Elm. 85 s.
3. Kazımov Q. (2010). Müasir Azərbaycan dili, IV hissə. Sintaksis. Bakı, Elm və təhsil. 497 s.
4. Məmmədov İ.T. (2006). Azərbaycan dilinin semantikası. Bakı, Xəzər. 370 s.
5. Məmmədova X.İ., Cavadov Ə.H. (2000). Tabeli mürəkkəb cümlələrin semantik-qrammatik xüsusiyyətləri. Bakı, Mütərcim. 75 s.
6. Kazımov İ., Məşədiyev Q. (2021). Sadə cümlə sintaksisi. Bakı, “Avropa” nəşriyyatı. 223 s.
7. Seyidov Y. (1969). Cümlə – müasir Azərbaycan dili. Sintaksis, II kitab. Bakı, Azərtədrisnəşr. 99 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 85–97
doi.org/10.48445/t6878-9738-9485-v

QRAMMATİKA

# Azərbaycan dilinin qrammatik qanunauyğunluqlarının mənimsədilməsində qrammatik təhlillərin rolu

***Aygün Əliyeva***
Pedaqogika üzrə fəlsəfə doktoru, baş mütəxəssis, Əlavə təhsilin məzmunu şöbəsi, Təhsil İnstitutunun Metodik dəstək və peşəkar inkişaf mərkəzi. Azərbaycan.
E-mail: aliyeva@arti.edu.az
https://orcid.org/0009-0002-4491-8019

**XÜLASƏ**
Məqalədə tədris prosesində Azərbaycan dilinin qrammatik quruluşunun öyrədilməsinin metodik yolları şərh olunmuş, şagirdlərin qrammatikanı şüurlu olaraq mənimsəmələri, düzgün oxu, yazılı və şifahi nitq vərdişlərinə yiyələnmələri üçün Azərbaycan dili məşğələlərinin ümumi sistemində qrammatik təhlilin əhəmiyyəti vurğulanmışdır. Eyni zamanda şagirdlərdə mütəmadi olaraq fonetik hadisələri müşahidə etmək, fonetik təhlillər aparmaq və fonetikaya aid bilikləri tez-tez təkrarlamaq kimi xüsusiyyətləri formalaşdırmaq üçün məşğələlər keçirməyin vacibliyi diqqətə çatdırılmışdır. Morfologiya bölməsinin tədrisi zamanı şagirdlərdə həm düzgün, şüurlu, ifadəli şifahi nitq və oxu vərdişlərinin formalaşması, həm də orfoqrafik vərdişlərin qaydaya salınmasının faydalı olduğu izah olunmuşdur. Sintaksisə aid olan məşğələlərdə sintaktik formaların əhəmiyyəti, üslubi imkanları və nitqdə işlənmə yerləri göstərilmişdir. Məqalədə həmçinin qrammatik təhlillərdən istifadənin şagirdlərin kommunikativ vərdişlərinin formalaşmasına təsiri vurğulanmışdır.

**AÇAR SÖZLƏR**
qrammatik təhlillər,
tədrisin keyfiyyəti,
kommunikativ vərdişlər,
fonetika, morfologiya,
sintaksis

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 03.10.2023
qəbul edilib: 18.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 85–97
doi.org/10.48445/t6878-9738-9485-v

G R A M M A R

# The role of grammatical analyzes in mastering the grammatical patterns of the Azerbaijani language

***Aygun Aliyeva***
Doctor of Philosophy in Pedagogy, Main specialist, Department of the Content of Additional Education, Center of Methodical Support and Improvement of Qualifications of the Institute of Education. Azerbaijan. E-mail: aliyeva@arti.edu.az
https://orcid.org/0009-0002-4491-8019

**ABSTRACT**
The article describes methodological techniques for teaching the grammatical structure of the Azerbaijani language in the learning process, emphasizing the importance of grammatical analysis in the general system of lessons of the Azerbaijani language for students' conscious mastery of grammar, acquisition of correct reading, writing and speaking skills. At the same time, the importance of regularly observing phonetic phenomena, conducting phonetic analyzes and frequently repeating the knowledge related to phonetics is emphasized. During the teaching of the morphology section, it was explained that the formation of correct, conscious, expressive oral speech and reading habits, as well as the regularization of orthographic habits, are useful for students. In the exercises related to syntax, the importance of syntactic forms, stylistic possibilities and places of development in speech are indicated. The article also emphasizes the effect of using grammatical analysis on the formation of students' communicative habits.

**KEYWORDS**
grammar analysis, quality of education, communication skills, phonetics, morphology, syntax

**ARTICLE HISTORY**
Received: 03.10.2023
Accepted: 18.11.2023

## Giriş / Introduction

Azərbaycan təhsil siyasətinin birmənalı şəkildə formalaşması, dünya təhsil sisteminə inteqrasiyası və nüfuzunun yüksəldilməsi Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin adı ilə bağlıdır.

Heydər Əliyevin təhsil sahəsinə diqqət və qayğısı, xüsusilə, Azərbaycan dili təliminin daha yüksək səviyyəyə qaldırılması, dilimizim təmizliyi və dəqiqliyinin qorunması istiqamətində tələbkarlığı hər zaman diqqətəlayiq olmuşdur.

Heydər Əliyev irsinin layiqli davamçısı cənab İlham Əliyevin ana dilimiz haqqında sərəncamları dil məsələsinin taleyüklü olduğunu göstərir. Xalqların öz ana dilinə, onun müstəqilliyinə hörmət və qayğısının artdığı müasir dünyanın nəbzini tutan ölkə başçımızın imzaladığı “Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair” sərəncamında xalqımızın milli qurur mənbəyi və dövlət atributlarından sayılan ana dilimizin bu gününə və sabahkı inkişafına böyük qayğı, məhəbbət hissi ifadə edilir.

Məqalədə məqsəd – Azərbaycan dilinin tədrisində mühüm yer tutan qrammatik materialların öyrənilməsində qrammatik təhlillərin əhəmiyyətini vurğulamaqdır.

## Əsas hissə / Main part

### Orijinal tədqiqatlar

Azərbaycan dilinin orta və ali məktəblərdə tədrisi ilə yanaşı, həmçinin praktik olaraq tətbiqi, hər bir azərbaycanlının bu dildən maksimum dərəcədə yararlanması, onu gündəlik həyatın ayrılmaz hissəsinə çevirməsi gündəmdə duran məsələlərdəndir. Bu günün dil daşıyıcısı bu dildə düzgün, ifadəli danışmağı bacarmalı, qarşısındakı dinləyicini sözünün gücü ilə heyrətləndirməlidir.

Səlis nitqin başlıca xüsusiyyətlərindən biri danışıq üçün lazım olan söz və ifadələrin yerli-yerində işlədilməsidir. Leksik-qrammatik normaları öyrənmədən dilimizin çoxmənalılığına, omonim, sinonim və antonimliyinə, sözün işlənmə dərəcəsinə görə normativliyinə, frazeoloji birləşmələrdən düzgün istifadəsinə nail olmaq, canlı və effektiv ünsiyyət qurmaq mümkün deyil.

Qrammatik normalar və qrammatik kateqoriyaların şüurlu şəkildə mənimsədilməsi rabitəli nitq vərdişlərinin yaradılmasında əsas rola malikdir. Nitq, əsasən, cümlə ilə reallaşdığına görə dilin morfologiyası və onun əsasında formalaşan sintaktik quruluş fikrin ifadəsi üçün birinci vasitə hesab olunur [Abbasova S., Seyidova S., Məmmədova M. Bakı, 2016].

Hər bir dil özünün fonetik sistemi, lüğət tərkibi və qrammatik quruluşu ilə bir dil kimi mövcud olur və bu üç tərkib hissəsinin birgə fəaliyyəti ilə ünsiyyətə xidmət edir. Səslər söz tərkibində birləşdikdə, sözlər qrammatik quruluşun ixtiyarına keçdikdə ünsiyyətin əsas vasitəsi olan dil də təşəkkül tapır.

Dilimizin lüğət tərkibi ilə qrammatik quruluşu vəhdətdə olub, daim bir-birini zənginləşdirməkdədir. Hər bir tamması sözün həm leksik, həm də qrammatik mənası olur. Söz leksik və qrammatik mənaların birliyidir. Məsələn, "çəmən" sözü yaşıl otlarla örtülü kiçik sahəni bildirir. Bu, onun leksik mənasıdır. Eyni zamanda bu söz ad bildirir, konkret isimdir, təkdir, adlıq haldadır. Bunlar isə onun qrammatik mənasıdır.

Azərbaycan dili iltisaqi dillərdəndir. Sözlər arasında əlaqədə şəkilçilərin rolu böyükdür. Ona görə də dilimizdə qrammatik mənaların yaranmasında şəkilçilər xüsusi əhəmiyyətə malikdir. Eyni zamanda qrammatik mənaların yaranmasında vurğunun, intonasiya və köməkçi sözlərin xüsusi rolu var.

Hər bir söz qrammatik formaya malikdir. Sözün qrammatik forması – bu və ya digər sözün bir-birinə qarşı duran qrammatik formalarıdır. Yazıram, yazırsan, yazır, yazırıq, yazırsan, yazırlar, yazarıq, yazarsınız, yazacaqlar və s. "yazmaq" feilinin qrammatik formalarıdır.

Azərbaycan dilinin qrammatik quruluşu çox qədimdir. Dilimizin təşəkkül tarixi qədim olsa da, onun tədqiqi və öyrənilmə tarixi çox qısadır. Uzun müddət Azərbaycan dilinin qrammatik quruluşu məktəb qrammatikası çərçivəsində öyrənilmişdir [Kazımov Q. Bakı, 2014].

Tədris prosesində Azərbaycan dilinin qrammatik quruluşunun mənimsədilməsi müxtəlif metodik yollarla həyata keçirilir. Bu prosesdə tətbiq edilən metodik üsullardan biri də *qrammatik təhlildir*. Şagirdlərin qrammatikanı şüurlu olaraq mənimsəmələri, düzgün oxu, yazılı və şifahi nitq vərdişlərinə yiyələnmələri üçün Azərbaycan dili məşğələlərinin ümumi sistemində qrammatik təhlilin böyük əhəmiyyəti vardır. Qrammatik təhlillər vasitəsi ilə şagirdlər yeni qrammatik məlumatı, qayda və qanunları öyrənirlər.

Azərbaycan dili üzrə aparılan qrammatik təhlillər bütün təlim növləri ilə sıx əlaqədardır. Bu fənnin tədrisi zamanı qrammatik təhlillərin aparılmasına xüsusi diqqət edilməlidir. Çünki qrammatik təhlillər şagirdlərin məntiqi təfəkkürünün inkişafına kömək edir, bu sahədə biliklərini artırır, şifahi və yazılı nitqdən istifadə etmək üçün onlarda möhkəm vərdişlər yaradır. Bu təhlildən yalnız qrammatik qaydaların öyrənilməsində deyil, orfoqrafiya, durğu işarələri, leksika, üslubiyyat üzrə aparılan məşğələlərdə də geniş istifadə edilməlidir. Belə məşğələlər zamanı şagirdlərdə bu

sahələrə aid vərdişlər formalaşır. Təhlillər vasitəsi ilə onlar qrammatikadan aldıqları bilikləri təcrübədə tətbiq edə bilirlər.

Şagirdlər söz və cümlədə ifadə edilən fikri anlamaqda çətinlik çəkdikləri zaman, yaxud onlara bu və ya digər qrammatik formaların mənası və nitqdə işlədilməsi aydın olmadıqda sözlərin mənaca təhlili aparılmalıdır. Lakin təhlil edilən cümlədə bütün sözlərin mənası şagirdlərə aydındırsa, o zaman şagirdlərin diqqətini söz və cümlənin mənasına, oradakı nitq hissələrinə cəlb etməyə ehtiyac yoxdur.

Müəllim şagirdlərə cümlədəki sözlərin əlaqəsini, bir üzvün digərindən asılı olduğunu müəyyənləşdirmək üçün suallar verməyi öyrətməlidir; bunun mövzu ilə əlaqəli qrammatik təhlildə böyük əhəmiyyəti vardır. Şagirdlərin suallar verməsi onlarda müxtəlif fikirlərin meydana çıxmasının ilk əlaməti hesab edilir. Müəllim dərhal bu meylin inkişaf etdirilməsinə çalışmalıdır.

Qrammatik təhlilin böyük təlim əhəmiyyətindən biri də Azərbaycan dilindən keçilmiş materialların təkrarı zamanı ondan istifadə etməkdir. Bu zaman qrammatik təhlilin bütün növlərindən istifadə olunmalıdır [Səfərov M. Bakı, 2016].

Qrammatik təhlillərin məzmununa görə iki növü vardır:

1. Morfoloji təhlil – bu təhlilə sözün quruluşca və nitq hissələrinə görə təhlili daxildir.
2. Sintaktik təhlil – buraya cümlə üzvlərinə görə təhlil daxildir.

Bunlardan əlavə fonetik, leksik və sözün tərkibinə görə təhlil növləri də vardır.

Qrammatik təhlillər həcminə görə geniş və müxtəsər olur. Əgər verilmiş mətnin geniş təhlili nəzərdə tutulursa, o zaman təhlil hərtərəfli aparılır.

Aparılma qaydasına görə təhlil həm şifahi, həm də yazılı şəkildə olur. Şifahi təhlillər daha çox dərs zamanı, yazılı təhlillər isə həm sinifdə, həm də evdə aparıla bilər.

Qrammatik təhlillərdən tez-tez istifadə olunması tədrisin keyfiyyətinin yüksəlməsinə səbəb olur. Azərbaycan dili müəllimi qrammatik təhlillər zamanı çətinlik çəkən şagirdlərlə fərdi qaydada məşğul olmalı, onlarda bu vərdişlərin formalaşmasına nail olmağa çalışmalıdır. Fonetik, morfoloji, sintaktik, habelə qarışıq təhlilləri fərdi məşğələlər formasında da aparmaq olar.

Fonetikanı öyrənmək şagirdlərdə nitq və təfəkkürün inkişafına kömək edir. Bu bəhsi mənimsətmək üçün mütəmadi olaraq fonetik hadisələri müşahidə etmək, təhlillər aparmaq və fonetikaya aid bilikləri tez-tez təkrar etmək kimi xüsusiyyətləri formalaşdırmaq, lüğət və söz yaradıcılığına dair məşğələlər keçirmək, həmin məşğələlərdə fonetikanı morfologiya və lüğət işləri ilə əlaqələndirmək lazımdır.

Bu bəhsin tədrisi şagirdlərdə bir sıra vərdişlər formalaşdırır:

– şifahi nitq və oxu zamanı düzgün tələffüz qaydalarını gözləmək; orfoqrafiyanın

tələblərini gözləməklə düzgün yazılı nitqə yiyələnmək;
- səslərin fiziologiyasını mənimsəyib ikinci dil öyrənərkən onları düzgün tələffüz etməyə alışmaq;
- lüğətlə işləyərkən əlifba sırasından cəld və sərbəst şəkildə istifadə etməyi bacarmaq.

Fonetika – orfoqrafiya və morfologiyanın əsaslı surətdə öyrənilməsi və təhsilalanların düzgün tələffüz qaydalarına yiyələnməsində böyük əhəmiyyət kəsb edir.

Fonetikaya aid məşğələlərdə şagirdlərə izah etmək lazımdır ki, onlar nitqlərində səsləri düzgün işlətməsələr, yaxud yazı yazarkən hərfləri doğru yazmasalar sözün mənası dəyişər. Yalnız bunları öyrəndikdən sonra şagirdlər Azərbaycan dilində fonetika və qrammatikanın nə kimi önəmli yer tutduğunu dərk etmiş olarlar.

Fonetikanın mükəmməl öyrənilməsi orfoqrafiyaya da öz təsirini göstərir. Belə ki, şagirdlər yazı yazarkən yazı qaydalarına düzgün əməl edirlər. Müəllim onlarda yazı bacarıqlarını daha da möhkəmləndirmək üçün daima təkrar dərslərə müraciət etməli, fonetik təhlillər aparmalıdır. Fonetik təhlil üsulu fonetika bəhsində keçilmişlərin bütünlüklə yenidən yada salınması və möhkəmləndirilməsində əsas vasitədir. Təkrar zamanı fonetik təhlillə bərabər qrammatik təhlilin bütün növlərindən də istifadə olunmalıdır.

Dilin öyrənilməsində də fonetik təhlilin böyük praktik əhəmiyyəti vardır. Fonetik təhlil şagirdlərə orfoqrafiya və tələffüz qaydalarını, eləcə də morfologiyanı dərindən mənimsəməkdə kömək edir.

Fonetik təhlillərdən, əsasən, aşağı siniflərdə, sait və samit səslərin xüsusiyyətlərinin və vurğunun müəyyənləşməsində, sözün hərf və hecaya görə təhlilində istifadə olunur.

Fonetik təhlil linqvistik təhlilin növlərindən biri olub, formasına görə yazılı və şifahi, keyfiyyətlərinə görə tam və natamam olur.

*Natamam fonetik təhlil* fonetikanın hər hansı bir mövzusundan, *tam fonetik təhlil* isə bəhsin bütövlükdə tədrisindən sonra aparılır. Məsələn, saitlər və onların növləri mövzularının tədrisindən sonra fonetik cəhətdən natamam təhlil aparıla bilər. Bu zaman ancaq saitlər və onların növləri təhlilə cəlb edilir.

Fonetik təhlil sözlər üzərində aparılır. Sözün tam fonetik təhlilini apararkən bunları bilmək vacibdir:
- sözün səs və hərf tərkibi göstərilir;
- sait səslər növlərinə görə təhlil edilir;

- samit səslər növlərinə görə təhlil edilir;
- sözün hecaları və vurğusu, ahəng qanunu göstərilir.

*QEYD: Təhlil zamanı hərf, ahəng, heca, vurğu yazılışa, səs, sait, samit isə oxunuşa əsasən müəyyən olunur*.

Səslərin növləri üzrə təhlili sözün tələffüz şəkli üzərində aparılır. Ahəng qanunu, heca və vurğu isə onun yazılı forması üzərində aparılır [Əliyeva A., Nəcəfova Z. Bakı, 2010].

Leksikologiyanın əsas tədqiqat obyekti sözdür. O, sözün mənasını müəyyən edir, üslubi aidliyini, mənşəyini öyrənir, sözün uyğun sinonim və antonimini seçir.

Leksik təhlil aşağıdakı qayda üzrə aparılır:

1. Sözün leksik və qrammatik mənası;
2. Sözün həqiqi və məcazi mənası;
3. Çoxmənalı və təkmənalı sözlər;
4. Omonim, sinonim və antonimlər;
5. Ümumişlək sözlər, terminlər, köhnəlmiş sözlər və yeni sözlər;
6. Əsl Azərbaycan sözləri və alınma sözlər;
7. Frazeoloji birləşmələr.

Söz yaradıcılığı bölməsində şagirdlər sözlərin yaranma üsulları ilə tanış olurlar. Sözlər iki əsas üsul vasitəsilə yaranır:

- Leksik şəkilçilərin köməyi ilə yeni düzəltmə sözlərin yaranması (morfoloji yolla); məsələn: qapı-çı (qapıçı); çay-çı (çayçı); ev-dəki (evdəki) və s.
- İki və daha artıq sözün birləşməsi ilə mürəkkəb sözlərin yaranması (sintaktik yolla).

Sözün tərkibinə görə təhlil qaydası belədir:

1. Təhlil olunan sözün hansı nitq hissəsinə aid olduğu göstərilir;
2. Kök və şəkilçilər ayrı-ayrılıqda göstərilir;
3. Sözün başlanğıc forması müəyyən edilir;
4. Əgər sözün başlanğıc forması düzəltmədirsə, onun əmələgəlməsi izah edilir;
5. Sözün qrammatik şəkilçilərindən hər birinin mənası (hansı halı, hansı zamanı və s. bildirməsi) müəyyənləşdirilir.

Sözün tərkibinə görə təhlili həm şifahi, həm də yazılı şəkildə aparıla bilər.

Sözləri tərkibinə görə təhlil etdikdə, ilk növbədə, sözün kökü tapılır. Sözün kökünü tapmaq üçün nələrə diqqət yetirilməlidir? Aşağıdakı nümunəyə nəzər salaq:

1. “Yarış” sözünü təhlil edək. “Yarış” sözünün leksik mənası müsabiqə deməkdir. İsim olan “yar” sözü ilə feil “yar” sözü arasında heç bir yaxınlıq yoxdur. Ona görə də

biz “yarış” sözünün kökünü “yar” kimi götürə bilmərik. Onu o vaxt edə bilərik ki, ümumi söz həmin kökdən yaransın, yəni köklə şəkilçi arasında əlaqə olsun.

Söz həm leksikologiyanın, həm də morfologiyanın tədqiqat obyektinə daxildir. Əgər leksikada tək-tək sözlərin fərdi xüsusiyyətləri, leksik mənası, onun başqa sözlərdən məna fərqi, mənşəyi və s. öyrənilirsə, qrammatikada – morfologiyada sözlərin o qanunauyğunluq və xüsusiyyətləri öyrənilir ki, onlar tək-tək sözlərə deyil, bütöv söz qruplarına və onların dəyişmə sisteminə aid olur. Morfologiyada sözlərin hansı qrammatik formalara düşdüyü, hansı qrammatik mənaları ifadə etdiyi, sözlərin hansı prinsiplər əsasında dəyişdiyi öyrənilir, dəyişmə və təsrif sistemləri üzə çıxarılır, qrammatik kateqoriyalar, onların nitq hissələrinə xidməti müəyyənləşdirilir.

Dilin lüğət tərkibindəki sözlərə morfoloji baxımdan yanaşdıqda aydın olur ki, sözlər əşya, hadisə, əlamət, kəmiyyət, hərəkət və s. adlandırma baxımından müxtəlif qruplara ayrılır, böyük bir qisminin həm leksik, həm də qrammatik mənası vardır. Bunlar insan ünsiyyətinin, fikir mübadiləsinin əsas vasitələridir. Sözlərin kiçik bir qrupu isə leksik mənadan məhrum olub, yalnız qrammatik mənaya malikdir və sözlər arasında əlaqə yaratmağa, modal münasibətləri gücləndirməyə xidmət edir. Bir qrup sözlər də var ki, ümumi və qeyri-müəyyən şəkildə əşya və hadisələri ifadə etməklə yuxarıdakı söz qruplarının əvəzində işlənə bilir. Bunların hamısı insan nitqinin tərkib hissələridir və ona görə də morfologiyada sözlər onların özlərinin verdiyi imkanlar əsasında nitq hissələri üzrə qruplaşdırılıb öyrənilir [3, s.27].

Morfoloji təhlil həm şifahi, həm də yazılı formada aparıla bilər. Bu zaman məşğələni səmərəli təşkil etmək üçün müxtəlif əyani vasitələrdən istifadə edilməlidir.

Morfoloji təhlildə bir qayda olaraq hər bir söz təklikdə təhlil olunur. Bu zaman təhlil olunan sözün (formanın) mənasını və cümlədəki başqa sözlərlə əlaqəsini açan suallar verilməlidir. Məsələn, sifət və ya zərfi təhlil edərkən, mütləq onların hansı sözlərə aid olduğunu və hansı əlamətlər daşıdığı ortaya çıxarılmalıdır. Morfoloji təhlil elə aparılmalıdır ki, təhlil edilən mətnin anlaşılmasına kömək etsin.

Sözləri tərkibinə görə təhlil etdikdə şəkilçilərin həmin sözə verdiyi mənanı aydınlaşdırmaq lazımdır.

Yekun təkrarların aparılması zamanı morfoloji təhlildən istifadə etmək də məqsədəuyğundur. Bu təhlildən dərs ilinin sonunda aşağıdakı şəkildə istifadə olunur: V sinifdə yuxarıda dediyimiz kimi, əsas nitq hissələrinin tədrisi yekunlaşır. “İsim” bəhsinin təkrarı zamanı şagirdlərə ismin təhlil sxemi, eləcə də sifətin, sayın, əvəzliyin, feil və zərfin təhlil sxemləri həmin nitq hissələrinin təhlili və təkrarı zamanı əlaqəli şəkildə yada salınır. Sonra təhlil üçün cümlə seçilir. Tutaq ki, “Köpüklü dalğalar qayalara çırpılırdı” cümləsini morfoloji təhlil etmək lazımdır. Bununla əlaqədar

şagirdləri növbə ilə yazı taxtasında ayrı-ayrı nitq hissələrinin təhlili üzərində işlətmək lazımdır. Əvvəl yazı taxtasına çağırılmış şagird cümləni intonasiya ilə oxuduqdan sonra ilk söz üzrə təhlilə başlayır. Şagirdlər ayrı-ayrı nitq hissələrinə aid bütün xüsusiyyətləri təhlil zamanı bir daha yada salırlar. Sonra təhlilin ikinci variantına müraciət edilir.

Morfoloji təhlil iki yolla aparılır:

1. Sözün quruluşu üzrə təhlil;
2. Nitq hissələrinə görə aparılan təhlil.

Sözün quruluşuna görə təhlil zamanı seçilmiş nümunələr həm çətinliyinə, həm də dilin ümumi quruluşunu anlama əhəmiyyətinə görə müxtəlif ola bilər. Müəllim bu nümunələrdən istifadə etməklə, şagirdlərin sözün quruluşuna aid biliyini tədricən artırmağa çalışmalıdır. Sözün quruluşuna görə təhlili zamanı şagirdlərə aşağıdakı kimi izahat verilir. Məsələn: köpüklü – *köp* və yaxud *köpük* – sözün kökü, -*lü* ‒sözdüzəldici şəkilçidir.

Sözün quruluşuna görə təhlilini sxem üzrə də aparmaq olar.

Nitq hissələrinə görə aparılan təhlildə, mətndə verilən sözlərin qrammatik əlamətləri göstərilir. Morfoloji təhlil zamanı şagirdlər nitq hissəsinin yalnız adını deyil, onun növü və qrammatik əlamətlərini də müəyyən etməlidirlər.

Cümlə sintaksisin mərkəzi vahididir. Cümlənin dildə əhəmiyyəti böyükdür. Dildəki bütün vahidlər səslər, sözlər, söz birləşmələri cümlədə toplanır. Ona görə də cümlə dilin bütün sahələrinin – fonetika, leksikologiya, frazeologiya, morfologiya, sintaksis və üslubiyyatın öyrənilməsi üçün lazım olan bütün faktları verə bilir [Xəlilov B. Bakı, 2017]. Bu anlayışın şagirdlərə düzgün mənimsədilməsi digər sintaktik kateqoriyaların da asan və dəqiq anlaşılmasına müsbət təsir göstərir. Cümlə ‒ şifahi və yazılı nitqdə ünsiyyət və fikir mübadiləsi vasitəsidir. İnsan onu əhatə edən obyektiv aləm haqqında biliklərini, fikirlərini rabitəli nitqin canlı vahidi olan cümlələr vasitəsi ilə həyata keçirir. Bəs orta ümumtəhsil məktəblərində sintaktik məşğələlərin aparılması hansı zəruri amillərlə bağlıdır?

Orta ümumtəhsil məktəblərinin rus bölmələrində Azərbaycan dilinin kommunikativ məqsədlə tədrisi və bu məqsəddən irəli gələn vəzifələrin həyata keçirilməsi şagirdlərə öyrəndikləri dildə ünsiyyət yaratmaq vərdişi və bacarığının aşılanması ilə səciyyələnir. Azərbaycan dilinin tədrisi prosesində əldə edilmiş təcrübə göstərir ki, öyrənilən dil ünsiyyət vasitəsi olmalı və ondan kommunikativ məqsəd üçün istifadə edilməlidir. Azərbaycan dili tədrisinin əsas məqsədi şagirdlərdə linqvistik bacarıqların üzə çıxarılmasına, nitq inkişafına maraq və həvəsin yaradılmasına, onlarda müstəqil düşünmək bacarığı və vərdişlərin aşılanmasına yönəldilməlidir [Səfərov M. Bakı, 2016; Əliyeva A., Nəcəfova Z. Bakı, 2010].

Sintaktik məşğələlərin başlıca məqsədi şagirdlərdə səlis, mənalı, şifahi və yazılı nitq vərdişləri yaratmaqdır. Sintaksis məşğələlərində nitqin dəqiq və ifadəli olmasına, onun söz formaları ilə, cümlələrdə və yazıda durğu işarələri ilə düzgün verilməsinə xüsusi diqqət yetirilməlidir.

Şagirdlərdə ifadəli oxu vərdişlərinin möhkəmləndirilməsində də sintaktik məşğələlərin rolu böyükdür [7, s.77-81].

Orta ümumtəhsil məktəblərində sintaktik bölmənin tədrisinin başlıca məqsədi bir tərəfdən şagirdlərdə mücərrəd təfəkkürü inkişaf etdirmək, digər tərəfdən isə onlarda kommunikativ bacarıqlar formalaşdırmaq və təhlil olunacaq hər hansı bir cümlənin növü, quruluşu və ən incə məna xüsusiyyətləri haqqında ətraflı təsəvvür yaratmaqdır. Bu bacarıqları inkişaf etdirərək formalaşdırmaq üçün bir neçə tələb irəli sürülür:

– Cümlədə sözlərin və mətndə cümlələrin bir-biri ilə birləşməsinin əsas qaydalarını şagirdlərə dərk etdirmək; Bunun üçün dərslik və müəllimin izahı əsas götürülür.
– Sadə mürəkkəb cümlələrdə sözlərin məna əlaqələrini qrammatik qanunlara əsasən izah etmək; Bu zaman qrammatik təhlillərdən istifadə etmək lazımdır.
– Şagirdləri müxtəlif növlü çalışmalar üzərində işlətməklə sözlərin semantik əlaqələrini düzgün dərk etmək və durğu işarələrindən doğru şəkildə istifadə vərdişləri formalaşdırmaq; Dərsdə bu xüsusiyyətlərə xüsusi diqqət yetirilməlidir.

Orta ümumtəhsil məktəblərinin rus bölmələrində Azərbaycan dilinin öyrənilməsi mətnlər vasitəsi ilə həyata keçirilir. Həmin mətnlər həm öyrənilən sintaktik hadisələrə aid misallar seçmək, həm də qrammatik təhlil aparmaq üçün material verir. Verilmiş mətnlərlə qrammatika arasında rabitə şagirdlərin nitqini inkişaf etdirmək məqsədi ilə görülən işlərlə daha çox bağlı olur.

Sintaktik təhlil morfoloji təhlillə birləşdikdə onun praktik dəyəri daha da artır, fənlərlə əlaqə yaranır, şagirdlərin fəallığı yüksəlir. Sintaktik təhlil zamanı bu və ya digər cümlə üzvünün ifadə olunduğu nitq hissəsi ilə əlaqədar müntəzəm sorğunun aparılması iki cəhətdən faydalıdır:

1) cümlə üzvləri ilə nitq hissələri arasındakı fərq aydınlaşdırılır;

2) morfologiya üzrə keçilmiş materiallar müntəzəm olaraq təkrarlanır.

Sintaksisə aid olan məşğələlərdə şagirdlərə sintaktik formaların əhəmiyyəti, onun üslubi imkanları və nitqdə işlənmə yerləri izah edilməlidir. Məktəbdə sintaksis üzrə məşğələ apararkən, həmişə ayrı-ayrı cümlələr üzərində işləmək lazım gəlir. Dərs prosesində bu cür təhlillər aparmaq üçün şagirdlər əvvəlcə cümlə söyləməli, sonra isə sintaktik təhlil aparmalıdırlar. Müəllim onların söylədikləri cümlə üzərində redaktə işi aparmalı və nöqsanları elə oradaca şagirdlərə göstərməlidir. Sintaktik təhlil zamanı uşaqlara cümləni intonasiyaya görə müəyyənləşdirməyi, cümlədə sözlər arasında

əlaqələri düzgün təyin etməyi, baş üzvlər və ikinci dərəcəli üzvləri, söz birləşmələrini, mürəkkəb cümləni təşkil edən sadə cümlələri tapmağı öyrətmək lazımdır.

Sintaktik təhlilə başlamazdan əvvəl müəllim şagirdlərə izah etməlidir ki, bu cür təhlil zamanı sözləri ayrılıqda deyil, cümlə içərisində nəzərdən keçirmək lazımdır. Təhlil üçün şagirdlərin özlərinin tərtib etdikləri cümləni götürmək məsləhətdir. Cümlə qurarkən onlar həm təfəkkür, həm də nitq fəaliyyəti göstərirlər. Təfəkkür dil materialları əsasında formalaşır.

Sintaktik təhlilin iki növü var:

1. Cümlə üzvlərinə görə təhlil;
2. Cümlənin quruluşuna görə təhlil.

Hər iki təhlildə aşağıdakı ümumi olan cəhətləri görmək mümkündür:

– hər iki halda lazım gəldikdə cümlənin alındığı mətnə görə mənası və əhəmiyyəti müəyyən edilir;
– cümlənin növü müəyyən edilərək ona tam xarakteristika verilir.

Sintaktik təhlilin hər iki növündə cümlənin mənası və əhəmiyyəti müəyyən edilir. Cümlənin növü müəyyən edilərək ona tam xarakteristika verilir. Sintaktik təhlillər apararkən şagirdləri onlara tanış olan mətnlərdən götürülmüş ayrı-ayrı cümlələr üzərində işlətmək lazımdır.

Sintaktik təhlil təkrar üçün ayrılan dərs saatlarında da öyrədilir. Təhlilin bu növü, əsasən VI–VIII siniflərdə istifadə olunur. Sintaktik təhlil zamanı da şagirdlər hər hansı bir cümləni yazıb həm şifahi, həm də yazılı izahat aparırlar. Müəllim cümlə üzvlərinə görə təhlilə başlamazdan əvvəl sadə cümlənin ümumi xarakteristikası – seçilmiş cümlənin intonasiyaya görə növləri, müxtəsər və geniş, şəxsli və şəxssiz, bütöv və ya yarımçıq cümlə olduğu haqqında şagirdləri məlumatlandırmalıdır.

Sintaktik təhlilin digər növlərindən də (mürəkkəb cümlənin təhlili) yuxarıdakı formalara uyğun şəkildə istifadə olunur. Ayrı-ayrı siniflərdə təhlilin bu növləri təkrar edilərsə, şagirdlər keçmiş bilikləri daha səmərəli şəkildə qavrayıb möhkəmlətmiş olarlar.

**Sadə cümlənin təhlili**

– Cümlənin quruluşuna görə tipi və ya baş üzvləri göstərilir, onun mənası, hansı nitq hissəsi ilə ifadə olunması müəyyən edilir;
– əvvəlcə mübtəda və xəbərlə, sonra isə bir-biri ilə əlaqəsi olan ikinci dərəcəli üzvlər göstərilir;
– ikinci dərəcəli üzvlərdən hər birinin mənası, hansı suala cavab verməsi, onların hansı üzvü aydınlaşdırması və təhlili üçün ayrılmış cümlədə: tamamlıq, təyin yaxud zərflik olması aydınlaşdırılır;

- ikinci dərəcəli üzvlərin aid olduğu sözlə nə kimi əlaqə forması vardır?
- həmin ikinci dərəcəli üzv hansı nitq hissəsi ilə ifadə olunmuşdur?
- təhlil olunan cümlənin xüsusiləşmiş üzvü varmı? Onların yeri və mənası izah edilir;
- cümlədə söz birləşmələrindən ibarət olan mürəkkəb üzvlər varmı? Hansılardır? Nə üçün onları mürəkkəb cümlə üzvü kimi qəbul etmək lazımdır?

**Mürəkkəb cümlənin təhlili**

Mürəkkəb cümlə təhlil edilərkən onun mənası, əhəmiyyəti və növündən başqa, aşağıdakı cəhətlərinə də diqqət edilməlidir:

1. Mürəkkəb cümlənin tərkibinə daxil olan cümlələrin sayı müəyyən edilir və onlardan hər biri ayrılır;
2. Həmin cümlələr arasındakı məna əlaqələri aydınlaşdırılır;
3. Bu cümlələrdən hər birinə xarakteristika verilir;
4. Onların arasında olan əlaqə formaları göstərilir, sonra budaq və ya baş cümləni bütövlüklə, yaxud onun müəyyən bir sözünü necə izah etməsi, budaq cümlənin baş cümləyə olan münasibəti aydınlaşdırılır;
5. Təhlil olunan cümlədə budaq cümlə varmı? Varsa hansıdır?

Cümləni sintaktik cəhətdən təhlil edərkən, orada morfoloji və bəzən fonetik təhlil aparmaq da lazım gəlir. Lakin məlumdur ki, bunu hər dəfə və həmişə aparmaq olmaz. Deməli, təhlilin növü keçilən dərsin məqsədindən asılıdır. Əgər məqsəd şagirdlərin diqqətini sintaksis ətrafında mərkəzləşdirməkdirsə, burada sintaktik təhlillə kifayətlənmək olar. Lakin cümlə üzvlərinin hansı nitq hissələri ilə ifadə olunmasını müəyyənləşdirmək və onu yaxşı dərk etmək lazım gəldikdə, morfoloji təhlilə də müraciət edilməlidir.

Durğu işarələrinin təhlilinə gəldikdə, bu məsələnin sintaksislə çox yaxın əlaqəsi olduğundan, hər dəfə sintaktik təhlil apararkən onunla birlikdə təhlil olunan cümlədə durğu işarələrinin işlənməsi qaydaları da izah edilməlidir. Durğu işarələrini şagirdlərə mənimsətmək üçün ayrıca seçilmiş cümlələr üzərində təhlillər aparmaq lazımdır.

Azərbaycan dilinin qrammatik quruluşunun mənimsədilməsi prosesində istifadə olunan yollardan biri də fəal təlim metodlarıdır. Sadə və mürəkkəb cümlənin tədrisi zamanı istifadə olunan qrammatik təhlillərdən sonra BİBÖ, Venn diaqramı, Klaster (şaxələndirmə) metodlarının tətbiqi əldə olunan biliyin uzun müddət yadda qalmasına kömək edir [8, s.51-55].

## Nəticə / Conclusion

Bütün bunlar bir daha sübut edir ki, dilimizin leksik-qrammatik normalarını öyrənmək canlı və effektiv ünsiyyət qurmağa kömək edir. Qrammatik normalar və qrammatik kateqoriyaların şüurlu şəkildə mənimsədilməsi rabitəli nitq vərdişləri yaradır. Fonetik təhlil şagirdlərin yazı bacarıqlarını daha da möhkəmləndirir. Morfologiya məşğələləri həm düzgün, şüurlu, ifadəli şifahi nitq və oxu vərdişlərinin formalaşması üçün, həm də orfoqrafik vərdişləri qaydaya salmaqla, şagirdlərdə düzgün qrammatik təhlil vərdişləri formalaşdırır. Sintaksisə aid olan məşğələlərdə şagirdlər sintaktik formaların əhəmiyyətini, onun üslubi imkanları və nitqdə işlənmə yerlərini öyrənirlər. Qrammatik təhlillər Azərbaycan dilinin qrammatik quruluşunu mənimsətməklə bərabər, şagirdlərin kommunikativ vərdişlərinin formalaşmasına, məntiqi təfəkkürünün inkişafına kömək edir, qrammatika ilə bağlı biliklərini artırır, onlarda möhkəm şifahi və yazılı nitqdən istifadə vərdişləri yaradır. Təhlillər vasitəsi ilə şagirdlər qrammatikadan aldıqları bilikləri təcrübədə tətbiq edə bilirlər.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Abbasov A.N. (2008). Heydər Əliyev Azərbaycan təhsili və milli mənəvi dəyərlərimiz haqqında. ARTİ-nin Elmi əsərləri, № 3, s.23-27.
2. Abbasova S., Seyidova S., Məmmədova N., Cavadov Ə. (2016). “Azərbaycan dili və nitq mədəniyyəti”. Bakı, “Bakı Universiteti nəşriyyatı”. 230 s.
3. Kazımov Q. (2014). Müasir Azərbaycan dili. Morfologiya. Bakı, Elm və təhsil. 446 s.
4. Səfərov M. (2016). Azərbaycan dili məsələləri. Bakı, Elm və təhsil. 308 s.
5. Əliyeva A., Nəcəfova Z. (2010). Azərbaycan dili: nəzəriyyə və testlər. Bakı, Mütərcim. 229 s.
6. Xəlilov B. (2017). Müasir Azərbaycan dili. Sintaksis. Bakı, Adiloğlu. 428 s.
7. Əliyeva A.T. (2011). Rabitəli nitqin inkişafında sintaksis üzrə məşğələlərin əhəmiyyəti. Azərbaycan Müəllimlər İnstitutu. “Xəbərlər” elmi-metodiki jurnalı, №1. Bakı, “Müəllim” nəşriyyatı, s.77-81.
8. Əliyeva A.T. (2013). Qrammatik materialların mənimsədilməsində innovasiyalar. “Azərbaycan dili və ədəbiyyat tədrisi”, № 2. Bakı, “N print studiya”, s.51-55.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 98–113
doi.org/10.48445/z2661-8652-2223-l

QRAMMATİKA

# Sanki, elə bil (elə bil ki), guya (guya ki) sözlərinin qrammatik statusu barədə

***Nabatəli Qulamoğlu***
Təhsil eksperti, Dövlət İmtahan Mərkəzi yanında İctimai Şuranın üzvü. Azərbaycan.
E-mail: n_palangov@mail.ru
https://orcid.org/0000-0002-6241-4490

**XÜLASƏ**
Məqalə Azərbaycan dilçiliyində problem sayılan bir məsələyə – sanki, elə bil, guya sözlərində durğu işarələrindən istifadəyə – həsr edilmişdir. Bu həm elmi, həm də didaktik baxımdan mühüm əhəmiyyət kəsb edir. Son zamanlar dərslik və dərs vəsaitlərində başlığa çıxarılmış ifadələr "vergülsüz yazılan modal sözlər" hesab edilir. Məqalədə bu fikrin elmi əsasının olmadığı faktlarla arqumentləşdirilmişdir. Bir tərəfdən Azərbaycan dilində durğu işarələrinə dair elmi ədəbiyyat və dərsliklər geniş təhlil edilmiş, digər tərəfdən həmin yanlış fikrin modal sözlərin fəlsəfəsinə zidd olduğu müxtəlif müstəvidən izah edilmişdir. "Vergülsüz yazılan modal sözlər" ifadəsinin genezisi analiz edilmişdir. Sanki, elə bil, guya modal sözlərinin cümlədə ayrılmaması və fərqləndirilməməsinin səbəbləri müəyyən edilmişdir. Nəhayət, sanki, elə bil, guya modal sözlərinin cümlədə ayrılması və ya fərqləndirilməsinin vacib olduğu diqqətə çatdırılmışdır.

**AÇAR SÖZLƏR**
modal sözlər, sinkretik məna, köməkçi nitq hissələri, durğu işarələri, intonasiya

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 25.10.2023
qəbul edilib: 02.12.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 98–113
doi.org/10.48445/z2661-8652-2223-l

**GRAMMAR**

# About the grammatical status of the words as if, as though, supposedly

***Nabatali Gulamoghlu***
Education expert, Member of the Public Council at the State Examination Center. Azerbaijan. E-mail: n_palangov@mail.ru
https://orcid.org/0000-0002-6241-4490

**ABSTRACT**
The article is devoted to an issue considered a problem in Azerbaijani linguistics – the use of punctuation marks in words as if, as though, supposedly. This is important both from a scientific and didactic point of view. Lately, in textbooks and textbooks, the phrases that have been added to the title are considered "modal words written without commas". The article argues with the facts that this opinion has no scientific basis. On the one hand, the scientific literature and textbooks on punctuation in the Azerbaijani language were widely analyzed, and on the other hand, it was explained from different levels that this wrong idea contradicts the philosophy of modal words. The genesis of the phrase "modal words written without commas" was analyzed. As if, as though, supposedly the reasons why modal words are not separated and differentiated in the sentence have been determined. Finally, it has been pointed out that it is important to separate or distinguish modal words as if, as though, supposedly in a sentence.

**KEYWORDS**
modal words, syncretic meaning, auxiliary parts of speech, punctuation marks, intonation

**ARTICLE HISTORY**
Received: 25.10.2023
Accepted: 02.12.2023

**Giriş / Introduction**

Uzun müddətdir ki, *sanki, elə bil (elə bil ki), guya (guya ki)* sözlərinin qrammatik kimliyi barədə dolaşıq fikirlər hökm sürməkdədir. Dərslikdə modal sözlərin məna qrupları cədvəl şəklində verilmiş, *sanki, elə bil, guya* sözləri bənzətmə və müqayisə bildirən modal sözlər qrupuna aid edilmişdir. Modal sözlərin cümlədə vergül vasitəsilə ayrıldığı da öz əksini tapmışdır. Bütün bunlarla yanaşı, oxuyuruq: "*Sanki, elə bil, guya* sözlərində vergül qoyulmur" [11, s.111]. Eyni yanaşmaya DİM-in vəsaitlərində də rast gəlirik: "*Sanki, elə bil, guya* modal sözlərində vergül qoyulmur" [3, s.183].

**Əsas hissə / Main part**

Biz də "*sanki, elə bil, guya* sözlərində vergül qoyulmur" fikrinin haradan qaynaqlandığını aşkarlamaq məqsədilə xronoloji ardıcıllıqla mövzuya uyğun olan bir neçə elmi-metodik mənbəyə müraciət etməyi vacib saydıq. Həmin sözlərin qrammatik statusunu müəyyən etməkdən ötrü ilk növbədə daxil olduğu köməkçi nitq hissələri sistemini qiymətləndirmək lazımdır. Köməkçi nitq hissələrinin (bu ifadə özü də şərti addır) qrammatik statusu barədə birmənalı fikir yoxdur. Fərqli yanaşmalar türk, rus və Avropanın bir çox dillərində də özünü göstərir. Xüsusilə modal sözlər haqqında bir-birini təkzib edən nəzəriyyələr kifayət qədərdir. Mövcud problemin mahiyyəti modal sözlərin təbiətindən qaynaqlanır. Bu sözlərin qrammatik funksiyası barədə fərqli fikirləri özündə ehtiva edən çoxlu nümunələr gətirmək olar. *Görəsən* sözü izahlı lüğət [5, s.262] və akad. M.Şirəliyevin redaktorluğu ilə çap edilmiş kitabda [15, s.183] ədat kimi təqdim edilir. Q.Kazımov [12, s.385] və M.Hüseynzadə [10, s.162] isə eyni ifadəni modal söz hesab edirlər. Maraqlı daha bir cəhət ondan ibarətdir ki, izahlı lüğətdə *görəsən* sözünün ədat kimi təqdim edilməyinə baxmayaraq, o, vergül vasitəsilə ayrılmış və ya fərqləndirilmişdir. Hansı alimə istinad etməli? Əlbəttə, bu sözdə hibrid əlamət olduğu üçün konkret bir nitq hissəsinə aid etmək çətindir. Məhz fərqli yanaşmalar da bu cəhətdən irəli gəlir. Şəxsi mövqeyimə qalsa, *görəsən* sözündə münasibət bildirməkdən çox ədalıq vardır.

Prof. Ə.Abdullayev yazır: "Dilimizdə elə sözlər vardır ki, ayrıca bir nitq hissəsi adlandırılmır. Bunlar modal sözlərdir. Bunları başqa nitq hissələri ilə qarışdırmamaq məqsədilə, yuxarıdakı ədəbiyyat siyahısında A.Ə.Aslanovun "Müasir Azərbaycan dilində modal sözlər" adlı məqaləsinin oxunması məsləhət görülmüşdür [2, s.4].

Əvvəlcə prof. Ə.Abdullayev tərəfindən tövsiyə edilmiş məqalə ilə tanış olduq.

Burada modal sözlər haqqında dəyərli fikirlər yer almışdır. Belə ki, müəllif modal sözlərin:

a) morfoloji cəhətdən hansı nitq hissəsinə aid olduğunu izah etməyin çətin və mübahisəli olduğunu;
b) Azərbaycan dili ilə müqayisədə rus dilində öyrənilməsinin xeyli əvvəllərə təsadüf etdiyini;
c) Azərbaycan dilinə dair müəllifə qədər yazılmış əsərlərdə ayrıca bəhs şəklində olmamasını;
ç) müxtəlif nitq hissələri arasında paylaşdırılmasını;
d) modallığı ifadə edən vasitələrdən biri olmasını;
e) nə müstəqil, nə də köməkçi söz olmasını;
ə) quruluş etibarilə qruplaşdırılmasını oxucuların diqqətinə çatdırmışdır [4, s.85–87]. Bizim araşdırmamız üçün xüsusi əhəmiyyət kəsb edən isə müəllifin aşağıdakı qeydləridir:
“5. Əslində həqiqət olmayan, lakin həqiqətə bənzədilən bir hadisə, əşya, əlamət, keyfiyyət və s. haqqında müəyyən bir fikri ifadə etmək məqamında işlədilən modal sözlər və modal birləşmələr: *guya*, *guya ki*, *elə bil ki*, *sanki*.
*Guya, Yasəmən anasından ötəri darıxırmış* (Ə.Vəliyev); *Mərdan, sanki, öz əməyinin meyvəsini görürdü* (Mir Cəlal); *Elə bil ki, lap Qıratın nəslindəndir* (S.Rəhimov)” [4, s.88].

Deməli, modal sözlər haqqında ilk mənbədə məlum sözlərin cümlədə ayrılması və fərqləndirilməsi öz əksini tapmışdır.

M.Ə.Hacıyev “Durğu işarələri” adlı məqaləsində cümlə üzvləri ilə əlaqəsi olmayan ara sözlərin vergül vasitəsilə ayrıldığını və ya fərqləndiyini qeyd etmişdir [7, s.9].

Əksər dilçilərimiz rus alimlərinə istinad etmişlər. Professor F.Zeynalov türk dillərində köməkçi nitq hissələri barədə müəyyən oxşarlıqlar tapmağa cəhd etsə də, yenə rus həmkarlarına istinad etmişdir. Məsələn, dilin inkişaf etməsi və bununla bağlı qrammatik kateqoriyaların transformasiyası, köməkçi nitq hissələrinin klassifikasiyası barədə fikirləri akademik V.V.Vinaqradovun düşüncələri ilə üst-üstə düşür. Maraqlı məsələlərdən biri də budur ki, müəllif modal sözləri digər nitq hissələrindən fərqləndirir: “Söylənən fikrə aid müəyyən münasibət ifadə edən modal sözlər digər köməkçi nitq hissələrindən (qoşma, bağlayıcı, ədat) xeyli dərəcədə seçilir” [14, s.76]. Müəllif seçilmə deyərkən modal sözlərdə lüğəvi məna əlamətlərinin olmasını nəzərdə tutur. Əlbəttə, bu faktı inkar etmək olmaz, çünki modal sözlərin çoxu əsas nitq hissələrindən yaranmışdır.

F.Zeynalov tərəfindən söylənilən fərq modal sözlərlə digər nitq hissələrinə aiddir, lakin köməkçi nitq hissələri arasında daha ciddi fərqlər aşkarlamaq o qədər çətin deyil.

Müəllifin araşdırmasından məlum olur ki, türk dilçilik ədəbiyyatında "ədat" termini işlədilsə də, bu termin köməkçi nitq hissələrinin sinonimi kimi qəbul edilir, ədatlar isə ayrı-ayrı nitq hissələri içərisində verilmişdir [14, s.84]. O, eyni vəziyyətin Azərbaycan dilində də olduğunu vurğulayaraq əlavə edir: "Yeri gəlmişkən, Azərbaycan dilçilik ədəbiyyatında ədat və modal sözlərə münasibət də müxtəlifdir. Bəzən modal sözlər qeyd-şərtsiz ayrıca köməkçi nitq hissəsi kimi verilir, bəzən isə onlar ədatların tərkibində səciyyələndirilir" [14, s.85].

Prof. F.Zeynalov da *sanki* və bu tip modal sözlərə münasibət bildirmişdir: "*Sanki* modal sözünə sinonim olan söz və söz birləşmələrindən *zənn et ki, fərz et ki, elə bil ki, tutaq ki, tutalım (ki), guya* və s. qeyd etmək olar: *Tutalım ki, bunların hamısı doğrudur* (M.S.Ordubadi)" [14, s.129].

Əlbəttə, müəllifdən fərqli olaraq, sitatda sıralanmış bütün modal sözlərin eyni məzmun kəsb etdiyini düşünmürük. Onların bir qismində müqayisə, digərində isə fərziyyə vardır. Lakin prof. F.Zeynalova müraciət etməkdə məqsədimiz ayrıdır. Demək istəyirik ki, "*sanki, elə bil, guya* sözlərində vergül qoyulmur" frazası burada da yoxdur.

Dilçi alim R.Rüstəmova istinadən deyə bilərik ki, türk dilçilərindən ədatları köməkçi nitq hissələrinin xüsusi növü kimi təqdim edənlər və ya onları nidalarla birgə öyrənənlər də vardır [Kazımov Q. Bakı, 2007]. O, türk ədəbiyyatında modallığın, demək olar ki, tədqiq edilmədiyini, bu anlayışın geniş təhlilinin rus alimi akademik V.V.Vinoqradov tərəfindən aparıldığını diqqətə çatdırmışdır.

Yuxarıda söylənilənləri ümumiləşdirsək, demək olar: köməkçi nitq hissələrinin təsnifatını aparmaq çox çətindir, çünki onlar bir çox cəhətdən bir-birinə oxşayır. Deməli, modal sözlər haqqında da həmişə yekdil fikir söyləmək mümkün deyil. Səbəbi onunla bağlıdır ki, modal sözlər nitq hissələrinin transformasiyası nəticəsində əmələ gəlmişdir.

Modal sözlərin ayrıca qrammatik kateqoriya kimi müəyyən edilməsi A.A.Potebniyə məxsusdur. O, modal sözlərin ara cümlələrdən yarandığını sübut etmişdir. "Ara sözlər" termini modal sözlərin mahiyyətini açmır" ideyasını da məhz A.A.Potebni irəli sürmüşdür [Потебня А. Москва, 1941]. Şübhə yoxdur ki, hər bir dilin öz inkişaf tarixi vardır. Dil kateqoriyaları da bütün dillərdə vahid sxem üzrə inkişaf etmir. Azərbaycan dilində *aydındır, görünür, demək olar ki, az qalırdı, elə gəldi ki, doğrudur, gərəkdir* və s. bu kimi modal sözlərin ara cümlələrdən yarandığını dilçi alimlərimiz Ə.Abdullayev [1, s.114] və Q.Kazımov [12, s.255] tədqiq etmişlər. Professor Q.Kazımov qeyd edir ki, bu cür modal sözlər hələ də müəyyən dərəcədə baş cümlə mövqeyini qoruyub saxlaya bilir.

Modal sözlərin nitq hissələrindən yaranması təkamül prosesinin nəticəsidir. Dilçi alimlərimizin bu cür yanaşması da sübut edir ki, ara sözlər dilin inkişafı prosesində əldə olunan təbii "emal" hadisəsidir (hələ məsdər, feili sifət, feili bağlama kimi hibrid qrammatik kateqoriyalar barədə söz açmırıq). Modal sözləri müəyyən etməyin çətinliklərindən biri də bununla bağlıdır. Həyati misallarla da dediklərimizi isbat etmək olar. Deyək ki, alma və armudun peyvənd olunmuş məhsuluna hansı ad vermək olar? Bu məhsulda həm almaya, həm də armuda bənzər əlamətlər vardır. "Hibrid meyvədə hansının payı daha çoxdur?" sualına cavab vermək olmur – bunu ölçən indikator mövcud deyil. İstənilən canlı hibriddir, yəni o həm atanın, həm də ananın gen daşıyıcısıdır. Baxmayaraq ki, ana genotipdir, hər bir canlıda bəzən ananın, bəzən də atanın geni dominant rol oynayır. Məhz bəzi köməkçi nitq hissələrində "gen"lərin rəqabəti hiss olunur. Modal sözlərin müəyyənləşdirilməsində ikinci çətinlik də buradan doğur. Akademik V.V.Vinoqradov rus dilində modal sözlərin əsasən zərflərdən yarandığını iddia edir. Azərbaycan dilində də eyni ifadə, kontekstdən asılı olaraq, həm modal söz, həm də zərflər kateqoriyasına aid ola bilir.

Yuxarıda qeyd edilmiş çətinliklər (köməkçi nitq hissələrinin klassifikasiyası, modallığın ümumi kateqoriya olması, bir çox hallarda modal sözlərlə ədatlar arasındakı sərhədin qeyri-müəyyənliyi) adlı-sanlı dilçi alimlərimizin yanaşmalarında qeyri-dəqiqliyin yaranmasına səbəb olmuş faktorlardır. Prof. Ə.Abdulayev *indi* sözünü modal sözlər cərgəsinə aid edir, halbuki həmin sözün ədat (və ya zərf) olması heç bir şübhə doğurmur. M.Hüseynzadə modal sözlərin təsnifatına cümlədə ifadə olunan fikrə qarşı emosional münasibət (hayıf ki, qəribədir, təəssüf ki, demə) bildirənləri daxil edir. Belə bir mövqeni professor N.S.Valqinanın da təsnifatında görürük: ara sözlər məlumatın emosional qiymətini verə bilər: *xoşbəxtlikdən*, *bədbəxtlikdən*, *təəccübümə rəğmən* və s. [20, s.249]. S.M.Kolesnikovanın araşdırmaları ilə tanış olarkən görürük ki, hətta köməkçi nitq hissələrinin tədqiqi sahəsində xüsusi xidmətləri olan V.V.Vinoqradov *sadəcə* sözünü emosional-ekspressiv, *təqribən* sözünü isə miqdar ədatları sırasına aid edir [17, s.65–72].

Tanınmış rus alimi D.E.Rozental da öz təsnifatında nitqə modallıq çaları gətirən ədatları sıralamışdır [21, s.220]. Yuxarıda göstərilən sözlərin hər biri modal sözlər cərgəsinə aiddir. Amma sirr deyil ki, modal sözlər münasibət ifadə edir, emosionallıq isə ədatlara xas əlamətdir.

S.M.Kolesnikova qeyd edir ki, M.A.Telenkova da öz təsnifatında modal ədatlara xüsusi yer ayırmışdır [18, s.69].

Artıq tam əminlik yaranır ki, modal sözlərlə ədatların yaxınlığı öz təsdiqini tapır. Modal sözlərin müəyyən edilməsində subyektiv və obyektiv modallıq arasındakı fərqin

də mühüm əhəmiyyəti vardır.

Əlbəttə, dil mübahisələr sistemidir. Hesab edirik, obyektiv və subyektiv modallıq bəzi dilçilər üçün ilk baxışda xəyali görünə bilər. Məlumdur ki, obyektiv modallıq bizim iradəmizdən asılı olmayaraq, istənilən hökmdə mövcuddur. Obyektiv modallıq üzərində tədqiqat işi aparan dilçi alimlər onların geniş təsnifatını nümunələr əsasında vermişlər. Məlumdur ki, obyektiv modallıq məntiq elminin, subyektiv modallıq isə qrammatikanın obyektidir. Əksər dilçi alimlər modallığı cümləni təyin edən xüsusiyyətlərdən biri kimi təqdim edirlər. Bu cür qiymətləndirmə məhz obyektiv modallıq sayılır. "Belə ki, cümlə gerçəkliyi ictimai şüurda praktik şəkildə əks etdirərək, təbii ki, nitqin məzmununun gerçəkliyə münasibətini bildirir" [17, s.55]. Danışanın gerçəkliyə münasibətini isə subyektiv modallıq adlandırırlar. Buradan da bəzi mütəxəssislər belə nəticə çıxarırlar ki, subyektiv qiymətləndirmə varsa, deməli, o, obyektiv deyil. Əlbəttə, bütün bu mübahisələr məntiqi dartışmalardır. Hesab edirik ki, belə mübahisə əsassızdır, ən azı ona görə ki, subyektiv qiymətləndirməni gerçəkliyi olduğu kimi dəyərləndirmək imkanından məhrum edir. Bütün elmlər gerçəkliyi subyektiv qiymətləndirmə vasitəsilə təqdim edir.

Rus dilçilik ədəbiyyatında modallıq və onun ifadə vasitələri haqqında kifayət qədər elmi əsərlər yazılmışdır. Bu barədə A.Peşkovski, A.Şahmatov, A.Potebnya, V.V.Vinoqradov və digər alimlərin əsərlərində lazımi məlumatlara rast gəlirik. Dilçi alimlər həm də modallığın feilin şəkilləri vasitəsilə ifadə olunmasına da diqqət yetirmişlər. Hesab edirik ki, Azərbaycan dilində feilin müxtəlif kateqoriyalarında modallığı ifadə etmək imkanları genişdir, lakin mövzudan kənara çıxmamaq üçün bircə nümunə ilə kifayətlənməyi doğru hesab edirik.

– *Dünən belə bir kitab almışam.*

– *Mənə də alardın.*

İkinci replikada təəssüf hissinin feilin qeyri-qəti gələcək + idi hissəciyinin köməyi vasitəsilə ifadə olunduğu aydın görünür. Beləliklə, modallıq ümumi anlayışdır. Onu təkcə modal sözlərin adına yazmaq doğru deyil. Bütün bunları nəzərə alan V.Vinoqradov yazır: "Lakin rus dilində sintaktik modallıq kateqoriyasını ifadə etmək üçün ayrıca leksik-semantik qrup təşkil edən sözlər vardır" [17, s.1]. Akademik fikrini davam edərək göstərir ki, "cümlə və onun hissələrinin reallığa münasibətini bir çox sözlər, hətta ara söz birləşmələri ifadə edə bilir. Onlar cümlədəki modallığın qrammatik ifadəçisi ola bilər" [orada].

Deyək ki, modal sözlərlə feillər arasında keçid prosesini görmək o qədər də çətin deyil. Müasir dilimizdə "üstəlik" sözü modallıq mənasında da işlənə bilir. Nümunə: *Dediklərimi elə, haqqını alacaqsan (,) üstəlik (,) məndən köklü bir qonaqlıq.*

Vaxtilə insanlar odunu meşədən daşımaq üçün heyvanlardan istifadə etmişlər. Uzunluğu təqribən 60 sm olan odunları tayçalara (elastik budaqdan düzəldilmiş oval alət) yığmış və iki tayçanı heyvanın (at, eşşək, öküz) üstündən asmışlar. Tayçalar arasında qalan məsafəni də odunla doldurmuşlar. Həmin hissə "üstəlik" adlanır. Meşəətrafı kəndlərdə bu söz indi də aktiv işlənməkdədir, halbuki lüğətdə dialektizm hesab edilir. Deməli, vaxtilə isim (Azərbaycan dilinin izahlı lüğəti, 1-ci nəşr) olmuş söz tarixi proses nəticəsində öz funksiyasını dəyişmişdir.

1. *Dediklərimi elə, haqqını alacaqsan, hətta (üstəlik) məndən köklü bir qonaqlıq.*
2. *Dediklərimi elə, haqqını alacaqsan, hələ (üstəlik) məndən köklü bir qonaqlıq.*

Birinci cümlədə *üstəlik* sözünü *hətta*, ikincidə isə *hələ* ifadəsi ilə əvəzlədik. Cümlənin məzmununa heç bir xələl gəlmədi. Eyni söz leksik çalarların rəngarəngliyi nəticəsində birinci cümlədə bağlayıcı, ikincidə isə ədat rolunu oynadı. Onu da deyək ki, bu söz elmi ədəbiyyatda zərf kimi də qiymətləndirilir.

A.Potebnyanın modal sözləri qrammatik kateqoriya kimi kəşf etməsi dilçi alimlər üçün yeni yaradıcılıq pəncərəsi açmışdır. V.V.Vinoqradov bütün sözləri leksik mənasından asılı olaraq, "əsas struktur-semantik" tiplərə bölmüşdür: 1) nitq hissələri (əsas nitq hissələri); 2) nitqin hissəcikləri (köməkçi sözlər); 3) modal sözlər və ədatlar; 4) nidalar. Bu təsnifatda əsas yeri modal sözlər tutur.

Göründüyü kimi, təsnifatda modal sözlər və ədatlar vahid qrupda birləşdirilmişdir. Bu da ondan xəbər verir ki, həm modal sözlərdə, həm də ədatlarda oxşar əlamətlər vardır.

Yuxarıda qeyd etdiklərimizdən belə nəticə hasil olur: subyektiv modallıq ümumi anlayışdır. Onun ifadə vasitələri genişdir. Subyektiv modallıq modal sözlər, ədatlar, feilin müxtəlif kateqoriyaları və digər leksik-semantik qruplar vasitəsilə ifadə oluna bilər.

Uzun illərin sınağından çıxmış "Azərbaycan dilinin izahlı lüğəti"ndə *sanki* sözü bağlayıcı kimi xarakterizə edilir [5, s.35]. Dərslik və dərs vəsaitlərindəki izahlarla izahlı lüğət arasındakı müxtəliflik haradan yaranıb? Yenə də yollar rus dilinə aparıb çıxarır. Məlum söz (*словно, как будто)* rus dilində, kontekstdən asılı olaraq, ya bağlayıcı, ya da ədat kimi xarakterizə edilir.

1. *Время усмиряет его нежность, словно пламя спички на мосту гасит красоту* (Б.Окуджава).
2. *...Она вдруг закружилась и на глазах у всех словно юркнула в землю* (Н.Тэффи).

1 və 2-ci cümlələrdə verilmiş *sanki* sözlərinin fərqini müəyyən etmək o qədər də çətin deyil.

a) birinci cümlədə həmin sözdən sonra fasilə vermək mümkün olduğu halda, ikinci cümlədə bunu etmək olmur. Apardığımız müşahidələr göstərir ki, *sanki* sözü feilə nə qədər yaxındırsa, fasilə bir o qədər azalır, əksinə, feildən nə qədər uzaqda yerləşirsə, fasilə vermək üçün şərait yaranır.

b) bağlayıcıdan fərqli olaraq, ədat sadə və mürəkkəb cümlədə əlaqələndirici həlqə deyil, o, cümləyə yalnız əlavə məna çaları verir.

3. Birinci cümlədə müqayisə olunan tərəfləri bağlayıcı bir-biri ilə əlaqələndirir. 2-ci cümlədə isə müqayisə gizli aparılır, metaforik şəkildə.

Deməli, həmin söz cümlədə fərqləndirilmir.

Müşahidələrimiz göstərir ki, əksər dilçilər *sanki* sözü ilə bağlı fikir söyləməkdən yan keçmişlər. Hələ B.Əhmədov və A.Axundovun "Türk dili" (6-cı sinif) kitabında modal sözlərin təsnifatı verilmiş, *sanki* və bu tipli sözlər müqayisə bildirən modal sözlər sırasına daxil edilmişdir. Eyni zamanda müəlliflər modal sözlərdə durğu işarələrindən istifadə qaydalarını izah etmişlər, lakin *sanki, elə bil, guya* sözlərinin durğu işarələrinə münasibəti barədə heç bir məlumat verməmişlər. Hətta şagirdlər üçün verilmiş tapşırıqlar içərisində həmin sözlərə rast gəlmirik [6, s.126–128]. Güman edirik ki, belə ehtiyatkarlıq həmin sözün əksər bədii nümunələrdə vergülsüz yazılması ilə bağlıdır. Əgər bütün ədiblər *sanki* sözünü cümlədə fərqləndirməmişlərsə, dilçi alimlər də "el haraya, mən də oraya" prinsipini özləri üçün yetərli saymışlar. Düşüncələrimi bölüşdüyüm bir çox dilçilərin fikrincə, ilk dəfə "*sanki, elə bil, guya* sözlərində vergül qoyulmur" frazası DİM-də qeydə alınmışdır. Axtarışlarımız da bu fikri təsdiqləyir. TQDK-nın 2010-cu ildə nəşr edilmiş dərs vəsaitində həmin istisna yer almış, 2015-ci ilin vəsaitində isə çıxarılmış, sonra yenidən dövriyyəyə buraxılmışdır ("Abituriyent" jurnalı). Məhz bundan sonra "vergülsüz yazılan modal söz" anlayışı dərslik və dərs vəsaitlərinə keçmişdir. Yeri gəlmişkən, biz yuxarıda *axı* ədatının modal söz kimi yayılmasının səbəbini izah etdik. Dərslik müəllifləri fikirlərini bununla əsaslandırırlar ki, həmin sözlərdə intonasiya yoxdur. Əlbəttə, belə düşünənlər ona görə haqlıdırlar ki, həmin sözlərdə ədatlara xas olan əlamətlər daha çox təzahür edir, lakin ona görə haqsızdırlar ki, bəzi dilçilər intonasiya ilə durğu işarəsi arasındakı münasibəti lazımi səviyyədə qiymətləndirə bilmirlər. Söhbət cümlədə intonasiyanın rolunu düzgün başa düşməkdən gedir.

Biz köməkçi sözlərin kateqoriyalara bölünməsində qeyri-müəyyənliyin olduğunu qeyd etmişik. Məhz modal sözlərlə ədatlar arasındakı sərhədi dəqiq müəyyən etmək mümkün olmadığı üçün V.V.Vinoqradov "modal ədatlar" kateqoriyasına diqqət cəlb etməyi vacib hesab etmişdir [17, s.9]. Hətta onların təsnifatını aparmışdır.

"Modal ədatların dördüncü qrupu əvəzliklərlə birləşərək ...omonim bağlayıcılarla

eynicinsli olur [17, s.28]. Forma etibarilə fərqli olsa da, Azərbaycan dilindəki *sanki*, *elə bil* modal sözləri ilə eyni funksiya daşıyır. “Modal ədatlar ədatların digər növlərindən onunla fərqlənir ki, onlar əksər hallarda hər hansı bir konkret sözə deyil, bütöv cümləyə aid olur” [17, s.28].

Modal sözlərin təsnifatı da müxtəlif dillərdə fərqli şəkildə verilmişdir. V.Vinoqradov modal sözlərin rus dilində yeddi, R.Rüstəmov isə türk dilində altı tipini müəyyən etmişlər [16, s.84]. Hətta dilçi alimlərimiz Azərbaycan dilində bir-birindən fərqli təsnifat aparmışlar. Başqa bir nümunə: V.V.Vinoqradovdan fərqli olaraq, N.S.Valqina modal sözlərin səkkiz tipini müəyyən etmişdir. Bütün bunları diqqətə çatdırmaqda məqsəd birdir: modal sözlər öz struktur-semantik təbiətinə görə mürəkkəbdir, onlar haqqında təkzibolunmaz fikir söyləmək çox çətindir.

Akademik İ.İ.Meşaninova yazır: “Modal sözlərlə birlikdə çoxlu sayda modal ədatlar vardır. Modal sözlər və modal ədatlar arasında sərhəd xeyli hərəki xarakter daşıyır. Bir çox modal ədatlar sözlərin semantik cəhətdən “quruması” və əşyalıq mənasını itirməsi nəticəsində baş vermişdir. Modal ədatlar digər növ ədatlardan onunla fərqlənir ki, onlar çox zaman ayrıca götürülmüş bir sözə deyil, bütöv cümləyə aid olur” [19, s.289]. İ.İ.Meşaninovdan verilmiş nümunələr də (*мол, дескать*) məhz *guya* sözü ilə tam, *sanki, elə bil* sözləri ilə nisbi ekvivalentdir.

Akademik İ.İ.Meşaninov modal sözlərin sinfi tərkibini müəyyən qrammatik çərçivə əsasında məhdudlaşdırmağın vacib olduğunu qeyd etmişdir. “Nitq hissələrinin bu cür ayrılmış xüsusi hissəsinə aid ara (modal) sözlərin cərgəsinə yalnız elə sözləri qoşmaq lazımdır ki, həmin sözlər ara sözdə subyektiv qiymətləndirmə rolunda çıxış etsin və bu üzvə bağlı olsun” [19, s.290]. Müəllif onların xarici cəhətdən formasının dəyişməz olduğunu diqqətə çatdırmışdır. V.Vinoqradov modal sözlər və ədatları birlikdə məna növlərinə bölür [17, s.5]. Müəllifin qeyd etdiyi altı əlamətdən biri bizim yazının məqsədinə uyğun gəlir. Belə ki, akademikə görə, modal sözlər bəzən ayrı-ayrı sözlərə haqq qazandırır, onları motivasiya edir, bütün bu hallarda modal sözlər digər ifadə elementləri ilə müqayisədə ayrı müstəvidə nəzərə çarpır, bir çox hallarda ədatlara yaxınlaşır.

Problemin mahiyyəti üçün mühüm əhəmiyyət kəsb edən yanaşmalardan biri də C.M.Kolesnikovaya məxsusdur. Müəllif, akad. V.V.Vinoqradovun ədatları “yarımqrammatik-hibrid, yarımleksik tip” adlandırması nəzəriyyəsini inkişaf etdirərək modal ədatların geniş təsnifatını verməklə onların ifadə etdiyi mənaları göstərərək yazır:

4) müqayisə bildirənlər: *guya (будто), guya ki (как будто), elə bil (как бы), sanki (словно)…* [18, s.70].

Məhz bütün bu araşdırmaların nəticəsidir ki, rus dilində *sanki* sözü, kontekstdən asılı olaraq, ya müqayisə bağlayıcısı, ya da müqayisə ədatı kimi götürülür. Bu səbəbdən *sanki* sözünün izahlı lüğətdə bağlayıcı kimi verilməsi heç də səbəbsiz deyil. Təəssüf ki, verilmiş nümunələr *sanki* sözünü bağlayıcı kimi təqdim edə bilmir. Məsələn:

*Ana ürəyindən sanki bir tel qırıldı* (M.Rzaquluzadə).

*Rüstəm kişi rayon mərkəzinə gəlib çatanda, sanki sinəsində iyirmi yaşlı bir cavanın ürəyi döyünürdü* (M.İbrahimov) [5, s.35].

Biz öz nümunələrimizi təqdim edir və bunları qaydaya uyğun hesab edirik:

1. *Sonra o özünü geriyə çəkdi, sanki ilan udmaq istəyən kirpi qınına çəkildi* (S.Rəhimov).
2. *Əkrəm yerində mıxlanıb qaldı, sanki daş-divar, yer, göy başına fırlandı* (İ.Əfəndiyev).

Çox aydın şəkildə görünür ki, *sanki* sözü mürəkkəb cümlənin komponentləri arasında müqayisə aparır.

Beləliklə, biz hesab edirik ki:

1. Əvvəla, məlum sözlərdə ədat çaları olduğunu inkar etmək mümkün deyildir. Onlara "modal ədatlar" desək, daha doğru olar. Lakin orta məktəb dərsliklərində belə dərinlikləri şagirdlərə izah etmək çətindir, ya "ədat", ya da "modal sözlər" terminindən istifadə etmək uyğundur.
2. Məlum ifadələr modal söz hesab olunursa, mütləq vergül vasitəsilə fərqləndirilməlidir. Vergül qoyulmursa, deməli, ədatdır. Yanlış qrammatik ümumiləşdirmə elmi ictimaiyyəti çıxılmaz vəziyyətə salıb. Həmin sözləri vergül vasitəsilə fərqləndirsək də, fərqləndirməsək də, doğru deyil. "Ədat" desək, yetmiş il ərzində daşlaşmış qaydanı yaddaşdan silmək çətindir, "modal söz" desək, kateqorial uyğunsuzluq yaranır.
3. Müəlliflər iddia edirlər ki, bu sözlərdə fasilə yoxdur. Fasilənin olmaması məhz həmin sözlərin ədata yaxınlığından xəbər verir. Digər tərəfdən, durğu işarəsi yalnız o halda fasiləyə əsaslanaraq qoyulur ki, cümlənin məzmununda fərqli məna yaranma ehtimalı olsun. Biz ikinci monoqrafiyamızda intonasiya və durğu işarələri arasındakı beş münasibəti təhlil etmişik. Bu hallardan biri də belədir: intonasiya yoxdur, lakin durğu işarəsi qoyulur.

Bu sözlərdə fasilə olmadığını iddia etmək yox, fasilənin sabit olmadığını qabartmaq ağlabatandır. İki cümləni müqayisə edək:

A. *Ovunun üstünə şığıyan pələng, sanki uçurdu.*

B. *Qaraşın fikrinə dəhşətli bir şey gəldi: sanki, yuxu ölümün kölgəsi idi və Mayanın üstünü almışdı* (M.İbrahimov).

Bu nitqin tələbidir: sözlər əsas feilə yaxın olduqca fasilə azalır. İntonasiya yoxdur deyə vergül qoymamaq olmaz, çünki məqsədimiz dil vahidini (konkret, modal sözü) ayırmaq və ya fərqləndirməkdir.

4. "Vergülsüz yazılan modal söz" ifadəsi modal sözlərin fəlsəfəsinə ziddir. Modal sözlərdə vergül qoymamaq onların:

a) cümlə üzvü olduğunu qəbul etmək;

b) cümlə üzvləri ilə sintaktik əlaqədə olduğunu iddia etmək;

c) nəhayət, hər hansı bir cümlə üzvünü ifadə etdiyini təsdiqləməkdir.

5. Bir-biri ilə ekvivalent olan bu üç modal sözdən başqa, vergülsüz yazılan modal söz yoxdur, çünki belə bir fikir absurddur.

6. Bəs nə üçün *elə bil ki*, *guya ki* ifadələri fərqləndirilir, axı bu sözlərdəki *ki* bağlayıcı deyil, ədatdır [13, s.256].

7. *Sanki, elə bil, guya modal* sözlərinin cümlədə vergül vasitəsilə ayrılması və ya fərqləndirilməsi böyük didaktik əhəmiyyətə malikdir: şagirdlərin yaddaşı daha bir istisna yükündən azad olar.

Professor Ə.Abdullayev *sanki* və *elə bil* sözlərinə ekvivalent kimi sayılan *guya* sözünü fikrin gerçəklik dərəcəsini göstərən ara söz hesab edir [1, s.216].

Tanınmış alimlərdən M.Hüseynzadə və Q.Kazımov *sanki* sözünü modal söz hesab edirlər. Həmin sözün *elə bil ki* modal sözü ilə ekvivalent olması da dilçi alimlərin dediyini təsdiqləyir. Sual meydana çıxır: modal sözdürsə, niyə vergül vasitəsilə fərqləndirilmir? Ola bilər ki, kim isə bu sözü istisna hal kimi hesab etsin, lakin istisna hal bütün sahələri əhatə etmir, xüsusilə modal sözlərin qrammatik funksiyasına ziddir. Beləliklə, ya *sanki* modal söz deyil, ya da modal sözdürsə, vergül vasitəsilə cümlədə ayrılmalı və ya fərqləndirilməlidir. Əslində, üçüncü bir variant da vardır: *sanki* sözünün qrammatik təbiətində ikilik vardır. Biz məhz bu versiya üzərində dayanmağa üstünlük vermək fikrindəyik, çünki bunun üçün daha ciddi əsaslar vardır. İstənilən situasiyada *sanki* və *elə bil ki* sözləri bir-birini əvəz edir, lakin *guya* sözünün məlum ekvivalentlər qrupuna daxil olması bir o qədər də real görünmür. Belə ki, bu sözün semantikasında ədalıq daha çoxdur. Düzdür, *guya* sözünün *sanki* və *elə bil* sözləri ilə mənaca kəsişdiyi anın olmadığını iddia etmək mümkün deyil. Aşağıdakı dialoqa diqqət edək:

– *Niyə uşaqlarla dalaşmısan?!*

– *Harada?*

– *Sanki (guya, elə bil) bilmirsən!*

Başqa bir nümunəyə baxaq:

*Əyilib yerdə nəsə axtarırdı, bu saat nəsə tapacaqdı sanki* (K.Böyükçöl).

Aydın görünür ki, dialoqdakı situasiyada hər üç söz kəsişir və nəinki kəsişir, hətta modallıqdan kənara çıxır. Burada əda və ekspressivlik münasibət bildirməyi (modallığı) üstələyir. Lakin əksər hallarda *guya* sözü digər ikisindən fərqlənir. İkinci cümlədə də eyni situasiyadır.

İstənilən müstəvidən baxanda *sanki, elə bil, guya* sözlərinin qrammatik statusunu müəyyən etməyin çətinliyi göz qabağındadır. Yazıçılarımız çox nadir hallarda *sanki* və *elə bil* sözlərini cümlədə fərqləndirirlər.

1. *Elə bil, köhnə dostu ilə görüşündən üç-dörd saat yox, üç-dörd gün keçmişdi* (H.Mehdi).
2. *Sanki, o gənc qadın bu ixtiyarsız təbəssüm və baxışı ilə könlümün heyranlığını mənə bildirmək istəyirdi* (İ.Əfəndiyev).

Ədiblərimizin məlum sözlərə fərqli yanaşması məhz həmin sözlərdə vergülün qoyulmasının problematik olduğundan xəbər verir.

Daha bir məsələnin üstündən yan keçmək olmur. Prof. Q.Kazımov yazır: “Dərslik və monoqrafiyalarda ara sözlərlə işlənən *ki*-nin bağlayıcı olduğu göstərilir. Bu fikir ara sözlərin mühüm xarakter əlamətlərindən biri ilə ziddiyyət təşkil edir. Ara sözlər ona görə cümlə üzvü olmur ki, qrammatik cəhətdən cümlənin üzvləri ilə bağlana bilmir. Ara sözlərlə birgə işlənən *ki* bağlayıcı hesab edilərsə, onda ara sözlə onun aid olduğu cümlə arasında qrammatik əlaqənin olmadığını iddia etmək doğru olmaz” [13, s.256].

Deməli, professorun iradından belə nəticə çıxarmaq olar: *elə bil ki, guya ki* ifadələrindən sonra ona görə vergül qoyulmur ki, oradakı *ki* bağlayıcıdır, vergül həmin ifadələrin modal söz olduğuna görə qoyulur.

**Nəticə / Conclusion**

Nəhayət, yuxarıda söylənilənlərdən aşağıda qeyd edilən nəticələri çıxarmaq olar:

1. *Sanki, elə bil, elə bil ki, guya, guya ki* sözlərinin aid olduğu köməkçi nitq hissələrinin təsnifatı yekdil deyil. Hazırda mövcud olan təsnifat ümumtəhsil məktəblərinin şagirdləri üçün nəzərdə tutulmuşdur.
2. Həmin ifadələrin hər birində bu və ya digər dərəcədə subyektiv modallıq çaları vardır.
3. Həmin ifadələrin qrammatik statusu yalnız kontekstdə müəyyən edilə bilər.
4. Həmin ifadələrdə həm modal sözlərin, həm də ədatların əlamətləri vardır.
5. Bütün nəzəri mülahizələri kənara qoysaq, ikisindən biridir: ya modal sözdür, vergül vasitəsilə fərqləndirilməlidir, ya da vergül qoyulmadığı üçün modal söz deyil. Bu sözlərin ədatlara yaxın olmasını arqumentləşdirən bir neçə hal vardır. Onlar:

a) geniş intonasiya tələb etmir;
b) əksər hallarda bütöv cümləyə aiddir;
c) feilə yaxın məsafədə olduqca fasilə zəifləyir;
d) frazeoloji tərkibin içərisindən ayrıla bilmir.

Modal sözlər isə cümlə üzvü deyil və buna görə də cümlədə fərqləndirilir.

6. Modal sözlər ya bütöv cümləyə, ya da cümlənin ayrı-ayrı üzvlərinə aid olduğu halda, modal ədatlar yalnız bütöv cümləyə aid olur.
7. Hər hansı bir qrammatik vahidin vergül vasitəsilə ayrılması və ya fərqləndirilməsi süni şəkildə baş vermir. Belə olarsa, hərc-mərclik yarana bilər. İntonasiya mənaya xidmət etməlidir: ya qrammatik vahidi ayırmaq, ya da cümlədəki məna variasiyasını fərqləndirmək məqsədi daşıyır. Ona görə də *sanki* sözündə fasilə yoxdur deyə onun fərqləndirilməməsi qrammatik qanunlara ziddir. Bəzən intonasiya olmayan yerdə vergül qoyulur, çünki qrammatik vahidi cümlədə fərqləndirmək mütləq tələbdir.
8. Ən nəhayət, *sanki, elə bil (elə bil ki), guya (guya ki)* ifadələrinin cümlədə ayrılması və ya fərqləndirilməsi ilə bağlı müəyyən tərəddüdlər də onların sinkretik məna daşıması səbəbindəndir. Hətta bağlayıcı kimi işlənmiş *sanki* sözündən əvvəl vergül qoyulmasını bağlayıcının adına yazmaq olmaz, çünki bağlayıcı cümlədə ayrılan və ya fərqləndirilən qrammatik vahid deyil. Bağlayıcı kimi işləndikdə mürəkkəb cümlənin komponentləri arasında vergül qoyulur.

Ən nəhayət, *sanki, elə bil (elə bil ki), guya (guya ki)* sözləri bütün parametrlərinə görə elmi ədəbiyyatda modal ədatlar hesab edilməlidir. Məktəb qrammatikasına onlar modal sözlər kimi daxil edilmişdirsə, modal sözlərin qrammatik funksiyası onların ayrılmasını və ya fərqləndirilməsini tələb edir.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Abdullayev Ə., Seyidov Y., Həsənov A. (2007). Müasir Azərbaycan dili, IV hissə. Sintaksis. Bakı, Şərq-Qərb.
2. Abdullayev Ə. (1958). Köməkçi nitq hissələri. Bakı, Azərbaycan Universiteti nəşriyyatı, s.4.
3. “Abituriyent” jurnalı. (2019). DİM, s.183.
4. Aslanov A.Ə. Müasir Azərbaycan dilində modal sözlər. Dilçilik məcmuəsi. Nizami adına ədəbiyyat və dil institutunun əsərləri, X cild, s.85-87.
5. Azərbaycan dilinin izahlı lüğəti. IV cild. (2006). Bakı, Şərq-Qərb, s.35.
6. Əhmədov B., Axundov A. (1995). Türk dili. 6-cı sinif üçün dərslik. Bakı, “Öyrətmən” nəşriyyatı, s.126–128.
7. Hacıyev M.Ə. (1961). Durğu işarələri.
8. Həsənov M.Ə. (1991). Azərbaycan dili durğu işarələrinin tədrisinə dair. Metodik göstəriş.
9. Həsənov M. (1987). Azərbaycan dili sintaksisinin tədrisində qarşıya çıxan çətinliklər. Bakı, “Maarif” nəşriyyatı.
10. Hüseynzadə M. (2007). Müasir Azərbaycan dili, III hissə. Morfologiya. Bakı, Şərq-Qərb.
11. İsmayılov R. və başqaları. (2022). Azərbaycan dili (tədris dili). Ümumi təhsil müəssisələrinin 7-ci sinifləri üçün. Bakı, Altun kitab.
12. Kazımov Q.Ş. (2010). Müasir Azərbaycan dili. Morfologiya. Ali məktəblər üçün dərslik. Bakı, Elm və təhsil.
13. Kazımov Q.Ş. (2007). Müasir Azərbaycan dili. Sintaksis. Ali məktəblər üçün dərslik. Bakı, Təhsil.
14. Rüstəmov R. Müasir türk dillərində köməkçi nitq hissələri (keçid prosesi), s.76.
15. Zeynalov F. (1971). Müasir türk dillərində köməkçi nitq hissələri. Monoqrafiya (Oğuz dilləri qrupunun materialları əsasında). Bakı, Maarif.
16. Грамматика Азербайджанского языка. (1971). Фонетика, морфология и синтаксис. Под редакцией М.Ш.Ширалиева. Баку, Элм.
17. Валгина Н.С. (2002). Синтаксис современного русского языка. Москва, Логос.
18. Виноградов В.В. О категории модальности и модальных словах в русском языке, с.55.
19. Колесникова С.М. (2012). Частицы как часть речи (к вопросу о значении и разрядах по строению и функциям). Русский язык в школе, №7, с.65–72.
20. Мещанинов И.И. (1945). Члены предложения и части речи. Москва, с.289.

21. Потебня А.А. (1941). Из записок по русской грамматике. Т. 4. Москва, с.194–197.
22. Фомина М.И., Валгина Н.С., Розенталь Д.Э. (2002). Современный русский язык. Учебник под редакцией Н.С.Валгиной. 6-е изд., перераб. и доп. Москва, Логос, с.528.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 114–120
doi.org/10.48445/l5598-7436-6708-k

QRAMMATİKA

# Müasir Azərbaycan dilində şəkilçilərin təsnifi

***Elşad Abışov***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, "Müasir Azərbaycan dili" kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: elsad_abisov@mail.ru
https://orcid.org/0000-0002-5048-1872

**XÜLASƏ**
Məqalədə müasir Azərbaycan dilində şəkilçilərin təsnifi problemləri şərh olunur. Araşdırma prosesində iltisaqi dillərdən olan Azərbaycan dilinin qrammatik sistemində və söz yaradıcılığında mühüm rol oynayan şəkilçi morfemlərin təsnifatı barədə tədqiqatçıların mülahizələri nəzərdən keçirilir. Həmçinin dil faktları və qrammatik qanunauyğunluqlar əsasında yeni bölgü aparılır, spesifikliyi ilə diqqəti cəlb edən bəzi şəkilçilərin funksionallığı barədə ətraflı məlumat verilir.

**AÇAR SÖZLƏR**
leksik vahid, morfem, şəkilçi, qrammatika, morfologiya

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 13.10.2023
qəbul edilib: 18.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 114–120
doi.org/10.48445/l5598-7436-6708-k

**GRAMMAR**

# Classification of suffixes in the modern Azerbaijani language

***Elshad Abishov***
Doctor of Philosopy in Philology, Associate Professor, Department "Modern Azerbaijani language", Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: elsad_abisov@mail.ru
https://orcid.org/0000-0002-5048-1872

**ABSTRACT**
The article describes the problems of classification of suffixes in the modern Azerbaijani language. In the research process, researchers' opinions about the classification of suffix morphemes, which play an important role in the grammatical system of the Azerbaijani language and word creation, are reviewed. Also, a new division is made based on linguistic facts and grammatical regularities, detailed information is provided on the functionality of some suffixes that attract attention with their specificity.

**KEYWORDS**
lexical unit, morpheme, suffix, grammar, morphology

**ARTICLE HISTORY**
Received: 13.10.2023
Accepted: 18.11.2023

## Giriş / Introduction

Məqalədə dilimizin söz yaradıcılığı prosesində fəal iştirak edən şəkilçilərin spesifik xüsusiyyətləri şərh olunur, onların bölgüsü aparılır, tədqiqatçıların bu barədə fikirlərinə geniş yer verilir.

**Aktuallıq:** Şəkilçilərin tədqiqi dilimizin morfoloji quruluşunun mükəmməl öyrənilməsi baxımından olduqca faydalıdır. Bunun nəticəsidir ki, uzun illərdir bir çox tədqiqatçılar öz tədqiqat işlərində bu məsələyə geniş yer vermişlər. Bu səbəbdən mövcud problemlə bağlı dilçilərin fikirlərini ümumiləşdirib münasibət bildirmək aktualdır.

**Metod:** Məqalədə təsviri, müqayisəli və üslubi metodlardan istifadə edilmişdir.

## Əsas hissə / Main part

Azərbaycan dili morfoloji quruluşuna görə iltisaqi dillərdən olduğu üçün şəkilçi morfemlər dilimizin lüğət tərkibinin zənginləşməsində, müxtəlif söz formalarının yaranmasında, sözlərlə birləşmələr arasında qrammatik münasibətlərin qurulmasında həlledici mövqeyə malikdir. Bunu nəzərə alan tədqiqatçılar şəkilçilərin struktur-semantik xüsusiyyətlərini, funksionallığını və digər spesifik cəhətlərini əsas götürməklə çoxsaylı araşdırmalar aparmış, onların təsnifatı barədə bir-biri ilə ziddiyyət təşkil edən fərqli mülahizələr irəli sürmüşlər. S.Cəfərovun araşdırmalarında şəkilçi morfemlər – leksik şəkilçilər, leksik-qrammatik şəkilçilər, qrammatik-leksik şəkilçilər və qrammatik şəkilçilər adı altında dörd qrupa bölünür [1, s.139].

Tədqiqatda birinci qrupa, yeni leksik vahidlər əmələ gətirən və həmin leksik vahidlərin başqa sözlərlə əlaqəyə girməsini tələb etməyən şəkilçilər (-dan$^{2}$; -lıq$^{4}$; -ın$^{4}$; -laş$^{2}$; -ıs$^{4}$ və s. Məsələn: *şam+dan, yaxşı+lıq, ək+in, yaxşı+laş(maq), yağ(maq)+ış*), ikinci qrupa yeni sözlər əmələ gətirməklə bərabər, onların başqa sözlərlə əlaqəyə girməsini tələb edən şəkilçilər (-çı$^{4}$; -lıq$^{4}$; -lı$^{4}$; -ma$^{2}$; -kan$^{2}$ və s. Məsələn: *neft+çi (qadın), yağ+lı (çörək), dağ+lıq (yer), süz+mə (qatıq), sürüş+kən (yer)*), üçüncü qrupa müəyyən bir qrammatik kateqoriyaya mənsub məna əmələ gətirən və yeni bir məna ifadə etməyə meyl göstərən şəkilçilər (-yan$^{2}$; -dır$^{4}$; -ıl$^{4}$; -ış$^{4}$ və s. Məsələn: *oxu+yan, yan+dır(maq), süz(mək)+ül, gör(mək)+üş*), dördüncü qrupa isə bu və ya digər qrammatik kateqoriyanın vəzifələrini yerinə yetirən ismin hal və mənsubiyyət, feilin zaman və şəxs şəkilçiləri aid edilir [1, s.139].

Alimin dil materialları üzərində apardığı ümumiləşdirici təhlillərindən aydın olur ki, şəkilçilər təsnif olunarkən eyni kateqoriyadan olan şəkilçi morfemlərin həm leksik, həm də qrammatik imkanları əsas götürülür.

Bu prinsip tədqiqatçının morfoloji ünsürlərlə (şəkilçilərlə) bağlı təqdim etdiyi bölgünün birinci və dördüncü qruplarında özünü doğrultsa da, ikinci və üçüncü qruplarında uyğunsuzluqla müşahidə olunur. Belə ki, o, ikinci qrupa aid edilən budaq morfemlərin yeni leksik vahidlər (sözlər) əmələ gətirməklə bərabər, söz və birləşmələr arasında qrammatik münasibətlərin qurulmasına xidmət etdiyini, bu səbəbdən də leksik-qrammatik şəkilçilər adlandırıldığını qeyd edir. Məs.: *neft+çi (qız), dağ+lıq (yer), yağ+lı (xörək)* [1, s.140]. Professor B.Ə.Xəlilov da buna uyğun olaraq yazır ki, qrammatik şəkilçilər kimi sözdüzəldici şəkilçilər də sözlərin bir-biri ilə əlaqələnməsinə xidmət edir. Məs.: -lı$^{4}$ şəkilçisi ilə *yağlı* sözü *xörək* sözü ilə əlaqələnir [3, s.198].

Doğrudur ki, -çı$^{4}$; -lıq$^{4}$; -lı$^{4}$ şəkilçiləri məhsuldar olmaqla sözyaratma prosesində fəal iştirak edirlər. Lakin onların sözlər və birləşmələr arasında qrammatik əlaqələrin qurulmasında rolundan danışmaq absurddur. Ona görə ki bu tip birləşmələr arasında mövcud olan qrammatik münasibətlər bilavasitə şəkilçilərin iştirakı ilə deyil, həmin şəkilçilər vasitəsilə əmələ gələn sifətlərin yaxınlaşması əsasında qurulur. Belə substantiv birləşmələrin dildə bir çox şəkilçisiz modelləri işlənməkdədir. Məsələn: *yaşıl yarpaq; taxta qapı; gümüş qaşıq və s.* Verilmiş nümunələrdən də aydın olur ki, söz birləşmələri arasında qrammatik əlaqələri təmin edən şəkilçilər yox, əşyanın əlamət və xüsusiyyətini izah edib aydınlaşdırmağa xidmət edən sifətin və atributiv isimlərin öz təbii funksiyasına uyğun olaraq ismə yanaşmasıdır.

S.Cəfərovun qrammatik-leksik şəkilçilərə aid etdiyi -yan$^{2}$; -dır$^{4}$; -ış$^{4}$; -ıl$^{4}$ və s. feilin təsirlik növ və feili sifət şəkilçiləri barədə söylədiyi fikirlər də mübahisəlidir. Tədqiqatçı bu haqda məlumat verərkən yazır ki, üçüncü qrupa mənsub olan (yəni qrammatik-leksik – E.A.) şəkilçilər artırıldığı sözdən əlavə müəyyən qrammatik kateqoriyaya mənsub məna bağlılığı əmələ gətirdiyi kimi, eyni zamanda yeni bir məfhum ifadə etməyə də meyl göstərirlər. Məsələn: *oxumaq – oxuyan; yaz(maq) – yazdır(maq); sür(mək) – sürül(mək); sat(maq) – satıl(maq); gör(mək) – görüş(mək)* [1, s.140].

Müşahidələr göstərir ki, -y, -an$^{2}$, -dır$^{4}$, -ıt$^{4}$, -ış$^{4}$ komponentləri alimin qeyd etdiyi kimi, feilə mənsub təsirlik (-dır$^{4}$), növ (-ış$^{4}$, -ıl$^{4}$) kateqoriyalarının, həmçinin feili sifətlərin (-an$^{2}$) formalaşmasında fəal iştirak edirlər. Ancaq onlar yeni anlayış ifadə edən məfhumlar (sözlər) yaratmaq imkanına malik deyillər, yəni *oxu(maq), yaz(maq), sat(maq), gör(mək)* feillərindən -ıl$^{4}$; -dır$^{4}$; -an$^{2}$; -ış$^{4}$ şəkilçiləri vasitəsilə düzələn *oxuyan, yazdırmaq, görüşmək* feilləri hər hansı yeni bir məfhum ifadə etmir, yeni anlayış formalaşdırmır. Bu da nəticədə şəkilçilərin təsnifatının nəzəri cəhətdən qüsurlu olduğunu deməyə əsas verir. Azərbaycan Milli Elmlər Akademiyasının "Müasir

Azərbaycan dili" adlı nəşrində S.Cəfərovun təsnifatından fərqli olaraq *sözdüzəldici*, *sözdəyişdirici* və *formadüzəldici şəkilçilər* adı ilə üç qrupa bölünür [4, s.189].

Yəni formadüzəldici şəkilçilər sözdüzəldici və sözdəyişdirici şəkilçilərdən ayrılaraq müstəqil şəkilçi qrupu kimi təqdim edilir [4, s.139]. Eyni bölgü hər hansı dəyişiklik aparılmadan prof. B.Ə.Xəlilov və prof. Q.Ş.Kazımovun araşdırmalarında da öz əksini tapır [2, s.164]. Fikir ayrılığı formadüzəldici şəkilçilər sırasına hansı şəkilçi morfemlərin aid edilməsi məsələsinə münasibətdə özünü göstərir.

B.Ə.Xəlilov formadüzəldici şəkilçilərə feilin növ şəkilçilərini, sözlərə əzizləmə və kiçiltmə mənası verən şəkilçiləri, sifətin dərəcə şəkilçilərini, feili sifət, feili bağlama və məsdər şəkilçilərini daxil edərək yazır ki, formadüzəldici şəkilçilər sözdüzəldici və sözdəyişdirici şəkilçilərə bənzəsələr də, həm də onların hər ikisindən fərqlənir. Belə şəkilçilər sözdüzəldici və sözdəyişdirici arasında orta mövqedə dururlar. Bu şəkilçilər nə tam şəkildə sözdüzəldici, nə də sözdəyişdiricidir [3, s.60].

Professor Q.Ş.Kazımov isə formadüzəldici şəkilçilərə yeni söz düzəltmək və sözlər arasında əlaqə yaratmaq imkanlarına malik olmayan, yalnız bu və ya digər morfoloji kateqoriyanın yaranmasına xidmət edən isimlərə kəmiyyət və feillərə inkarlıq şəkilçilərini daxil edir [2, s.191].

Faktlar göstərir ki, formadüzəldici şəkilçilər mahiyyəti və funksiyasına görə qrammatik şəkilçilərə daha yaxındır. Y.Seyidov bununla bağlı yazır ki, formadüzəldicilik bu qrupa aid edilən şəkilçilərin qrammatik mahiyyətini və ya sözdəyişmə imkanlarını inkar etmir, əksinə təsdiq edir ki, bu şəkilçilər yeni mənalı söz yaratmır, sözün formasını dəyişir, həmçinin sözün qrammatik mənalarında müəyyən dəyişiklik yarada bilir. Məsələn, kəmiyyət kateqoriyasının şəkilçisi -lar$^2$ isimlərə qoşularaq həmin ismin ifadə etdiyi əşyanın kəmiyyətinə təsir edir, yəni *kitab* və *kitablar* sözlərinin kəmiyyət anlayışı fərqlidir [4, s.49]. Göründüyü kimi, formadüzəldici şəkilçilər söz və birləşmələr arasında əlaqə yaratmasalar da, qrammatik quruluşun mühüm göstəricilərindən olan sözün paradiqmalarının, yəni sözdə müxtəlif qrammatik formaların və bu formaların əsasında əmələ gələn yeni qrammatik mənaların formalaşmasını təmin edir. Bu da nəticə etibarilə formadüzəldici şəkilçilərin müstəqil şəkildə qrupu deyil, qrammatik şəkilçilərin tərkibində ayrıca qrup təşkil edən şəkilçilər kimi sistemləşdirilməsinin daha elmi və məntiqli olduğunu göstərir. Belə bir sistemləşdirmə şəkilçilərin ənənəvi dilçilikdəki təsnifatının hələ də aktuallığını itirmədiyini deməyə əsas verir. Məlum olduğu üzrə ənənəvi bölgüdə şəkilçilərin təsnifi onların sözyaratma prosesindəki roluna əsasən müəyyən olunur.

Yeni leksik vahidlərin yaranmasında iştirak edən şəkilçi morfemlər leksik, sözlər arasında əlaqə yaradanlar isə qrammatik şəkilçilər adlandırılır [4, s.41]. Qrammatik şəkilçilər də özlüyündə iki qrupa bölünür: 1) sözlər arasında əlaqə yaradanlar; 2) yalnız formadüzəldənlər. Doğrudur, hər iki qrupdan olan şəkil çilər sözlərə qoşulduqda yeni söz-formalar yaradırlar, lakin birinci qrup şəkilçilərdə əlaqəlilik, ikinci qrupda isə formadüzəldicilik mühüm funksiya kimi önə çıxır. Bütün bunları nəzərə alaraq şəkilçiləri aşağıdakı kimi təsnif etmək olar:




Şəkilçilərin təsnifatında müşahidə olunan ziddiyyətli məqamlardan biri də feillərdə təsirlik və növ, sifətlərdə isə dərəcə şəkilçiləri leksik şəkilçilərə aid edilməlidir.

S.Cəfərov bu şəkilçilər barədə yazır: *"Müəyyən qrup sözdüzəldici şəkilçilər də vardır ki, onlar söz kökünə güclü təsir edə bilmir, belə şəkilçilərin qoşulduğu sözlərdə əvvəlki leksik məna tam deyil, qismən dəyişir. Buna görə də bu cür sözlər aid olduğu nitq hissəsinin xüsusiyyətlərini saxlayır, başqa nitq hissələrinə çevrilmir. Məsələn: çal feilindən yaranan çaldır yenə də feil olaraq qalır. Ona görə də bu qrup şəkilçiləri qismən sözdüzəldici şəkilçi adlandırmaq olar. Sifətin dərəcə, feilin növ... və s. şəkilçilərini buraya aid etmək olar"* [1, s.10].

Q.Ş.Kazımov da feilin təsirlik növ və sifətin dərəcə şəkilçilərinin sözdüzəldicilik xüsusiyyətinə malik olduğunu qeyd edərək onları qismən sözdüzəldici şəkilçilər hesab edir [2, s.164].

Fikrimizcə "*qismən söz düzəltmək*" ifadəsi mahiyyət etibarilə olduqca təzadlı və yayğın ifadədir. Ona görə ki hər hansı şəkilçi leksik vahidlərə qoşularkən ya ondan yeni mənalı leksik vahid əmələ gətirir, ya sözlər və birləşmələr arasında qrammatik əlaqələrin qurulmasına xidmət edir, ya da sadəcə olaraq qrammatik formanın dəyişməsində iştirak edir. Bu da nəticədə, "*qismən söz düzəltmək*" ifadəsinin bir növ

qeyri-dəqiq anlam kəsb etdiyini deməyə əsas verir. Əslində sifətlərdə dərəcə, feillərdə təsirlik və növ şəkilçiləri leksik yox, qrammatik olan şəkilçilərdir. Onların qrammatik şəkilçilər sırasına daxil edilməsini şərtləndirən bir sıra səciyyəvi xüsusiyyətlər vardır. Həmin xüsusiyyətlər aşağıdakılardır:

1. Bu şəkilçilər sözlərdə yeni məna yaratmaq imkanına malik deyildir. Məsələn, güldürmək *(gül+dür=güldürmək),* *açılmaq* *(aç+ıl=açılmaq),* *yandırmaq* *(yan+dır=yandırmaq)* sözlərinin tərkibində işlənən -ır$^4$ və -ıl$^4$ şəkilçiləri dildə hər hansı yeni məna yaratmır, subyektin fəallığını və ya obyekt-subyekt münasibətlərinin təmin edilməsini şərtləndirir.

2. Q.Ş.Kazımov doğru olaraq, qrammatik kateqoriyalar haqqında yazır ki, məzmun və forma (ifadə) planında bir-birinə qarşı duran qrammatik mənaların birliyi qrammatik kateqoriyaları yaradır [2, s.17].

**Nəticə / Conclusion**

Fikirlərimizi yekunlaşdırıb qeyd edək ki, sifətlərdə dərəcə, feillərdə təsirlik və növ kateqoriyaları qrammatik kateqoriyalardır. Onlar da digər qrammatik kateqoriyalar kimi bir-birinə qarşı duran qrammatik mənaların birliyindən yaranır. Nəzərə alsaq ki, qrammatik mənalar qrammatik formaların, xüsusilə də qrammatik şəkilçilərin köməyi ilə formalaşır, o halda sifətlərdə dərəcə, feillərdə təsirlik və növ kateqoriyalarını yaradan şəkilçilərin qrammatik şəkilçilər olmalarına şübhə yeri qalmır. Qrammatik şəkilçilər sırasında yer alan bu tip kateqorial şəkilçilər sözlər arasında qrammatik əlaqələrin qurulmasına deyil, yalnız sözlərin formasını dəyişməyə xidmət etdiyinə görə onların formadüzəldici şəkilçilər qrupuna daxil edilməsi nəzəri cəhətdən daha məntiqlidir. Formadüzəldici şəkilçilər sırasına formadüzəldiciliyin xüsusiyyətləri nəzərə alınaraq isimlərdə hal, sifətlərdə dərəcə, feillərdə təsirlik, növ, inkarlıq və zaman şəkilçilərini aid etmək olar.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Cəfərov S. (2007). Müasir Azərbaycan dili. Bakı, Şərq-Qərb. 192 s.
2. Kazımov Q.Ş. (2011). Müasir Azərbaycan dili (Morfologiya). Bakı, Elm və təhsil. 400 s.
3. Xəlilov B.Ə. (2007). Müasir Azərbayan dilinin morfologiyası. 2 cilddə, II cild. Bakı, 180 s.
4. Seyidov Y. (2000). Azərbaycan dilinin qrammatikası (Morfologiya). Bakı, Bakı Universiteti nəşriyyatı. 374 s.
5. Cəfərov C., Abdullayev N. (2004). Müasir Azərbaycan dilinin morfologiyası. Bakı, ADPU-nun nəşriyyatı. 172 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, №4 (278), 121–140
doi.org/10.48445/z3900-4464-0008-t

AZƏRBAYCAN TƏHSİLİ

# Təhsildə sertifikasiyanın şərtləndirilməsi: ənənə və müasirlik

***Şahrza Ağayev***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan. E-mail: shahrza-a@mail.ru
https://orcid.org/0000-0002-8114-8255

**XÜLASƏ**
Məqalədə təhsildə sertifikasiyanın mahiyyəti, ənənəvi və müasir pedaqoji texnologiyaların köməyi ilə təhsilverənlərin bilik və fəaliyyətinin standarta uyğun təlim məqsədində reallaşdırmaqda, peşəkarlıqda yanaşma bacarıqları təhlil edilmişdir. O cümlədən təhsilin konsepsiyasına daxil olan məqsəd və vəzifələrin həllində dünya təcrübəsi, ənənəvi və müasir dərsin fərqləndirilməsi, onun səciyyəvi xüsusiyyətləri, mərhələləri, təhsilverənin funksiyaları və bir çox məsələlərin nəzəri və praktik şərhi ilə bağlı nümunələr, həmçinin müəllimin sertifikasiyada uğurlu nəticələr qazanmasına yardımçı olacaq maraq doğuran materiallar təqdim edilir.

**AÇAR SÖZLƏR**
təhsildə sertifikasiya, Milli Kurikulumun funksiyaları, STEAM təhsili, peşəkarlıq, inteqrasiya

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 11.10.2023
qəbul edilib: 21.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 121–140
doi.org/10.48445/z3900-4464-0008-t



# Conditioning of certification in education: tradition and modernity

***Shahrza Aghayev***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: shahrza-a@mail.ru
https://orcid.org/0000-0002-8114-8255

**ABSTRACT**
In the article, the essence of certification in education, with the help of traditional and modern pedagogical technologies, the knowledge and activities of educators in realizing the goal of training in accordance with the standard, professional approach skills, world experience in solving goals and tasks included in the concept of education, differentiation of traditional and modern lessons, characteristic features, stages, functions of the educator and examples of theoretical and practical interpretation of many issues, interesting materials are provided to help the teacher to achieve successful results in the certification.

**KEYWORDS**
certification in education, functions of the National, Curriculum, STEAM education, professionalism, integration

**ARTICLE HISTORY**
Received: 11.10.2023
Accepted: 21.11.2023

## Giriş / Introduction

Azərbaycan Respublikasında ümumi təhsilin konsepsiyası (Milli Kurikulumu) ictimai-siyasi, mədəni və sosial həyatın qloballaşdığı və universallaşdığı, informasiya-kommunikasiya texnologiyalarının rolunun artdığı, rəqabətin gücləndiyi müasir dövrdə hər bir şəxsin istedad və qabiliyyətinin müstəsna əhəmiyyət kəsb etdiyi nəzərə alınaraq, müstəqil qərarlar qəbul etməsi üçün onun zəruri təhsil səviyyəsinə və bacarıqlara malik olmasına, cəmiyyətin inkişafının əsas hərəkətverici qüvvəsi olan insanın formalaşdırılmasına və problemlərin həllinə yönəlmişdir. Milli Kurikulum bilavasitə aşağıdakı funksiyaların reallaşdırılmasına xidmət edir: ümumi təhsilin pillələri, bu pillələrdə tədris olunan fənlər arasında əlaqələrin və ardıcıllığın təmin edilməsi; fənlərin məzmununun cəmiyyətin tələbatına uyğun daim təkmilləşdirilməsi və yeniləşdirilməsi; təlim texnologiyalarının çevikliyi və interaktivliyinin təmin olunması; nəticəyönümlü fənn kurikulumlarının hazırlanıb tətbiq olunması; təlim mühitinin, təhsil fəaliyyətinin səmərəliliyinin, təlimin inkişafetdirici və qabaqlayıcı xarakterinin, bilik, bacarıq və vərdişlərin təhsil pillələri üzrə konsentrik prinsip əsasında müəyyənləşdirilməsinin təmin olunması; şagird nailiyyətlərinin obyektiv qiymətləndirilməsi və stimullaşdırılmasının təmin edilməsi.

## Əsas hissə / Main part

Milli Kurikulumda problemlərin həlli və zəruri funksiyaların reallaşdırılmasına yönələn sənəddə qeyd olunan hədəflərin həlli davamlı prosesdir. Bununla yanaşı sertifikasiyanın təşkili də təhsilin inkişafına xidmət edir. Dövlət ümumi təhsil müəssisələrində sertifikasiya dedikdə, pedaqoji və idarəetmə fəaliyyəti ilə məşğul olan, ali və orta ixtisas təhsilinə malik təhsilverənlərin peşəkarlıq səviyyəsinin və peşə yararlılığının yoxlanılması proseduru başa düşülür. Dünya təcrübəsində və həyatın bütün qlobal sahələrində olduğu kimi, təhsil sahəsində müəllimlərin də sertifikasiyadan keçməsi zərurəti vardır. Bu, onların inkişafı, müasirləşməsi üçün vacibdir. Ölkədə müəllim hazırlığı ilə əlaqədar son illər həyata keçirilən nəzəri və praktik tədbirlər, dünyanın inkişaf etmiş ölkələrinin STEAM təhsili texnoloji təcrübələrinin öyrənilib milliləşdirilməsində qazanılan nailiyyətlər qarşıya qoyulan uğurlu hədəflərdir. STEAM – elm, texnologiya, mühəndislik, incəsənət və riyaziyyatın birləşməsi nəticəsində yeni ideyaların reallaşdırılması, cəmiyyətdə müxtəlif problemlərin həllinə kömək edə biləcək təhsil yanaşmasıdır (həmin sözlərin ingilis dilində olan baş hərflərinin qısaldılmış ifadəsi kimi STEAM deyilir). STEAM təhsil metodu şagirdlərə beş sahənin – elm (science), texnologiya (technology), mühəndislik (engineering), incəsənət (art)

və riyaziyyatın (math) birgə və inteqrasiya olunmuş şəkildə tədrisi ideyası üzərində qurulub. XXI əsr insanı müasir texnologiyaların, yeni elmi yanaşmaların, ixtiraların sürətlə inkişaf etdiyi dövrdə hazırkı təhsil modellərinin yetişdirdiyi insanlardır. Deməli, məzunlarımız müasir tələblərə cavab verən, əmək bazarında özünü doğruldan şəxslər olmalıdır. Prioritet olan bu məsələ ilə bağlı Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi 2019–2020-ci tədris ilindən başlayaraq Heydər Əliyev Fondunun dəstəyi ilə "STEAM Azərbaycan" layihəsinə start verməklə ölkədə uğurlu nailiyyətlər qazanmaqdadır. STEAM kurikulumu fənlərarası, praktik və tətbiqi dərslərdən ibarət olub, elm və texnologiyaların öyrədilməsində ənənəvi yanaşmadan fərqlənir. Bu təhsil praktik məşğələlər vasitəsilə elmi və texniki biliklərin gündəlik həyatda tətbiqini şagirdlərə göstərməyə əsaslanır. Belə yanaşma şagirdlərə mühəndislik səriştələri öyrətməklə real həyatda problemlərin həlli yollarını aşılayır və peşə seçimlərindən asılı olmayaraq onları həyata hazırlayır. Müəllim bu sahədə müasir bacarıqlara malik olmaqla təhsildə sertifikasiyanın tələblərinə dəyərli töhfəsini vermiş olur.

Təhsil pedaqoji prosesin mühüm bir tərkib hissəsi olub, xalq təsərrüfatı üçün ixtisaslı kadrlar hazırlamaq məqsədinə xidmət edir. Dünya təcrübəsi göstərir ki, iqtisadi cəhətdən qüdrətli ölkələr sürətli inkişafa yalnız təhsil səviyyəsini yüksəltmək, insan kapitalını inkişaf etdirmək yolu ilə nail ola bilmişlər. Təhsil müxtəlif məktəb pillələrində fərqli səviyyələrdə verilir. Bu mənada ibtidai, orta, texniki peşə, orta ixtisas və ali təhsil fərqləndirilir. Hər sonrakı pillədəki təhsil əvvəlki pilləyə əsaslanır. Bu mənada "Təhsil millətin gələcəyidir" ‒deyən ümummilli lider Heydər Əliyevin müdrik fikri aktuallıq kəsb edir. Ölkədə təhsilalanları informasiya cəmiyyətinin fəal üzvlərinə çevirən təhsil islahatları uğurla davam edir. "Biz maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik" ‒ deyən ölkə Prezidenti cənab İlham Əliyev inkişafda təhsilin rolunu yüksək dəyərləndirərək bu vacib sahənin tərəqqisi üçün ardıcıl qərarlar qəbul etmişdir. Təhsil sahəsindəki inkişaf təhsilalanların mənafeyinə, maraq və tələbatlarının ödənilməsinə, istedad və qabiliyyətlərinin, potensial imkanlarının müasirləşməsinə xidmət edir. Bu proses fərdin, cəmiyyətin və dövlətin dəyişən tələbatlarını nəzərə almaqla həyata keçirilir. Burada tədris olunan fənlərin inteqrativliyi ‒təhsilin məzmun komponentlərinin bir-biri ilə və həyatla sistemli şəkildə əlaqələndirilməsi əsas prinsip kimi qəbul olunur. Təhsilalanların nailiyyət səviyyəsinə qoyulan dövlət tələbini müəyyən edən qiymətləndirmə standartları və mexanizmləri müəyyənləşdirilmişdir. Müasir dövrdə təhsilin mahiyyətinə bəşəriyyət tərəfindən əldə edilmiş sosial təcrübənin bütün elementləri daxil edilməlidir. Cəmiyyətin hər bir inkişaf səviyyəsində qazanılan təcrübə təhsilin məzmununu təyin edir. Buraya biliklər toplusu (təbiət, cəmiyyət, istehsalat, düşüncə və fəaliyyət üsulları haqqında); fəaliyyət üsulları

(toplanmış təcrübə); yaradıcı fəaliyyət təcrübəsi (yeni fəaliyyət formalarının axtarışı və formalaşdırılması); cəmiyyətin əldə etdiyi nailiyyətlərə hörmətlə yanaşma təcrübəsi daxildir.

Təhsilin mahiyyəti həyata keçirilən təlim prosesinin sonunda öyrənənin əldə etməli olduğu bilik, bacarıq, vərdiş və formalaşdırılması nəzərdə tutulan şəxsi keyfiyyətlərə qoyulan tələblərlə müəyyən edilən bir anlayışdır. Bu tələblər cəmiyyət tərəfindən müəyyən edilir və onun inkişaf səviyyəsindən asılı olur. Elmi-texniki tərəqqinin, cəmiyyətin inkişafı ilə əlaqədar olaraq təhsilin məqsədi və ona çatmaq üçün təhsilin məzmununa qoyulan tələblər də dəyişir. Bu tələblər konkret olaraq müəyyən normativ sənədlər – standartlar şəklində ifadə olunur. Müasir təhsilverənin peşəkarlıq səviyyəsi və peşə yararlılığı onların fənn kurikulumlarında təsbit olunan məzmun xətlərinin alt standartlarının təlim məqsədlərində reallaşdırmaq bacarığında olmaları ilə şərtlənir. Təhsilverənlərin sertifikasiyadan keçməsi ilə əlaqədar cəmiyyətdə təmsil olunan ziyalıların yanaşmaları müxtəlif cəhətlərə görə birmənalı olmaya bilər. Əlli illik elmi-pedaqoji səmərəli fəaliyyət illərində qazandığım zəngin təcrübəmə əsaslanan təhsilverənlərin sertifikasiyası barədə ənənə və müasirlik baxımından ziddiyyət təşkil edən mühakiməni diqqətə çatdırmağı məqsədəuyğun hesab edirəm. Ənənəvi, fənnyönümlü və müasir şəxsiyyətyönümlü proqramları müqayisə etmək üçün onların paradiqmalarını (mühüm əlamətləri, xarakteristikasını və onlardan irəli gələn nəticələri) fərqləndirmək vacibdir.

Təqdim olunan ənənəvi və müasir təhsil proqramların hər bir tələbinin müqayisəli təhlilindən qazanılan nəticəyə əsasən müəllimin peşəkarlıq fəaliyyətinə elmi şəkildə münasibət bildirmək mümkündür. Müəllim təhsil proqramlarının oxşar və fərqli cəhətlərini ciddi şəkildə tədqiq etməklə reallıqlar haqqında obyektiv fikir yürütmüş olur.

“Ə” – ənənəvi və “M” – müasir şərti işarə etməklə təhlil aparaq.

**1. Ə:** Bilikyönümlüdür (bilik ön planda durur), müəllimin əsas funksiyası öyrənənlərə məlumat çatdırmaq və onun mənimsənilməsi üçün şərait yaratmaqdır.

**M:** Şəxsiyyətyönümlüdür (öyrənənə bilik verməkdən çox şəxsiyyət kimi yetişdirir). Təhsilin məzmunu ilə yanaşı öyrənənlərin tərbiyə və inkişafında təlim metodları və təşkilati formalarda mühüm rol oynayır.

**2. Ə:** Tədrisdə avtoritar üslub əsasdır (müəllimin fikri şagirdin düşüncəsindən daha önəmli sayılır).

**M:** Tədrisdə demokratik üslub əsasdır (öyrənənlərdə azad düşüncə formalaşır).

**3. Ə:** Öyrənənlər passiv, müəllim ön plandadır.

**M:** Öyrənənlər daha aktiv, müəllim daha arxa plandadır.
**4. Ə:** Fənyönümlüdür. Fənnin məqsədinə yönəlmiş təlimdir. Hazır halda əldə edilən biliklərin möhkəmləndirilməsi yolu ilə mənimsənilir. Dərs tədris fənni çərçivəsi ilə məhdudlanır, öyrənənlərin başqa fəaliyyəti olmur.
**M:** Nəticələrə yönəlmiş təlimdir. Məsələnin həlli prosesində biliklərin müstəqil əldə edilməsi və mənimsənilməsi ön planda durur.
**5. Ə:** İnteqrasiya arxa planda qalır.
**M:** İnteqrasiya dərsin əsasını təşkil edir.
**6. Ə:** Müəllimyönümlüdür.
**M:** Şagirdyönümlüdür.
**7. Ə:** Proqramın tələblərinə yönəlmişdir. Fənnin məqsədinə yönəlmişdir.
**M:** Şagirdin tələbləri daha ön planda dayanır.
**8. Ə:** Monoloji təlim (müəllimin nitqi, onun idarəçiliyinə yönəlmişdir, şagird passiv tərəfdə qalır).
**M:** Dialoji təlim (həm müəllim, həm də şagird aktiv olub ön planda dayanır).
**9. Ə:** Hər yeni dərs müəllimin izahı ilə nəticələnir. İzahedici-illüstrativ təlimə əsaslanır.
**M:** Şagirdlər motivasiyadan əldə olunan təcrübələrlə yeni dərsi mənimsəmiş olurlar.
**10. Ə:** Təklifyönümlüdür. Həmin vaxtda təklif yalnız müəllimlər tərəfindən dəyərləndirilir.
**M:** Tələbyönümlüdür (müasir dövrün tələbinə uyğun olan sistem formalaşır).
**11. Ə:** Fəndaxili və fənlərarası əlaqə məqsədyönlü və sistemli xarakter daşımır.
**M:** İnteqrativlik (fənlərarası əlaqə) əsas prinsip kimi qəbul olunur.
**12. Ə:** Bəzi fənlər üzrə qiymət normaları müəyyən edilmişdir. Şagirdlər “2”, “3”, “4”, “5” – ilə qiymətləndirilir.
**M:** Qiymətləndirmə standartları və mexanizmləri.
**13. Ə:** Hafizəyə əsaslanır (əzbərçilik əsas rol oynayır).
**M:** Təfəkkürə əsaslanır (şagirdlərin düşüncə tərzinin və məntiqinin formalaşması və inkişafında böyük rol oynayır).
**14. Ə:** Reproduktiv (təkraredici tətbiqetmə).
**M:** Produktiv (yaradıcı təlimə əsaslanır).
**15. Ə:** Müəllim əsas bilik mənbəyidir.
**M:** Bilik mənbələri müxtəlifdir.
**16. Ə:** Şagirdlər yeni bilikləri müəllimin məlumat və izahlarını qavrama, yaddasaxlama əsasında mənimsəyir.
**M:** Şagirdlər yeni bilikləri tədqiqat zamanı dərk edirlər.

**17. Ə:** Təlim prosesində şagirdlər arasında ünsiyyət olmur. Müəllim-sinif və ya müəllim-şagird ünsiyyəti üstünlük təşkil edir.

**M:** Təlim prosesində şagirdlər arasında ünsiyyət olur: cütlük, qrup və kollektiv şəkildə təlim fəaliyyəti həyata keçirilir.

**18. Ə:** Təlim prosesinin mərkəzi mühazirədir.

**M:** Təlim prosesinin mərkəzi tədqiqatdır.

**19. Ə:** İnkişafetdirici və tərbiyəedici amil kimi, əsasən, təhsil məzmunu götürülür.

**M:** Təhsil məzmunu ilə yanaşı, şagirdlərin tərbiyə və inkişafında təlim metodları və təşkilat formaları da mühüm rol oynayır.

**20. Ə:** Dərs, demək olar ki, həmişə adi qaydada keçilir.

**M:** Ənənəvi olaraq digər formaların əlamətləri dərs sayılan və ona qarşı qoyulan bəzi elementləri, məsələn: seminar-dərs, oyun-dərs, yarış-dərs, konfrans-dərs və s. assimilyasiya edir.

**21. Ə:** Müəllim bütün funksiyalarını qoruyur. Konservatizmə əsaslanır (yeni dəyərlərə qarşı olmaq, köhnə dəyərləri mühafizə etmək və qorumaq deməkdir).

**M:** Müəllimin funksiyalarının bir hissəsinin şagirdlərə verilməsi səciyyəvidir: bilik və bacarıqların yoxlanılması və qiymətləndirilməsi (qarşılıqlı və özünüqiymətləndirmə), işin planlaşdırılması, tədqiqat və özünüqiymətləndirmə elementləri.

Aparılan müqayisəyə əsasən, milli kurikulumun tələblərinə görə müasir müəllimin obrazı və onun təhsilvermədə vəzifəsi aydın olur. Müasir müəllimin peşəkarlığına fəal təlim texnologiyalarının məqsədəuyğun tətbiqi bacarıqları təminat verir. Şagirdin bilik, bacarıq və vərdişlərə yiyələnməsi ilə yanaşı, onların dünyaya, bir-birinə, keçilən materiala olan baxışının formalaşması *tərbiyəvi tədrislə* ifadə olunur. Ənənəvi və müasir dərsin keyfiyyət cəhətdən fərqi məhz tərbiyəvi tədrisin nəticələri ilə müəyyən olunur. Tərbiyə, təhsil və təlim prosesləri özlərinə məxsus spesifik xüsusiyyətlərə malik olsalar da, bütövlükdə hamısı ümumi bir məqsədə – şəxsiyyətin ahəngdar inkişafına xidmət edir. Tərbiyənin məzmunundakı şəxsiyyətin ideya-mənəvi təsəvvürləri, inamı, əqidəsi, dünyagörüşü, müsbət davranış adətlərinin aşılanması idrak fəaliyyətində əsas yer tutur. Lakin tərbiyə prosesinin məzmunu şəxsiyyətin təhsil səviyyəsinə, biliklərin genişlənməsinə də güclü təsir göstərir. Təlimdə tərbiyə şagirdlərin fəallıq və səyini stimullaşdıran amil kimi çıxış edir.

Şəxsiyyətin müxtəlif keyfiyyətləri – zehni, əxlaqi, ideya-siyasi, əmək, fiziki, estetik və digər müsbət cəhətləri qarşılıqlı vəhdətdə formalaşır və inkişaf edir; bu keyfiyyətlər biri digərini şərtləndirir, tamamlayır. Demək, pedaqoji prosesin müxtəlif sahələri ümumi tərbiyə məqsədinin həyata keçirilməsində idrak fəallığı ilə iştirak edir. **Pedaqoji proses** təlim, təhsil, tərbiyə və şəxsiyyətin inkişafı proseslərinin vəhdəti olub, eyni

məqsədə xidmət edən vahid əməliyyatlardır. Geniş mənada tərbiyənin məqsədi nədir? Biz necə insan yetişdirmək istəyirik? Ona hansı yollarla nail olmaq olar? Bu suallar pedaqoji fəaliyyətlə məşğul olan hər bir mütəxəssisi ciddi ma-raqlandırmalıdır. **Məqsəd – pedaqoji prosesin birinci ünsürüdür.** O, idrak fəaliyyətinin digər ün-sürlərini − məzmun, vasitə və metodları müəyyən edir. Pedaqoji prosesdə idrak fəaliyyətinin səmərəli nəticə verməsi üçün onun məqsədini bilmək vacibdir. Çünki məqsədsiz fəaliyyət kortəbii xarakter daşıyır. Onu dəryada kompassız, mayaksız hərəkət edən gəminin işinə bənzətmək olar. K.D.Uşinski haqlı olaraq məqsədi bilmədən fəaliyyət göstərən müəllimi “layihəsiz bina tikən bənna”ya bənzədirdi.

Tərbiyənin məqsədi dedikdə, pedaqoji fəaliyyətin son nəticəsi, yəni insan şəxsiyyətinin “layihəsi” başa düşülür. Bu məqsəd cəmiyyətin tələbatı ilə müəyyən olunur. Cəmiyyət necə insan yetişdirmək lazım gəldiyini, sanki, məktəb və ailəyə “sifariş” verir. Onlar da bu “sosial sifarişi” yerinə yetirirlər. Eyni olmayan cəmiyyətlərdə, eləcə də cəmiyyətin müxtəlif inkişaf mərhələlərində tərbiyənin məqsədi dəyişə bilər. Məsələn, 70 illik kommunist rejimi dövründəki məqsədlərlə hazırda − müstəqil dövlət quruculuğu dövründəki tərbiyə məqsədlərində ciddi fərqlər vardır. Tərbiyənin başlıca məqsədi ahəngdar inkişaf etmiş şəxsiyyət yetişdirməkdir. Tədris olunan bütün fənlər, eləcə də təhsildə sertifikasiya məhz məqsədə çatmaqda önəmli vasitədir. Müasir şəxsiyyət birtərəfli deyil, bir çox cəhətdən (zehni, fiziki, mənəvi və s.) inkişaf etməlidir. Ahəngdar inkişaf etmiş şəxsiyyətin keyfiyyətləri genişdir. Hər bir keyfiyyətin formalaşmasında tərbiyənin ayrı-ayrı tərkib hissələri aparıcı rol oynayır. Təlim də idrak fəallığına əsaslanır. Müasir dövrdə dünyada pedaqogikanın üç səviyyədə həyata keçirilən texnoloji funksiyasına daxil olan: layihə səviyyəsi (tədris planları, proqramları, dərslik və dərs vəsaitlərinin, pedaqoji tövsiyələrin işlənib hazırlanması və s. daxildir); dəyişdirici səviyyə (pedaqoji elmin nailiyyətləri təhsil praktikasını təkmilləşdirmək və yenidən qurmaq məqsədilə tətbiq olunur); refleksiv və korrektiv səviyyə (elmi-tədqiqatların nəticələrinin təhsil-tərbiyə praktikasına təsirinin yekunlarını qiymətləndirməyi və sonradan elmi-nəzəriyyə ilə praktik fəaliyyətin qarşılıqlı təsirini korreksiya etməyi nəzərdə tutur) geniş aktuallıq kəsb edir. Bütün bunlar, əsasən, dərs prosesində real həllini tapır. Dərs mühüm pedaqoji anlayış olub, ümumi və xüsusi məqsədi ilə səciyyələnir. Ümumi tələblər təlim prinsiplərində (elmilik, sistemlilik, şüurluluq, fəallıq, əyanilik, fərdi yanaşma və s.) öz əksini tapmışdır. Məqsəd: dərsdə yüksək təhsil, inkişaf və tərbiyə səmərəsinin əldə edilməsi; təlim materialının optimal məzmununun müəyyən olunması; səmərəli metodiki variantın tətbiq edilməsi; dərsin təşkilati cəhətdən mütəşəkkil və çevik

vəziyyətin yaradılmasıdır. Bu qeyd olunan cəhətlər üzrə müəllimin peşə hazırlığının yüksək səviyyədə olması onun sertifikasiyada qoyulan bütün yoxlama suallarına layiqli şəkildə cavab verməyə qadir olması deməkdir. Müəllimin dərsə hazırlığı kurikulumun tələblərinə uyğun olaraq onun səriştəsindən, peşəkarlığından və tərtib etdiyi gündəlikdən asılıdır. Təhsil proqramı olan kurikulum təlimin məzmunu, forma və üsulları, qiymətləndirmə ilə bağlı olan bütün məsələləri özündə əks etdirir. "Kurikulum" latın sözü olub, mənası "kurs", "yol" deməkdir. Kurikulum təlim prosesində fəaliyyətlərin səmərəli təşkilinə, məqsədyönlü və ardıcıl həyata keçirilməsinə imkan yaradan konseptual sənəd kimi şərh edilir. Uzun illərin təcrübəsi olan ənənədən aydındır ki, müəllimin dərsə hazırlığı, ilk növbədə, metodik ədəbiyyatın öyrənilməsindən başlayır. Bu zaman müəllim müvafiq mövzu ilə əlaqədar məzmunla tanış olur, müəyyən jurnallarda çap olunan məqalələri nəzərdən keçirir. Sonra mövzunun öyrənilməsinin ümumi planı üçün material toplanılır. Müəllim dərslikdəki mövzu üzrə materialla tanış olarkən, şagirdlərin hazırlıq və inkişafının səviyyəsini fikrən əlaqələndirməyi diqqət mərkəzində saxlamalıdır. Dərsin planında tədris mövzusu, məqsəd və vəzifələr, dərsin quruluşu, hər bir mərhələyə ayrılan vaxt, dərsin keçirilməsi üçün lazım olan resurslar, tədris nümayişlərin siyahısı və s. əksini tapmalıdır. Müəllim dərsin planını hazırlayarkən bəzən diqqətsizliyə yol verir, nəzərdə tutulmuş məzmunun şagirdlər tərəfindən necə mənimsəniləcəyini planlaşdırmağa çalışır. Dərsə hazırlaşarkən təlimin təhsil, tərbiyə və inkişaf funksiyalarının icrası üçün müəllimin diqqət mərkəzində aşağıdakılar durmalıdır: öyrədəcəyi əsas bilikləri, ideyanı, qanun-qaydaları, anlayışları dəqiqləşdirmək; aşılayacağı tədris və idrak bacarıqlarını müəyyənləşdirmək; dərs zamanı hansı əxlaqi, mənəvi estetik və s. keyfiyyətlərin formalaşmasına təkan verəcəyini aydınlaşdırmaq; dərsin məzmununu təşkil edən bilik və bacarıqlar vasitəsi ilə hansı psixoloji funksiyaları – diqqəti, təxəyyülü, iradəni və s. inkişaf etdirəcəyini konkretləşdirmək. Müşahidələrdən məlum olur ki, *müasir dərsə hazırlıqda müəllimlərin çətinliyi aşağıdakı istiqamətlərdə özünü göstərir*: dərslərin təşkilində tədris materialının bütün şagirdlər tərəfindən mənimsənilməsi; müstəqil idrak fəaliyyətlərinin və əqli inkişafının təmin olunmasının diqqət mərkəzində saxlanılması; problem situasiyasının yaradılmasında priyom və metodların, problem sualların, didaktik materialın tapılması; təlim probleminin müstəqil həlli üçün vaxta qənaət və dərsin tempinin yüksəldilməsi üçün texniki vasitələrin kompleks tətbiqi; mövzuya şagirdlərin marağının oyanması, təlim motivlərinin formalaşması, onların emosional-iradi münasibətlərinin artırılması. Müasir dərsin, problemli, inkişafetdirici təlimin təşkilinin başlıca şərti yüksək ixtisaslı mütəxəssis – müəllim pedaqoqun fəaliyyətidir. Təlimin təşkili pedaqoqdan yeni səviyyədə sistemli olaraq yaradıcı iş

tələb edir. Pedaqoji ədəbiyyatda belə bir haqlı müqayisə aparılır ki, "günəş" bir damla suda əks olunduğu kimi, təlimin bütün cəhətləri də dərsdə aydınlaşır. Buna görə də müəllim dərsin nəzəriyyəsi və təcrübəsinə maraqla yiyələnməli, onu müasir tələblər əsasında qurmağa çalışmalıdır. Dərs müəllimin yaradıcılığını əks etdirən şah əsəridir. Sertifikasiyanın təşkilində bu cəhət diqqətdə saxlanılmalıdır. Dərs təlimin digər formaları üçün bünövrə təşkil edir. Tədris materialı nə qədər yaxşı mənimsənilərsə, digər formaların (ev tapşırıqları, seminar və əlavə məşğələlər) da səmərəsi yüksək olar. Hər bir dərs müəllimin pedaqoji-metodik simasını ifadə edir. Müəllimə, əsasən, keçdiyi dərslərə görə qiymət verilir. Odur ki, müəllim hər bir dərsə böyük məsuliyyətlə yanaşmalı, onu yüksək səviyyədə qurmağı bacarmalıdır. Bunun üçün dərsə verilən müasir tələbləri yaxşı bilmək və onları düzgün tətbiq etmək lazımdır. Dünyada aparılan statistik məlumata görə 100 müəllimin 15 faizi yüksək səviyyə qazana bilir. Milli-mənəvi və sosial-mədəni dəyərlərə yiyələnmiş insan, hazırda təhsilin rolunu, onun həlledici mahiyyətini müxtəlif məzmunda qəbul edir: *təhsil* ictimai praktikanın müstəqil forması, idarəetmə mexanizmi, təşkilati struktur və fəaliyyət sistemi olub, bütün sosial sferalarla əlaqəli elə bir infrastrukturdur ki, bir tərəfdən ictimai mühitin bütövlüyünü saxlayır, digər tərəfdən onun inkişafını təmin edir; *təhsil* tarixi-mədəni təcrübəni, insanların həyat tərzini və yaşam qaydalarını, onların ümumi həyatının norma və dəyərlərini zaman-zaman qoruyub saxlayır; *təhsil* cəmiyyətin, bütövlükdə bəşəriyyətin ictimai-siyasi və tarixi-mədəni dəyərlərini formalaşdırma və inkişafetdirmə vasitəsidir; *təhsil* zaman və məkan daxilində insan şəxsiyyətinin və mədəniyyətinin formalaşmasında, onun tərbiyəsində, bacarıqlarının dərinləşməsində həlledici rol oynamış və oynamaqdadır; *təhsil* sistemdir, prosesdir, nəticə və həm də dəyərdir. XX əsrin sonları və XXI əsrin əvvəllərinədək cəmiyyətdə mühüm əhəmiyyət daşıyan ənənəvi təhsil sistemində öyrənənlərə bir obyekt kimi yanaşılmış, avtoritar idarəetmə üsullarına üstünlük verilmişdir. Azərbaycan müstəqillik qazandıqdan sonra demokratik, müstəqil ölkənin əsas prinsiplərinə uyğun yeni, müasir tələblərə cavab verən təhsil sisteminin qurulmasına başlanıldı. Ənənəvi təhsil sistemi artıq dövrünü başa vurmuş, təkamül yolu ilə, yeni keyfiyyət dəyişiklikləri aparılmaqla tədricən dəyişmiş, öz yerini yeni sosial, şəxsiyyətyönümlü təhsil sisteminə vermişdir. Öyrədənlə öyrənənlər, məktəblə valideynlər arasında müasir tələblərə cavab verən qarşılıqlı əlaqələr quruldu, interaktiv təlim üsullarından və İKT-dən geniş istifadəyə yeni imkanlar yarandı.

**Müasir dərsin mərhələləri üzrə təhlilin ardıcıllığına daxildir:**

**I mərhələ:** *Motivasiya, problemin qoyulması.* Məlum olduğu kimi hər bir tədqiqatı başlayaraq problemi ortaya gətirmək lazımdır. Əsl problem həmişə çoxsaylı

fərziyyələr, ehtimallar doğurur və bunları yoxlamaq üçün, ilk növbədə, tədqiqat sualı formalaşdırılmalıdır. Məhz tədqiqat sualı yeni bilgilərin kəşfinə aparan bələdçi, “yolgöstərən ulduz” rolunu oynayır. Fəal təlimin birinci mexanizminə əsasən məhz problemin olması idrak fəallığının yaranmasının başlıca addımı olur. Bəs nə üçün biz dərsin bu mərhələsini məhz motivasiya adlandırırıq? Psixoloji amil kimi motivasiya hər hansı fəaliyyətin mexanizmini işə salan sövqedici qüvvədir. Fəal dərsdə təfəkkür prosesini işləməyə sövq edən və şagirdlərin **idrak fəallığını** artıran motivasiya qismində ortaya gətirilmiş problem və onun həlli tələbatı çıxış edir. Bu prosesin ən mühüm nailiyyətlərindən biri düşünməyə yönəlmə qabiliyyətinin sərbəstliyi və müstəqilliyidir. Öyrənən öz fikrini “Zənnimcə…”, “Mənə belə gəlir ki,…”, “Mən belə hesab edirəm ki,…” sözlərindən istifadə etməklə ifadə edir.

**II mərhələ:** *Tədqiqatın aparılması.* Problemin həlli üzrə fərziyyələrin meydana gəlməsinin təbii nəticəsi olaraq, irəli sürülən fərziyyələri təsdiq və ya təkzib edən, habelə qoyulan tədqiqat sualına cavab verməyə kömək edə biləcək faktları tapmaq zərurəti ortaya çıxır. Buna, şagirdləri irəli sürülmüş problemin həllinə məqsədyönlü şəkildə aparan, özündə yeni informasiyanı və yeni sualları daşıyan müxtəlif çalışmalar kömək etməlidir. Məhz yeni faktların öyrənilməsi və bu suallara cavabların tapılması gedişində düşünmək və yeni biliklər kəşf etmək üçün münasib şərait, imkan yaranır.

Tədqiqat müxtəlif formalarda: bütün siniflə birgə, kiçik qruplarda, cütlük və fərdi şəkildə aparıla bilər. Lakin interaktiv təlim anlayışının özü ənənəvi təlimdə tətbiq edilən frontal və ya fərdi formalarla müqayisədə daha fəal iş formalarının mövcudluğunu ehtiva edir. Təlimin interaktiv xarakteri kiçik qruplarda və ya cütlük şəklində işlərdə daha qabarıq formada təzahür edir.

**III mərhələ:** *İnformasiya mübadiləsi.* Bu mərhələdə iştirakçılar tədqiqatın gedişində əldə etdikləri tapıntıların, yeni informasiyaların mübadiləsini aparırlar. Qoyulmuş suala cavab tapmaq zərurəti tədqiqatın bütün iştirakçılarını bir-birinin təqdimatını fəal dinləməyə sövq edir. Təqdimat bir növ yeni biliklərin dairəsini cızır. Hələlik bu biliklər natamam və xaotik xarakter daşıyır. Bu mərhələdə yeni bir tələbat – həmin bilikləri qaydaya salmaq, sistemləşdirmək, müəyyən bir nəticəyə gəlmək üçün tədqiqat sualına cavab tapmaq zərurəti yaranır.

**IV mərhələ:** *İnformasiyanın müzakirəsi və təşkili.* Mürəkkəb mərhələ olub bütün zehni vərdişlərin, təfəkkürün müxtəlif növlərinin (məntiqi, tənqidi, yaradıcı) səfərbərliyini tələb edir. Müəllim fasilitasiya əsasında (yönəldici, köməkçi suallardan istifadə etməklə) əldə edilmiş faktların məqsədyönlü müzakirəsinə və təşkilinə kömək edir. İnformasiyanın təşkili bütün faktlar arasında əlaqələrin aşkara çıxarılmasına və onların sistemləşdirilməsinə yönəldilir. Nəticədə mövcud tədqiqat sualına cavabın ciz-

giləri aydın seçilməyə başlayır.

**V mərhələ:** *Nəticə, ümumiləşdirmə.* Beləliklə, şagirdlərə yeni bilginin kəşfi yolunda son addımı atmaq, konkret nəticəyə gəlmək və ümumiləşdirmənin tərifini vermək işi qalır. Bunun üçün şagird nəinki əldə olunan bilgiləri ümumiləşdirməli, həm də gəldiyi nəticəni tədqiqat sualı ilə (bu nəticə həmin suala cavab verirmi?) və irəli sürülmüş fərziyyələrlə (onların arasında düzgün olanı varmı?) müstəqil olaraq tutuşdurmalıdır. Bu, çox mühüm məqamdır. Dərsin kulminasiyasını isə bilgiləri məhz özləri kəşf etdikləri üçün şagirdlərin duyduqları bənzərsiz sevinc və məmnuniyyət hissi təşkil edir.

**VI mərhələ:** *Yaradıcı tətbiqetmə.* Məlum olduğu kimi biliklərin mənimsənilməsinin başlıca meyarı onun yaradıcı surətdə tətbiqidir. Yaradıcı tətbiqetmə biliyi möhkəmləndirir, onun praktiki əhəmiyyətini şagirdə, öyrənənə açıb göstərir. Buna görə müəllim imkan daxilində şagirdlərə təklif edə bilər ki, onlar müəyyən məsələlərin həlli üçün, yaxud hansısa yeni suallara cavab tapmaq üçün, qazanılmış bilikləri tətbiq etməyə çalışsınlar. Əgər yaradıcı tətbiqetmə dərhal mümkün deyilsə və əvvəlcə biliklərin mənimsənilməsi yolunu sona qədər (model üzrə tətbiqdən başlamış, yeni şəraitdə tətbiqə kimi) keçmək tələb olunursa, deməli bu yolu keçmək lazımdır. Ancaq son nəticədə yaxşı olar ki, şagirdlərə, onların kəşf etdikləri bilgilərin yaradıcı surətdə tətbiqinə dair çalışma verilsin. Bu halda öyrəndikləri həmişəlik onların şüurunda həkk olunar. Həmin mərhələ vaxt etibarilə yalnız bir akademik dərslə məhdudlaşdırılmaya da bilər, yəni onun həyata keçirilməsi sonrakı dərslərdə də mümkündür.

**VII mərhələ:** *Qiymətləndirmə və ya refleksiya.* Qiymətləndirmə istənilən prosesin təkmilləşdirilməsini təmin edən bir mexanizmdir. Təkmilləşmək üçün vaxtında öz qüsurlarını və nailiyyətlərini aşkar etmək, uğur qazanılmasına nələrin mane olduğunu və kömək etdiyini müəyyənləşdirmək vacibdir. Şagirdlərin təlim fəaliyyətinin qiymətləndirmə və refleksiya prosesləri məhz bu məqsədə xidmət etməlidir.

Qeyd olunduğu kimi, fəal təlimin mühüm xüsusiyyətlərindən biri müstəqil təlim (öyrətməyi öyrənmək), müstəqil inkişaf vərdişlərinə yiyələnmək imkanıdır. Dərs başa çatdıqdan sonra göstərilmiş proseslərdən birini − qiymətləndirmə və ya refleksiyanı həyata keçirərkən müstəqil öyrənmə proseslərini nəzərdən qaçırmamaqdır. Bunun nəticəsində öz öyrənmə fəaliyyətinin təkmilləşdirilməsi məqsədəuyğun sayılır.

Qiymətləndirmə və refleksiyanı dərsin müxtəlif mərhələlərinə daxil etmək olar. Belə yanaşma təlim prosesinin daha uğurla keçməsinə kömək edər. Müasir müəllimin

peşəkarlıq bacarığı təlimata müvafiq dərsin mərhələlərini tədris prosesində reallaşdırmasıdır.

Şagirdlərin işinin effektivlik dərəcəsinin kəmiyyət və keyfiyyətcə qiymətləndirilməsi müxtəlif üsul və formalarla həyata keçirilə bilər. Lakin müəllim yadda saxlamalıdır ki, qiymətləndirmə, ilk növbədə, şagird üçün özünüqiymətləndirmə və özünənəzarət vasitəsi rolunu oynamalıdır. Dərsdə mühüm məqsəd olan idrak fəallığının yaradılması və saxlanılması üçün mövcud olan dörd xüsusi psixoloji mexanizm daim müəllimin fəaliyyətində açar rolunu oynamalıdır. Bura aşağıdakılar daxildir:

**1. Problemli vəziyyətin yaradılması.** Şəxsiyyətə yönəlmiş təlim prinsipinə uyğun olaraq bu proses yalnız şagirdin tədqiqatçı mövqeyinə, onun idraki maraqlarına əsaslananda səmərəli olur. Bu mövqeyi yaratmaq üçün mərkəzi təlim prosesi – tədqiqat olmalıdır. Hər tədqiqat isə, ilk növbədə, problemin qoyulmasından başlanır.

Dərsdə fəal (interaktiv) təlim metodu təqdim edilən informasiyanın ziddiyyətli və yarımçıq olması səbəbindən əqli cəhətdən gərgin (problemli) vəziyyətin yaradılmasına əsaslanır. Bu cür vəziyyətin yaradılması şagirdləri qarşıya qoyulmuş məqsədə nail olmaq yollarını axtarmağa sövq edir və bununla da onların təfəkkürünü fəallaşdırır. Bu da öz növbəsində şagirdlərdə idrak fəallığı yaradır, onların tədqiqat fəaliyyətini artırır.

Problemli vəziyyət – məsələnin həllində ziddiyyətlərin, müxtəlif nöqteyi-nəzər və variantların mövcudluğunu ehtiva edir.

**2. Dialoqun və əməkdaşlığın zəruriliyi**. Problemin həlli zərurəti müxtəlif fərziyyə və baxışların nəzərdən keçirilməsini və ən optimal metodun tapılmasını tələb edir. Bu isə məhz təlim prosesinin digər iştirakçıları ilə fəal əməkdaşlıq prosesində ən effektiv şəkildə əldə oluna bilər. Buna görə mövcud təlim metodunu ifadə etmək üçün "problem" və ya "problem – dialoji" təlim kimi anlayışlardan istifadə olunur.

**3. Şagird − tədqiqatçı, müəllim – bələdçi (fasilitator).** İdrak fəaliyyətinin fəallaşdırılmasının ən başlıca mexanizmlərindən biri – ənənəvi təlim sxeminin dəyişdirilməsi, yəni ona tədqiqat xarakteri verilməsi; şagirdin biliklərin mənimsənilməsi prosesinin başlıca simasına, bərabərhüquqlu subyektinə çevrilməsidir. Bu da təlim prosesində şagirdlərin və müəllimin mövqelərinin və onların funksiyalarının dəyişdirilməsi hesabına əldə oluna bilər.

Şagirdin mövqeyi – "kəşf edən", "tədqiqatçı"lıqdır. O, gücü çatdığı məsələlər və problemlərlə üzləşərkən, bunları müstəqil tədqiqat prosesində həll edir. Bu zaman təlimin mühüm şərti qismində uşağın təlimin məqsədlərini şüurlu surətdə tərkib hissələrinə bölə bilməsidir. Yəni *nəyi dərk etməli, nə üçün dərk etməli, nəyi öyrənməli*,

*nə üçün öyrənməli*, *necə öyrənməli* və *bu hansı nəticələrə gətirib çıxara bilər* (*təlimin bəhrəsi necə olmalıdır*). Müəllimin mövqeyi – "bələdçi" (fasilitator), "aparıcı"dır (istiqamət verən). Fəal təlim prosesində müəllimin biliklərə aparan yolda bir bələdçi kimi əsas funksiyası, təyinedici rolu olan fasilitasiya (ingilis dilində "facilitation" – əlverişli şərait yaratma) adlanır. Bu müəllim liderliyinin yeni tipi olub, hər iki tərəfin təhsil məqsədinə nail olmağa yönəldilmiş birgə fəaliyyətinə əsaslanır. Bu zaman müəllim şəksiz nüfuz sahibi kimi sinif üzərində "ağalıq" etmir və özünü ondan yüksəkdə tutmur. Əksinə, o, sistemli, ardıcıl və məqsədyönlü şəkildə şagirdlərlə əməkdaşlıq edir. Problem-vəziyyəti təşkil edir, tədqiqat məqsədlərinin qoyuluşunda şagirdlərə istiqamət verir, bunların həllində metodik köməklik göstərir, biliklərin əldə edilməsi və mənimsənilməsi yollarını öyrədir. Müəllimin vəzifəsi – öyrənməyi öyrətməkdir. Yəni: təlim fəaliyyətinin əsas tərkib hissələrini mənimsəməkdə öyrənənə kömək edir, eyni zamanda özü biliklərin əldə edilməsinə və tətbiqinə dair zəruri əqli üsul və vasitələrə praktik cəhətdən yiyələnir. Bu deyilənlər müəllim üçün arzu yox, əsil vətəndaşlıq nümunəsi olmalıdır.

Təlim prosesinin mövcud sxemi fəallıq keyfiyyətinə malikdir. Hər bir şagirdin ona lazım olan bilikləri müstəqil əldə etməsinə və bütün həyatı boyu öyrənməyə qadir olan bacarıqlı, müstəqil tədqiqatçı kimi yetişməsinə kömək etmək üçün nəzərdə tutulub.

Lakin bu cür təlim sxemini həyata keçirmək üçün müəllim biliklərin qazanılması yolunda öz bələdçi roluna yiyələnməklə kifayətlənməməli, konkret funksiyalarını bilməli və bunları həyata keçirməyi bacarmalıdır. Bunun üçün o, ilk növbədə, fasilitasiya prosesinin mahiyyətini aydın başa düşüb dərk etməlidir. Fasilitasiya bir proses kimi yönəldici, köməkçi sualların effektli tətbiqinin köməyi ilə diskussiyaların təşkili və şagirdlərin fəallaşdırılması prosesindən ibarətdir. Fasilitasiyanın əsas xüsusiyyəti ondan ibarətdir ki, yeni bilgi müəllim tərəfindən deyil, şagirdlər tərəfindən aşkara çıxarılır. Fasilitatorun əsas mövqeyi düşüncəni inkişaf etdirmək və onu lazımi məcraya yönəltməkdən, məqsədi şagirdlərin öyrənmək və yaratmaq tələbatlarını tam ödəmək, onların öz potensialını həyata keçirə bilməsi üçün şərait yaratmaqdır.

**4. Psixoloji dəstək: hörmət və etibar.** Şagirdlərin fəal idrak mövqeyinin lazımi səviyyədə qalmasının zəruri şərti müəllimin hər bir şagirdə mərhəmətli, hörmətcil, fərdi münasibətindən, sinifdəki mühiti xüsusi həssaslıqla duymasından ibarətdir. Müəllimin xeyirxah münasibəti, hörməti, şagirdləri olduğu kimi qəbul etməsi, onları daim dəstəkləmək meyli, onların bacarıqlarına inam – bunların hamısı şagirdlərdə belə bir inamı möhkəmləndirə bilər ki, qarşıya qoyulmuş problemin həllində onun istənilən cəhdi yaradıcı fikir kimi qiymətləndiriləcək, ona ciddi və hörmətlə yanaşılacaqdır.

Təlimin psixoloji mühitinin məhz bu şəkildə dəyişdirilməsi halında uğursuzluq qorxusu və şagirdlərin idrak fəallığı dərs boyu lazımi səviyyədə qorunar.

Şagirdə hörmətlə yanaşma, ona etibar etmə, cavabların yaxşı və ya pis qiymətləndirilməsi ənənəsindən imtina edilmə onda özünə inam hissini, eyni zamanda müəllimə hörmət və etibarı daha da artırır.

Qeyd olunan mexanizmlərə aid prinsiplər müəllimin səriştə və peşəkar bacarıqları ilə fəal təlim metodlarından səmərəli istifadə etməklə həllini tapmış olur.

Tədris olunan fənn materialları öz müxtəlifliyi ilə seçilir. Bunu nəzərə alaraq, hər bir fənnin tədrisi zamanı müxtəlif təlim metodlarından istifadə edilir. Onlar mövzuya uyğunlaşdırılır, çünki fəal təlim əsasında qurulan dərsdə bir metodla kifayətlənmək çox vaxt mümkün olmur. Bir neçə təlim metodu qarşılıqlı əlaqədə tətbiq olunduqda təlim metodunun xarakteri ilə yanaşı, dərsin qarşısına qoyulan məqsəd, sinfin səviyyəsi nəzərə alındıqda səmərə yüksək olur. Təlim prosesində müəllim təşkiledici, əlaqələndirici, istiqamətverici və məsləhətverici, şagirdlər isə təcrübəçi, tədqiqatçı və yaradıcı subyektlər kimi fəaliyyət göstərirlər. Yeni təlim metodları ilə dərsin tədrisi zamanı bir sıra ənənəvi texnologiyalardan imtina edilir, yeni təlim metod və üsullarına üstünlük verilir. Dərs motivasiya ilə başlanır, şagirddə maraq oyadır, onu düşündürür, axtarışlar etməyə sövq edir, yaradıcılıq qabiliyyətini inkişaf etdirir. Dərsdə fəal təlim metodlarının və informasiya kommunikasiya texnologiyalarının istifadəsi ilə prosesin yeniləşməsi zamanı baş verən keyfiyyət dəyişiklərinə şagirdlərdə düşünmə qabiliyyətinin artması, İKT-dən istifadə bacarığının formalaşması, müstəqil tədqiqat işlərinin aparılması vərdişlərinin təkmilləşməsi, təhlil etmək, araşdırmaq, dərketmək və ümumiləşdirmək qabiliyyətinin inkişafı; ətrafda mövcud olan hər hansı bir obyektin əlamətlərini xarakterizə etmək; kompüter proqramları ilə tanış olmaq, şəxsi araşdırmalarını təqdimat şəklində göstərmək, auditoriya qarşısında sərbəst çıxışetmə qabiliyyəti və s. daxildir. Müasir təlim metodlarında kompüter tətbiq etməklə dərs sistemi də təkmilləşir, şagird yeni bilikləri əldə edən əsas sima və təlim subyektinə çevrilir. Belə ki, müəllim ənənəvi təlim sistemini dəyişib, onlara tədqiqatçılıq xarakteri verməklə hər bir şagirdə ona lazım olan bilikləri əldə etməsi üçün şərait yaradır. Son illərdə məktəb haqqında verilən qərarlar sayəsində təhsilin məzmunu yeniləşmiş, qarşıya qoyulan vəzifənin həllində xeyli işlər görülmüş və müsbət nəticələr əldə edilmişdir.

Məsələn, “Texnologiya” fənninin qarşısında duran əsas vəzifələrdən biri təlim-tərbiyə işinin keyfiyyətini yaxşılaşdırmaq və şagirdin əmək qabiliyyətini müasirləşdirməkdir. Qabaqcıl müəllimlər texnologiya dərslərində yalnız kompüterin əsaslarını öyrətməklə kifayətlənmir, həmçinin dərsdə öyrəndikləri nəzəri bilikləri təcrübəyə tətbiq etməklə şagirdlərdə bacarıq və vərdişləri formalaşdırırlar. Bu isə

texnologiya dərslərində əzbərçiliyə qarşı mübarizə aparmağa şərait yaradır. Hər bir şagird əyani olaraq dərsdə kompüterdən istifadə edir, gələcək fəaliyyəti üçün informasiya toplayır. Texnologiya fənninin məqsədi yeni sosial-iqtisadi şəraitdə şagirdlərin müstəqil həyata, kütləvi və perspektivli peşələrə hazırlanmalarını, ümuməmək bacarıq və vərdişlərinə yiyələnmələrini, yaradıcı düşüncə və aktiv fəaliyyət şəraitlərinə asanlıqla uyğunlaşmalarını təmin etməkdən ibarətdir.

Təhsilin hər bir səviyyəsində (ibtidai və ümumi orta) qeyd olunan məqsədin reallaşması üçün zəruri vəzifələr həyata keçirilməlidir. İbtidai təhsil səviyyəsində şagirdlərdə həmin vəzifələr konseptual sənəddə aşağıdakı kimi müəyyənləşdirilmişdir: müqayisə və çeşidləmə; ilkin emal; özünəxidmət və birgə fəaliyyət vərdişləri; sadə layihələndirmə, tərtibat, modelləşdirmə, dizayn, canlı təbiətə xidmət bacarıqları; ölçü, mütənasiblik, simmetriya və digər həndəsi anlayışlar formalaşdırılır; sadə konstruksiyalar və yaradıcı işlərin yerinə yetirilməsi üzrə qabiliyyətlərin aşılanması təmin olunur. Deməli, fənnin tədrisində əsas vəzifə texnoloji məsələlərlə bağlı təlim prosesində müvafiq zəruri vərdişlər, bacarıqlar, həndəsi anlayışlar formalaşdırıb qabiliyyətlər aşılamaqdır.

Aparılan müşahidələr göstərir ki, müəllim qarşıya qoyulan vəzifələrin pedaqoji prosesdə həllinə nail olmaqda çətinliklərlə üzləşir. Bunun əsas səbəbi mövzu ilə əlaqədar müəllimin nəzəri bilik və ona müvafiq praktik bacarığının aşağı səviyyədə olmasıdır. Bu sahədə yaranan problemin aradan qaldırılmasına köməklik etməyə xidmət edən müəyyən addımların atılmasına ehtiyac vardır. Onlardan ilkin olaraq biliyin kateqoriyalarını tətbiq etməyə alışmaqdır. Bu baxımdan çeşid, layihələndirmə, texnoloji emal, modelləşdirmə, dizayn, konstruksiya və bir çox anlayışların mahiyyəti deklorativ, prosedural və kontekstual olaraq dərk olunmalıdır. *Deklorativ bilik* prosesləri ehtiva etmir. Fənn və ya mövzu ilə bağlı mühüm informasiyalar kimi başa düşülür. *Prosedural bilik* prosesi əks etdirir. Bu bilik fənn üzrə mühüm vərdiş və proseslərin məcmusudur. *Kontekstual bilik* digər biliklərlə yanaşı, yeni məzmun təşkil edir. Yəni bu bilik hər hansı prosesdə əldə edilən yeni informasiya və ya müəyyən informasiyalara tətbiq edildikdə yeni məna alan əməliyyatlar kimi anlaşılır. Texnologiya fənninin məzmun xətləri üzrə fəndaxili üfüqi inteqrasiyada şagirdlər tədqiqatda aşağıdakı üç istiqamətdə bacarıqları mənimsəmiş olurlar: sadalama, adlandırma və tanıma; seçmə, müəyyənləşdirmə, fərqləndirmə, izahetmə, şərhetmə, təşkiletmə; münasibət bildirmə və hazırlama, əməletmə, tərtibetmə, təqdimetmə, nümayiş etdirmə, təsvirçəkmə bacarıqları. İnduktiv olaraq aparılan təhlildən aydın olur

ki, texnologiya fənninin tədrisi müəllimdən bələdçilik üçün hərtərəfli bilik, bacarıq, səriştə və peşəkarlıq tələb edir.

Dərsin keyfiyyətini yüksəltmək üçün daim təkmilləşdirmə işləri həyata keçirilir. Məktəbdə dərs dinləmələrinin aparılması, metodik işlərin əlaqələndiriliməsi, tərbiyə mübadiləsi, müxtəlif müsabiqələrin keçirilməsi, "ilin qalibi" kimi əməli tədbirlərin reallaşdırılması bütövlükdə təlim məqsədlərinin keyfiyyəti – pedaqoji texnologiyaların tətbiqi, interaktiv təlim metodlarından səmərəli istifadə müəllimin işini optimallaşdırır. Beləliklə, müəllim daha çox məntiqi ardıcıllıqla təlim məqsədlərinə nail olmağa müvəffəq olur. Aparılan müşahidə və dərs dinləmələrindən aydın olur ki, təlim məqsədləri daha çox təhsillənməyə yönəlir. Tərbiyəetmə və inkişafetdirmə kimi mühüm cəhətlərin təlimin məqsədlərində az yer alması narahatlıq doğurur. Müəllimin dərsi dinlənilərkən qanunda təsbit olunan (maddə 4) təhsilin əsas məqsədi diqqətdə saxlanılmalıdır. Tədris olunan fənnin məzmunundan asılı olmayaraq müəllim aşağıdakı tələbləri reallaşdırmalıdır.

4.0.1. "Azərbaycan dövləti qarşısında öz məsuliyyətini dərk edən, xalqının milli ənənələrinə və demokratiya prinsiplərinə, insan hüquqları və azadlıqlarına hörmət edən, vətənpərvərlik və azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək".

Müəllimlərin təlim-tərbiyəsinin planlaşdırılmasına aid, ibtidai təhsildə dərs nümunələri ilə tanış olarkən məqsədlə bağlı təsbit olunan müddəalara diqqət edək.

**Ana dili**

Mövzu: İsim

Məqsədlər: Hər bir əşyanın adı olduğunu şagirdlərə izah etmək.

Əşyaları adlandırmağın səbəbi barədə xüsusi isimlər haqqında məlumat vermək, ismin hallarını mənimsətmək.

**Riyaziyyat**

Mövzu: Kəsrlər

Məqsədlər: Şagirdlərə kəsr haqqında ümumi məlumat vermək, tam hissələrə bölmək qabiliyyətini aşılamaq. Kəsr xəttini izah etmək.

**Rəsm**

Mövzu: "Qar dənəcikləri"

Məqsədlər: Qar nə vaxt yağır və onun yağma səbəblərini, əhəmiyyətini izah etmək, rəsmini çəkmək.

**Fiziki tərbiyə**

Mövzu: "Karusel" oyunu

Məqsədlər: Azərbaycan xalq oyunları haqqında geniş məlumat vermək, onların mənəvi və fiziki sağlamlıqda rolunu izah etmək.

Qeyd olunan fənlər üzrə müəllimlərin tədris etdiyi mövzular ilə əlaqədar qarşıya qoyulan təlim məqsədləri dövlətin təhsil haqqında qarşıya qoyduğu vəzifələrin uğurlu həllinə yönəldilməlidir. Yəni müəllim, sistemləşdirilmiş bilik, bacarıq və vərdişlərin mənimsənilməsini və ixtisasının daim artırılmasını təmin etmək, təhsilalanları ictimai həyata və səmərəli əmək fəaliyyətinə hazırlamaqda peşəkar olmalıdır. Çin filosofu Konfutsinin (e.ə. 551-449): "Eşidirəm unuduram, görürəm – xatırlayıram, özüm edirəm – yadda saxlayıram (dərk edirəm)" müdrik kəlamı pedaqoji prosesdə maraqla tətbiq edilir. Müəllimin bələdçiliyi əsasında şagirdin müstəqil olaraq qarşıya qoyulan təlim məqsədlərinə yetirən nəticəni "kəşf" etməsi deyilən fikrin məntiqi mənası kimi başa düşülməlidir.

Gündəlik dərsin planlaşdırılması mərhələlərinə daxil olan: mövzu; standart; dərsin məqsədi; inteqrasiya; iş forması (qruplarla, fərdi, kollektiv və cütlər formasında iş aparıla bilər); iş üsulları (klaster, Beyin həmləsi, BİBÖ, Venn diaqramı və s.); resurslar üzrə təminat müəlimin peşə hazırlığına daxildir. Dərsin metodikası tələb olunan standarta, tədris olunacaq mövzuya uyğun müəyyənləşdirilir və təlim məqsədində reallaşdırılmalıdır. Bunun üçün də əvvəlcədən planlaşdırma aparılır.

Kurikulumun mahiyyəti haqqında müəllimlərdə müxtəlif yanaşmalar olması narahatlıq doğurur. Azərbaycan Respublikasının Təhsil Qanununda bu anlayış aydın şərh edilmişdir: "Təhsil proqramı (kurikulum) – təhsilin hər bir pilləsi üzrə təlim nəticələri və məzmun standartlarını, tədris fənlərini, həftəlik dərs və dərsdənkənar məşğələ saatlarının miqdarını, pedaqoji prosesin təşkili, təlim nəticələrinin qiymətləndirilməsi və monitorinqinin aparılması sistemini özündə əks etdirən dövlət sənədi" ("Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. Bakı, "Hüquq ədəbiyyatı", 2009). Təhsildə sertifikasiya aparılmasında müasirlik özündə müəllim tərəfindən "Qanun"da ifadə olunan hədəfləri nə dərəcədə bildiyi, anladığı, tətbiq etdiyi, təhlili, tərkibi və qiymətlənmə bacarıqlarını aşkar edir.

Müəllim xüsusi hazırlıq keçmiş və pedoqoji fəaliyyətlə peşəkarcasına məşğul olan, öz peşə borcunu keyfiyyətlə icra etmək üçün müəyyən olunmuş qaydada məsuliyyət daşıyır. Onun ən vacib keyfiyyətlərindən biri humanizmdir. Müəllim öyrənənlərin ahəngdar inkişaf etdirənidir. Tarixən qazanılmış təcrübədən tamamilə üz döndərmək olmaz. Müasirlik yeni dövrdə özünü doğrultmayan keçmiş təcrübəni texnoloji olaraq təkmilləşdirməkdir. Elm və Təhsil Nazirliyinin sertifikasiya ilə əlaqədar həyata keçirtdiyi məqsədyönlü tədbirlər təhsilverənlərin təlim strategiyası və metodikası sahəsində zəruri bilik və bacarıqlar mənimsəmələrinə motivasiya olmalarını təmin

etdiyi üçün təqdirəlayiqdir. Müasir təlim və metod üsulları fəal-interaktiv təlim texnologiyaları, interaktiv dərsin mərhələləri və ona verilən tələblər, kurikulumun mahiyyəti və məzmunu, innovativ pedaqoji fəaliyyətin xüsusiyyətləri təlim strategiyasına aiddir.

Təlim metodikası özündə fənnin tədris metodikası  sahəsində yeniliklər, pedaqoji prosesin təşkili prinsipləri, təlim fəaliyyətinin planlaşdırılması, təlimin təşkilinə verilən tələblər, bilik və bacarıqların qiymətləndirilməsi metodları, qiymətləndirmənin növləri və məqsədləri mövzuları ehtiva edir. Təlim strategiyası və təlim metodikası üzrə qeyd olunan müddəalar əsasında müəllim daim peşə hazırlığını təkmilləşdirməlidir. Müəllimləri sertifikasiya imtahan suallarının çətinlik səviyyəsi, məzmunu ilə bağlı narahat edən məsələlərdən AzEdu.az-a danışan tədqiqatçı alim, pedaqoq, prof. Fərrux Rüstəmov dəyərli tövsiyələri ilə maraq doğurur. O bildirir ki: “Müəllimlər nə ilə bağlı yoxlanacağını bilməlidirlər; hazırda dünya çox sürətlə inkişaf edir; universitet partası arxasında öyrənilən bilik bir neçə ildən sonra keyfiyyətini itirir; heç kim distant təhsilin bizə bu qədər vacib olacağını deyə bilməzdi; bu formaya hazır deyildik, məcburiyyətdən keçdik; ona görə də müəllim cəmiyyətin tələbatına, sosial sifarişə uyğun olaraq öz ixtisasına dair bilikləri artırmalı, yenilikləri mənimsəməli, dünyada baş verən proseslərdən baş çıxarmalı, şagirdlərin istək və arzularını nəzərə almalıdır. Sertifikasiya, yoxlama olmasa müəllimlər öz üzərində işləməyəcək, köhnə baza ilə gedəcəklər, bu da nəticədə istənilən keyfiyyəti verməyəcək. Amma burada bir məqamı da qeyd edim ki, sertifikasiya müəllimin işdən kənarlaşdırılması demək deyil. Əgər müəllim imtahandan keçə bilmirsə, nazirlik müfaviq proqram təklif etməli və müəllim kursdan keçməli, sonra yenidən sertifikasiyalaşdırmada iştirak etməlidir. Sertifikasiya imtahanında suallar orta məktəb proqramını əsas götürərək hazırlanmalıdır. Bundan əlavə, yeni metodika, pedaqogika, təhsil qanunvericiliyi nəzərə alınmalıdır”.

## Nəticə / Conclusion

Azərbaycan Respublikasında ümumi təhsilin konsepsiyası (Milli Kurikulumu) ictimai-siyasi, mədəni və sosial həyatın qloballaşdığı və universallaşdığı, informasiya-kommunikasiya texnologiyalarının rolunun artdığı, rəqabətin gücləndiyi müasir dövrdə ciddi dəyişiklikləri zəruri etmişdir. Təhsilalanın istedad və qabiliyyətinin müstəsna əhəmiyyət kəsb etdiyi nəzərə alınaraq, müstəqil qərarlar qəbul etməsi üçün onun təhsil səviyyəsinə və bacarıqlara malik olması müasir reallıqlardır. Təhsildə sertifikasiya ilə əlaqədar həyata keçirilən məqsədyönlü tədbirlər təhsilverənlərin təlim strategiyası və metodikası sahəsində bilik və bacarıqlar mənimsəmələrinə, motivasiya olmalarını təmin etməyə yönəlmişdir. Təhsildə sertifikasiya müasir təlim metod və üsulları, fəal-

interaktiv təlim texnologiyaları, müasir dərsin mərhələləri və ona verilən tələblər, kurikulumun mahiyyəti və məzmunu, innovativ pedaqoji fəaliyyətin xüsusiyyətlərini əks etdirən təlim strategiyasına müəllimin nəzəri hazırlığının deklorativ nailliyətidir. Bu prosesdə təlim metodikası praktik olaraq özündə fənnin aşılanması sahəsində yeniliklər, müasir pedaqoji texnologiyanın təşkili prinsipləri, təlim fəaliyyətinin planlaşdırılması və təşkilinə verilən tələblər, bilik və bacarıqların qiymətləndirilməsi üsulları, qiymətləndirmənin növ və məqsədləri aydınlaşdırılır. Təlim strategiyası və metodikası üzrə tətbiq olunan müddəalar əsasında müəllimin səmərəli fəaliyyəti onun peşə hazırlığını təkmilləşdirir və sertifikasiyada göstəricilərini yüksəldir.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Təhsilin Konsepsiyası (Milli Kurikulumu). Azərbaycan Respublikası Nazirlər Kabinetinin 30 oktyabr 2006-cı il tarixli 233 nömrəli qərarı ilə təsdiq edilmişdir.
2. İlyasov M. (2018). Müəllim peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri (Monoqrafiya). Bakı, Elm və təhsil. 208 s.
3. Ağayev Ş., Hacızadə R. (2020). Dərs: ənənə və müasirlik. Bakı, “MM-S”. 192 s.
4. Ağayev Ş. (2022). İbtidai sinif müəllimlərinə kömək. Bakı, İMZA. 184 s.
5. Ağayev Ş. (2022). Texnologiya və onun tədrisi metodikası (Bakalavriatlar üçün mühazirə mətnləri). Bakı, İMZA. 304 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2023, № 4 (278), 141–155
doi.org/10.48445/t4744-8325-4140-d



# İcmal mövzuların öyrənilməsinə yeni yanaşma

***Soltan Hüseynoğlu***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, "Ədəbiyyatın tədrisi metodikası" kafedrası, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: soltanhuseynoglu@mail.ru
https://orcid.org/0000-0003-4182-6653

**XÜLASƏ**
Məktəb ədəbiyyat kursunun əhatə etdiyi məsələlər çox olmaqla yanaşı, məzmunca da mürəkkəbdir. Bu, həmin kursla bağlı ardıcıl araşdırmaların aparılmasını zəruri edən mühüm cəhətlərdəndir. Məsələnin başqa tərəfi də var: yeni təlimi yanaşmaların, texnologiyaların bir-birinin ardınca meydana çıxması tədqiqatların səngimədən aparılmasını tələb edir. Deyilənlərdən bu da aydın olur ki, metodikanın bir sıra problemlərinin üzərinə yenidən qayıtmaq, çağdaş elmi fikirlərin işığında onlara fərqli nəzərlə baxmaq faydalıdır. Belə mühüm sahələrdən biri tarixi-ədəbi materiallar – icmal mövzularıdır. Ədəbiyyat tarixinin keçdiyi uzun inkişaf yolunu əhatə edən icmal materialları fakt bolluğu, məzmun zənginliyi ilə seçilir. Müəyyən tarixi dönəmin sosial-siyasi vəziyyətini, ədəbi-mədəni mənzərəsini əks etdirən icmal mövzuların tədrisi də, mənimsənilməsi də asan deyildir. Bu mövzuların tədrisi ilə bağlı ciddi hazırlıq işlərinin aparılması, şagirdlərin müstəqilliyinin diqqət mərkəzində saxlanılması vacibdir. Məqalədə icmal mövzuların tip və variantları üzərində daha çox dayanılmış, öyrədilməsi ilə bağlı fərqli yolların şərhinə geniş yer verilmişdir.

**AÇAR SÖZLƏR**
icmal, icmal mövzular, əsli icmallar, monoqrafik mövzular, inteqrasiya

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 03.10.2023
qəbul edilib: 30.11.2023

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2023, NO. 4, VOL. 278, 141–155
doi.org/10.48445/t4744-8325-4140-d

**AZERBAIJAN EDUCATION**

# A new approach to the study of overview topics

***Soltan Huseynoghlu***
Doctor of Philosophy in Pedagogy, Associate Professor, Department of "Literature Teaching Methodology", Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: soltanhuseynoglu@mail.ru
https://orcid.org/0000-0003-4182-6653

**ABSTRACT**
The issues covered by the school literature course are not only numerous, but also complex in content. This is one of the important aspects that make it necessary to carry out consistent research on that course. There is another side to the issue: the emergence of new teaching approaches, technologies one after the other makes it important to carry out research without slowing down. From what has been said, it is clear that it is useful to return to a number of problems of methodology, to look at them from a different perspective in the light of modern scientific ideas. One of such important areas is historical-literary materials − review topics. Review materials covering the long development path of literary history are distinguished by the abundance of facts and richness of content. It is not easy to teach and master general topics that reflect the socio-political situation, literary and cultural landscape of a certain historical period. It is important to carry out serious preparatory work related to the teaching of these subjects, and to keep students' independence in the center of attention. The article focuses more on the types and options of the overview topics, and the interpretation of different ways of teaching them is given a lot of space.

**KEYWORDS**
review, review topics, original reviews, monographic topics, integration

**ARTICLE HISTORY**
Received: 03.10.2023
Accepted: 30.11.2023

## Giriş / Introduction

Ədəbiyyat təliminin materialları yuxarı siniflərdə (X−XI) *monoqrafik* və *icmal* olmaqla iki mövzuda əhatə olunur. Monoqrafik mövzu sənətkarın həyatını, yaradıcılığı haqqında ümumi məlumatı, bir, bəzən də iki əsərinin ətraflı öyrənilməsini özündə ehtiva edir. Monoqrafik mövzular aşağıdakı şəkildə ifadə olunur: "N.Gəncəvi. Həyatı, yaradıcılıq yolu. "İskəndərnamə" poeması" (X sinif); "Ə.Cavad. Həyatı, yaradıcılıq yolu. "Səsli qız" poeması" (XI sinif) və s. Bu tip materiallara bəzən sənətkar haqqında *oçerk* də deyilir.

İcmal mövzularda isə, əsasən, bu və ya digər dövrün sosial-siyasi vəziyyəti, tarixi-ədəbi mənzərəsi öz əksini tapır. Sual yaranır: İcmal mövzuların öyrənilməsinin əhəmiyyəti nədir?

Bu sualın cavabını aydın təsəvvür etmək üçün icmal mövzuların konkret əhatə dairəsi, məzmunu barədə məlumatlı olmaq vacibdir. Bəllidir ki, "icmal" sözü *xülasə, müxtəsər, yığcam, ümumiləşdirilmiş şəkildə* və s. anlamda başa düşülür. Deməli, icmal mövzularda təlim materialının geniş, əhatəli təqdiminə yer verilmir. Bəs bu materiallara nələr daxildir? İcmal mövzuların məzmununu nə təşkil edir?

## Əsas hissə / Main part

Sovet dönəmində Azərbaycanda metodika üzrə çap olunmuş dərsliklərdə bu mövzuya diqqət yetirilməmişdir. Həmin dövrdə rus dilində ən geniş yayılmış dərsliklərdə [məsələn: Методика преподавания литературы. Под. редакцией З.Я.Рез. М.: «Просвещение», 1985, с.368] icmal mövzuların adlandırılmasında, tip və variantlarının müəyyənləşdirilməsində ziddiyyətli fikirlərə yer verilmişdir. Göstərilən kitabda icmal mövzular şərti olaraq iki tipə ayrılır:

− məxsusi (xüsusi) icmal mövzular;
− bir neçə sənətkarın yaradıcılığı haqqında məlumatı əks etdirən icmal mövzular.

Müstəqillik illərində ölkəmizdə metodika üzrə çap olunmuş dərsliklərdə fərqli vəziyyət müşahidə edilir. İcmal mövzuların tədrisi yolları dərsliklərdə ayrıca başlıq altında əhatə olunur. Müəyyən çatışmazlıqlar da müşahidə edilir. Məsələn, yazıçının *tərcümeyi-halının, yaradıcılığı haqqında ümumi məlumatın* öyrənilməsi icmal mövzu kimi təqdim edilir. Halbuki yazıçının həyatı və yaradıcılığı haqqında ümumi məlumatın öyrənilməsi monoqrafik mövzunun tərkib hissəsidir. Deməli, *icmal xarakterli təlim materialı* ilə icmal mövzuların qarışdırılması yanlışdır.

Ayrı-ayrı siniflərin dərsliklərindəki "Giriş" başlıqlı materiallar xarici ədəbiyyatda icmal mövzular hesab edilmir.

Yeni təhsil proqramının (kurikulumun) əsasında yazılmış və 2012-ci ildən başlayaraq çap olunan "Ədəbiyyat" dərslikləri ayrıca başlıqla fərqləndirilən girişlə başlanır:

- Bədii ədəbiyyat söz sənətidir (V sinif).
- Ədəbiyyat insanı zənginləşdirən vasitədir (VII sinif).
- Qədim və zəngin ədəbiyyatımız (VIII sinif).
- Həyat həqiqətləri və zəngin ədəbiyyatımız (IX sinif).
- Söz sənətimiz – mənəvi sərvətimiz (X sinif).
- Xalqımızın taleyinə bağlı ədəbiyyat (XI sinif).

Bu materialları icmal mövzular hesab etmək olarmı? Suala həmin materialların məzmunundan çıxış etməklə cavab vermək mümkündür. Bu materialların hamısında bədii ədəbiyyat, onun mahiyyəti, mövzu dairəsi, mənəvi-estetik tərbiyədə, insan həyatında rolu barədəki təsəvvürlərin zənginləşdirilməsi diqqət mərkəzində saxlanılmışdır. VIII−IX siniflərin giriş materiallarında, həmçinin ədəbiyyatımızın inkişaf yolu haqqında yığcam fikirlər səsləndirilmişdir. *Bütün bunlar icmal mövzuların məqsəd və vəzifələrini tam əhatə etmir*. Elə buna görə də "Giriş"ləri *şərti olaraq* icmal mövzular adlandırmaq doğru olardı.

VIII−IX siniflərin dərsliklərinə daxil edilmiş digər oxşar materialları da xatırlatmaq vacibdir. Məlumdur ki, bu siniflərdə ədəbiyyat *xronoloji* ardıcıllıq gözlənilməklə tədris edilir. Yəni ədəbiyyatımızın qədim dövrlərdən başlayaraq keçdiyi inkişaf yolu izlənilir. Bu, ədəbiyyat tarixinin ayrı-ayrı dövrlərində özünü göstərən ədəbi prosesin aydınlaşdırılmasını bir vəzifə kimi qarşıya qoyur. Başqa sözlə, yığcam da olsa, icmal mövzulara yer verilməsi zərurəti ortaya çıxır. Beləliklə, VIII sinfin dərsliyində "Qədim dövr Azərbaycan ədəbiyyatı", "İntibah dövrü ədəbiyyatı" və s. mərhələlər əks etdirilmişdir. Eləcə də IX sinfin dərsliyində "Azərbaycanda milli-demokratik hərəkat dövründə ədəbiyyat", "Sovet dövrü Azərbaycan ədəbiyyatı" və s. mərhələlərə yer verilmişdir. Bu materiallar icmal mövzuların tələblərinə cavab verir və onları *mini icmallar* adlandırmaq yerinə düşər.

Bəs yuxarı siniflərdə (X−XI) icmal mövzuların məzmununu hansı materiallar təşkil edir?

İcmal mövzular, sözün tam və geniş mənasında məhz bu siniflərdə tədris edilənlərdir. Onların əsasında isə ədəbiyyat tariximizin dövrləri – inkişaf mərhələləri dayanır. Ədəbiyyat yuxarı siniflərdə *tarixi-ədəbi prinsip* əsasında tədris olunduğundan dövrləşdirmə X sinifdən başlayaraq ayrı-ayrı mərhələlər kimi dərsliyə daxil edilir.

Ədəbiyyat tarixinin son dövrləşdirilməsi yuxarı siniflərin (X−XI) dərsliklərinə aşağıdakı məzmunda daxil edilmişdir:

– Qədim dövr Azərbaycan ədəbiyyatı. Etnosdan-eposadək (ən qədim dövrlərdən VII əsrə qədər);
– Azərbaycan yazılı ədəbiyyatının ortaq başlanğıc dövrü (VII–X əsrlər);
– İntibah dövrü Azərbaycan ədəbiyyatı (XI–XII əsrlər);
– Orta əsrlər Azərbaycan ədəbiyyatı (XIII–XVI əsrlər);
– Azərbaycan ədəbiyyatında erkən realizm dövrü (XVII–XVIII əsrlər);
– Azərbaycan ədəbiyyatında maarifçi realizm dövrü (XIX əsr);
– Azərbaycan ədəbiyyatında tənqidi realizm və romantizm epoxası (XIX əsrin 90-cı illərindən Azərbaycanda sovet hakimiyyətinədək);
– Azərbaycan ədəbiyyatında sosialist realizmi dövrü (1920–1960-cı illər);
– Milli-mənəvi özünüdərk və istiqlal ədəbiyyatı mərhələsi. Modernizm (1960−1980-ci illər);
– Müstəqillik dövrü çoxmetodlu Azərbaycan ədəbiyyatı (1991-ci ildən bu günə kimi).

Deməli, bu mərhələlərin hər biri bir icmal mövzusunun materialı qismində özünü göstərir.

Bəs icmalların tip və variantlarını necə müəyyənləşdirmək məntiqli olar?

Mövcud ədəbiyyat dərsliklərinin məzmunu nəzərə alınmaqla icmalların aşağıdakı tip və variantlarını müəyyən etmək mümkündür:

− Giriş (şərti) icmallar (V−IX siniflər);
− Mini icmallar (VIII−IX siniflər);
− Əsli icmallar (X−XI siniflər).

Əsli icmalları məzmununa görə, şərti olaraq, iki növə ayırmaq olar:

a) Dövrün sosial-siyasi, tarixi-ədəbi və mədəni mənzərəsini geniş əks etdirən icmallar.

b) Daha çox bir neçə sənətkarın yaradıcılığının ümumi mənzərəsini əks etdirən icmallar.

İlk suala (İcmal mövzuların öyrənilməsinin əhəmiyyəti nədir?) qayıdaq. Təsəvvür edək ki, X sinifdə N.Gəncəvinin, Ş.İ.Xətainin, İ.Nəsiminin, M.Füzulinin, M.P.Vaqifin həyatı, yaradıcılığı bir-birinin ardınca – monoqrafik mövzular olmadan öyrənilir. Bu zaman nəticə necə olacaq?

− Ədəbiyyatda varislik aydın təsəvvür edilməyəcək.
− Ənənə və novatorluq barədə təsəvvür çox zəif olacaq.
− Bu sənətkarların bağlı olduqları tarixi dövr, sosial-siyasi vəziyyət, ədəbi mədəni mənzərə mənimsənilməmiş qalacaq.
− Həmin yazıçıların dünyagörüşünün, yaradıcılığındakı özünəməxsusluğun formalaşmasına təsir edən ədəbi proseslər barədə məlumat mənimsənilməyəcək.

– Yazıçıların bu və ya digər əsərinin yaranma səbəbi aydınlaşdırılmamış olacaq.
– Ədəbiyyatın inkişafı, keçdiyi tarixi yol barədə təsəvvür qazanılmayacaq.
– Müxtəlif dövrlərin qarşılıqlı əlaqələri öyrənilməmiş qalacaq.
– Sənətkarların yaradıcılığını birləşdirən ideyalar açıqlanmayacaq və əlaqələndirilməyəcək.
– Məktəb ədəbiyyat kursunun tamlığı, bütövlüyü təmin edilməyəcək.

Buradan aydınlaşır ki, ədəbiyyat fənninin qarşısında duran vəzifələrin yerinə yetirilməsi icmal mövzuların öyrənilməsindən əhəmiyyətli dərəcədə asılıdır. Bu mövzular şagirdlərə ədəbiyyatımızı bir-birindən təcrid olunmuş dövrlər, mərhələlər kimi deyil, daim inkişafda olan, dəyişən, zənginləşən proses kimi görməyə, ayrı-ayrı sənətkarların həyat və yaradıcılığını monoqrafik şəkildə öyrənməyə və düzgün elmi əsaslarla dərk etməyə imkan yaradır. Eləcə də mühüm və davamlı ədəbi hadisələr barədə mənimsənilən biliklər məhz icmal mövzuların sayəsində sistemli xarakter alır, uzun inkişaf yolu keçmiş ədəbiyyat tarixi barədə dolğun təsəvvür qazanılır.

Əsli icmalların (X və XI siniflər) tədrisi həmişə müəyyən çətinliklərlə müşayiət olunub. Sovet dönəmində bu icmalların həcmi geniş, ona ayrılan saatlar çox olub. Xeyli sayda faktların sadalanması, onlarla sənətkarın və bədii əsərlərinin adının xatırladılması, fərqli məzmunda məlumatların əvəzlənməsi və s. bu materialların tədrisini də, mənimsənilməsini də çətinləşdirib. Bu vəziyyət 1990-cı illərdə, eləcə də 2000-ci illərin əvvəllərində, əsasən, dəyişilməz qalıb. İcmal materialların həcminin, məzmununun şagirdlərin yaş və bilik səviyyəsinə uyğunlaşdırılması yeni təhsil proqramının – kurikulumun əsasında yazılmış dərsliklərdə gerçəkləşdirilmişdir. Belə ki, X və XI siniflərin dərsliklərinə daxil edilmiş icmal mövzuların həcmi və onların tədrisinə ayrılmış saatlar əhəmiyyətli dərəcədə azaldılmış, öyrənmədə şagirdlərin tədqiqatçı mövqeyində olmaları təmin edilmişdir.

Əsli icmalların, xüsusən birinci növün qarşısında duran başlıca vəzifə müəyyən dövrün *tarixi, ədəbi, mədəni həyatı və sosial-siyasi vəziyyəti* barədə dolğun təsəvvür yaratmaqdır. Bu, həmin dövrdə mövcud olan ədəbi prosesin mahiyyətinin və ideya istiqamətinin başa düşülməsinə əhəmiyyətli təsir edir. Deməli, tarixi, eləcə də ədəbi fakt və hadisələrin sadalanmasına, geniş şərhinə aludə olmaq məqsədəuyğun deyildir. Buna dərs saatı da imkan vermir. Unudulmamalıdır ki, icmal mövzularında başlıca məqsəd ədəbiyyatın müəyyən mərhələdəki mahiyyətinin, ideyasının, söz sənətinin inkişafına verdiyi töhfənin, tarixi dönəmə münasibətinin aydınlaşdırılması olmalıdır. Elə buna görə də tarixi fakt və hadisələrdən danışılanda belə dövrün ifadəçisi olan sənət əsərlərini (bədii əsərlərdən fraqmentlər, musiqi parçaları, rəssamlıq nümunələri və s.) nümayiş etdirmək faydalıdır. Ən başlıcası tarixi fakt və hadisələrin mahiyyətinin

ədəbiyyatın vasitəsilə açıqlanmasıdır. Məsələn, XX yüzilliyin əvvəllərində elm və təhsillə bağlı Azərbaycandakı vəziyyəti, mübahisələri, fərqli mövqeləri bədii əsərlərdən müəyyən məqamların şərhi əsasında açıqlamaq daha faydalıdır. Yaxud həmin dövrün mühüm tarixi hadisələrinə "Molla Nəsrəddin" və "Füyuzat" jurnallarının münasibəti baxımından aydınlıq gətirmək həm maraqlı olar, həm də səmərəli... Deməli, belə hallarda tarixi və ədəbi hadisələri bir-birindən təcrid olunmuş şəkildə təqdim etmək doğru olmaz. Onlar tamın hissələri kimi özünü göstərməli, bir vahid halda çatdırılmalı və qavranılmalıdır.

Əsli icmalların hər iki növünün tədrisində diqqət yetirilməli olan məsələləri nümunələr əsasında nəzərdən keçirək. Qeyd olunduğu kimi, əsli icmallardan birincisi – dövrün sosial-siyasi, tarixi-ədəbi və mədəni mənzərəsini geniş əks etdirənlər məzmunca daha zəngin olub, faktların bolluğu ilə də seçilir. Bu icmalların tədrisində bütün faktlar, məlumatlar, qeyd edildiyi kimi, dövrün ədəbiyyatının mahiyyətini, ideya istiqamətini, bütövlükdə ədəbiyyat tarixinə verdiyi töhfəni aydınlaşdırmağa xidmət etməlidir. İcmalın bu növünə X sinifdə tədris olunan "Azərbaycan ədəbiyyatında maarifçi realizm dövrü (XIX əsr)" mövzusunu nümunə göstərmək olar. İlk növbədə mövzunun əhatə etdiyi məsələlərə nəzər salaq:

- XIX yüzillikdə Azərbaycanda ictimai-siyasi vəziyyət.
- Ölkədə vahid dövlət yaratmaq təşəbbüslərinin nəticəsiz qalması və bunun ağır fəsadları.
- İran və Rusiyanın Azərbaycan uğrunda müharibələri.
- Azərbaycanın parçalanması – "Gülüstan" və "Türkmənçay" sülh müqavilələri.
- Rusiyanın Azərbaycandakı mənfur müstəmləkə siyasəti.
- Rusiyanın iqtisadi həyatındakı inkişafın Azərbaycanda əks-səda tapmaması.
- Azərbaycanı idarə etmək məqsədilə rus dilində qəza məktəblərinin açılması.
- Əsrin ikinci yarısından başlayaraq Rusiya və xarici kapitalistlərin Azərbaycana sərmayə qoymalarının iqtisadiyyatda müəyyən canlanmaya səbəb olması.
- Ucqarların iqtisadi inkişafdan kənarda qalması.
- İqtisadi dəyişikliyin təhsil və mədəniyyət sahəsində müəyyən dirçəlişə təkan verməsi.
- Ədəbiyyatda yeni ədəbi növ və janrların, milli teatrın yaranması.
- Milli mətbuatın yaranması.
- Ədəbiyyatda ilk maarifçilik ideyalarının yaranması və tədricən güclənməsi.
- Şifahi və yazılı ədəbiyyatın qarşılıqlı əlaqəsi.
- Əsrin ikinci yarısında şeir məclislərinin yaranması.

– Realist ədəbiyyatın müxtəlif bədii formalarda yaradılması.

Göründüyü kimi, X sinfin "Ədəbiyyat" dərsliyində verilmiş icmal materialında XIX yüzillikdə Azərbaycanda mövcud olan ictimai, iqtisadi, siyasi, ədəbi, mədəni vəziyyət barədə təsəvvür yaradılıb. Əlbəttə, belə mürəkkəb məzmunu əks etdirən mövzunu səmərəli tədris etmək və əhatəli mənimsənilməsinə nail olmaq asan deyil. Bunun üçün ciddi hazırlıq işlərinin aparılması, şagirdlərin müstəqil fəaliyyətinin təşkil edilməsi, əlavə material və mənbələrə müraciət olunması vacibdir. İlk növbədə "Azərbaycan tarixi" fənnindən öyrənilmiş biliklərin tətbiq edilməsinə şərait yaradılmalıdır. "Ədəbiyyat" dərsliyində dövrün ictimai-siyasi vəziyyəti, vahid dövlət yaratmaq təşəbbüslərinin iflası, İran-Rusiya müharibələri, sülh müqavilələri və bunların xalqımız üçün faciəli nəticələri barədə verilmiş yığcam məlumatın faktlar əsasında zənginləşdirilməsində tarix fənnindən öyrənilmiş biliklər əhəmiyyətli dərəcədə rol oynayır. Tarix dərsliyində həmin dövrün ədəbi-mədəni mənzərəsinin təsvirinə yer verilməsi də diqqətdən kənarda qalmamalıdır.

Bu inteqrasiyanı necə təşkil etmək faydalı olar?

Bu məqsədlə şagirdlərin müstəqil işinin təşkili məqsədəuyğundur. Müstəqil iş üçün tapşırığın şagirdlərə hələ dərsəqədər təqdim edilməsi onların fəaliyyətinin məhsuldar olması, müzakirədə fəallıq göstərmələri baxımından səmərəlidir. Bu, dərsin dialoq, diskussiya zəminində keçməsinə imkan yaradır. Yaradılmış kiçik qruplara mövzunun araşdırılmasını tələb edən fərqli məzmunda tapşırıqlar təqdim edilir. Bir variant aşağıdakı məzmunda ola bilər:

**Tapşırıq 1.**

1. XIX yüzilliyin əvvəllərində Azərbaycanda ictimai-siyasi vəziyyət necə idi?
2. Ölkədə vahid dövlət yaratmaq nə üçün mümkün olmadı?
3. Azərbaycanın ikiyə bölünməsi onun taleyinə necə təsir etdi?
4. Bütün bunların Azərbaycanın mədəniyyətinə, ədəbiyyatına hansı təsiri oldu?

**Tapşırıq 2.**

1. Rusiyanın Azərbaycandakı müstəmləkə siyasətini necə əsaslandırarsınız? Fikrinizi təsdiq edən nümunələr göstərin.
2. Rusiya imperiyası Azərbaycanda təhsillə bağlı hansı siyasəti həyata keçirirdi? Bunun əsasında hansı niyyət dayanırdı?
3. Əsrin ikinci yarısında Azərbaycana rus və xarici kapitalistlərin qoyduqları sərmayənin nəticəsi necə oldu?
4. Baş verən ictimai-siyasi hadisələr həmin dövrdə yaranan ədəbiyyata necə təsir edirdi?

**Tapşırıq 3.**

1. Bədii ədəbiyyatın məzmun və formasında hansı yeniliklər baş verdi?
2. Milli teatrın, milli mətbuatın yaranmasının əhəmiyyətini nədə görürsünüz?
3. Şifahi və yazılı ədəbiyyatın əlaqəsinin, şeir məclislərinin yaranmasının ədəbiyyatın inkişafına təsiri necə oldu?
4. XIX yüzillikdə realist ədəbiyyat hansı bədii formalarda yaradılırdı?

Bu tapşırıqlara hazırlanmış cavabların dinlənilməsi, müzakirəsi əsasında dərsin təşkili, qeyd olunduğu kimi, səmərəli olmaqla yanaşı, ciddi hazırlıq işlərinin aparılmasını da tələb edir. Şagirdlərdə ilk növbədə mənbələrlə işləmək bacarığının formalaşdırılması vacibdir. Məlumatın toplanması, müqayisə əsasında ən zəruri olanların seçilməsi, təhlil edilməsi, dərslikdəki məlumatla uzlaşdırılaraq təqdimatın hazırlanması və s. şagirdlərdən tədqiqatçı mövqeyində dayanmağı tələb edir. Belə bir bacarığın formalaşdırılması isə işin ardıcıl, məqsədyönlü aparılması sayəsində mümkündür.

Əsli icmalın ikinci növünə – bir neçə sənətkarın yaradıcılığının ümumi mənzərəsini əks etdirənlərə nümunə olaraq "Orta əsrlər Azərbaycan ədəbiyyatı" mövzusunu göstərmək olar. Bu icmal mövzusunda dövrün tarixi, ictimai, siyasi, ədəbi, mədəni mənzərəsi barədə verilmiş məlumat yığcam olsa da, aydın təsəvvürün yaradılması baxımından əhəmiyyətlidir. Maraqlı məqam isə həmin dönəmdə baş verənlərin qarşılıqlı əlaqələrinə diqqətin çəkilməsidir: " XIII−XIV əsrlər xalqımızın tarixində mühüm ictimai-siyasi hadisələrlə zəngin bir dövr kimi səciyyələnir. Müharibələr, yadelli işğalçıların dağıdıcı hücumları, hakimiyyət başındakı sülalələrin bir-birini əvəz etməsi həmin dövrün mühüm hadisələri idi. Ziddiyyətlərə baxmayaraq, ədəbiyyatımız və mədəniyyətimiz möhkəm təməl əsasında inkişaf edir, yeni keyfiyyət qazanırdı" [1, s.57].

XIII−XIV əsrlərdə Azərbaycandakı mövcud vəziyyət barədə dərslikdə verilmiş yığcam məlumat tarix dərsindən, əlavə mənbələrdən əldə edilmiş biliklərin əsasında zənginləşdirilir.

XV−XVI əsrlərdə müstəqil Qaraqoyunlu, Ağqoyunlu və Səfəvi dövlətlərinin yaranması, hökmdarların ana dilinə önəm vermələri, nəticədə farsca yazmaq ənənəsinin zəifləməsi həmin dövrün səciyyəvi cəhətləri kimi ön plana çəkilir.

Dərslikdəki icmal materialı aşağıdakı mətnkənarı suallara yığcam cavabların verilməsi əsasında davam etdirilir:

− İ.Həsənoğlunun əsərləri hansı səbəblərə görə dəyərli hesab olunur?

− "Dastani-Əhməd Hərami" poemasında əksini tapmış mühüm problemlər və başlıca ideyalar hansılardır?

- Qazi Bürhanəddinin yaradıcılığını ədəbiyyatımız üçün dəyərli edən hansı cəhətlərdir?
- Həbibinin poeziyasında hansı mənəvi-əxlaqi dəyərlər əksini tapıb?
- Qurbaninin əsərlərində hansı problemlərə toxunulub?

Göründüyü kimi, mövzuda əhatə olunan məsələlər geniş olmaqla yanaşı, həm də mürəkkəbdir. Adları çəkilən sənətkarların hər birinin həyat və yaradıcılığı ayrıca monoqrafik mövzu kimi öyrənilməyə layiqdir. Deməli, bu barədə təsəvvürün yaradılması yalnız şagirdlərin müstəqil işinin səmərəli təşkili, bədii mətnlərə, müvafiq mənbələrə müraciət olunması ilə mümkündür. Əks halda, şagirdlər dərslikdəki materialı öyrənib təkrar etməklə kifayətlənəcəklər. Bu isə ilk növbədə həmin sinifdə ədəbiyyat təliminin prinsiplərinə və dərsliyin konsepsiyasına ziddir. Sual yaranır: Bu tip icmalların öyrənilməsini səmərəli şəkildə necə təşkil etmək olar?

Əlbəttə, bu məqsədlə fərqli metodik yollara müraciət etmək mümkündür. Daha effektli yol, qeyd olunduğu kimi, şagirdlərin müstəqilliyinə önəm verilməsidir. Bu isə dərsə bir neçə gün qalmış hazırlıq işlərinə başlanmasını zəruri edir. Hazırlıq mərhələsində şagirdlər fərqli mənbələrə baxmalı, ayrı-ayrı sənətkarların yaradıcılığından nümunələr seçərək mənimsəməlidirlər. Belə bir mürəkkəb və böyükhəcmli işin həyata keçirilməsi yalnız ayrı-ayrı kiçik qrupların müstəqil işinin təşkili ilə mümkündür. Qruplar üçün hazırlanmış tapşırıqlar bir-biri ilə əlaqəli olub, mövzunun bütövlükdə mənimsənilməsinə imkan yaratmalıdır. Tapşırıq üzrə tədqiqatın aparılmasına müəllim nəzarət etməli, ehtiyac yaranan məqamlarda yardımçı olmalıdır. Kiçik qrupların icra edəcəkləri tapşırıqların bir variantı aşağıdakı məzmunda ola bilər:

**Birinci qrup**

**Tapşırıq**

1. İ.Həsənoğlunun ədəbi irsi hansı əsərlərdən ibarətdir, onlarda, başlıca olaraq, nədən danışılır?
2. Şair mənbələrdə necə təqdim olunur, yaradıcılığı barədə daha çox vurğulanan cəhətlər hansılardır?
3. “Apardı könlümü...” qəzəlinin məzmunu, ideyası barədə hansı nəticələrə gəldiniz? Fikrinizi nümunələrlə əsaslandırın.

Dərslikdə bu sualların cavabı yalnız istiqamətləndirici xarakterdədir. Şagirdlər dərslikdə göstərilmiş mənbələr, eləcə də digər resurslardan istifadə ilə tapşırığa əhatəli cavab hazırlamağa yönləndirilirlər. Dərslik və mənbələrdən əldə edilərək yazılı qeydlərin əsasında formalaşdırılan məlumat şifahi təqdimatın məzmununu təşkil edir.

İkinci qrupun tapşırığı dərslikdəki materialın strukturuna uyğun olaraq, “Dastani-Əhməd Hərami” poeması ilə bağlı olur.

**İkinci qrup**

**Tapşırıq**

1. "Dastani-Əhməd Hərami" poeması ədəbiyyat tariximiz üçün hansı cəhətlərinə görə qiymətlidir?

2. Poemanın mövzusunu və əsas ideyasını necə izah edərsiniz?

3. Əsərdə şifahi xalq ədəbiyyatı ilə səsləşən hansı cəhətləri müşahidə etdiniz?

Həcmi kiçik olduğundan qrup üzvlərinin hər birinin poemanı mütaliə etməsi məqsədəuyğundur. Bu, tapşırığın yerinə yetirilməsində şagirdlərin maksimum fəallığının təmin edilməsinə səbəb olur.

Əsər doğma türkcəmizdə olan epik poeziyanın ilk örnəklərindən biri kimi qiymətlidir. Poemada insanları bu gün də düşündürən yüksək humanist dəyərlərin ifadə edilməsi istər tədqiqat mərhələsində, istərsə də müzakirə zamanı diqqət mərkəzində saxlanılır.

Üçüncü qrup Qazi Bürhanəddinin yaradıcılığı ilə bağlı işləyir. Tapşırığın aşağıdakı variantda təklif edilməsi məqsədəuyğundur.

**Üçüncü qrup**

**Tapşırıq**

1. Q.Bürhanəddinin yaradıcılığı üçün səciyyəvi olan cəhətlər hansılardır?
2. Tuyuqlarında şairin daha çox önəm verdiyi məsələlər hansılardır? Fikrinizi nümunələrlə əsaslandırın.

Dördüncü qrupun tapşırığı icmal materialının məzmununa uyğun olaraq, Həbibinin yaradıcılığı ilə əlaqəli olur.

**Dördüncü qrup**

**Tapşırıq**

1. Həbibinin ana dilində yazdığı lirik şeirlərdə daha çox hansı məsələlər əksini tapmışdır?

2. Şairin ana dilində yazdığı qəzəllərdən birinin ideya-məzmununu şərh edin.

İcmal materialında haqqında məlumat verilən növbəti – sonuncu sənətkar Qurbanidir. Dərslikdə onun yaradıcılığının ümumi mənzərəsi əks etdirilmiş, real həyat hadisələrinin təsiri ilə yaranan qoşma və gəraylılarında insan və təbiət gözəlliklərinin yüksək sənətkarlıqla tərənnüm edildiyi vurğulanmışdır. Dərslikdə, həmçinin Qurbaninin ictimai məzmunlu şeirlərində toxunulmuş məsələlərə, Xətaiyə münasibətinə diqqət yetirilmişdir. Dərslikdən mənimsənilənlərin mənbələr əsasında zənginləşdirilməsinə ehtiyac vardır və buna imkan verən tapşırığın yerinə yetirilməsi məqsədəuyğundur. Tapşırığın bir variantı aşağıdakı məzmunda ola bilər.

**Beşinci qrup**

**Tapşırıq**

1. Qurbaninin lirik şeirləri daha çox hansı mövzularda yazılmışdır?
2. Sənətkarın təbiətlə bağlı şeirlərindən birinin ideya-məzmununu şərh edin.

İcmal mövzusunun təklif edilmiş metodik tövsiyyə əsasında tədrisi, qeyd edildiyi kimi, dərsəqədər ciddi hazırlıq işlərinin aparılmasını və başa çatdırılmasını nəzərdə tutur. Tapşırığı alan qruplar ilk növbədə mənbələrlə tanış olur, seçim edir, zəruri məlumatı öyrənir, qeydlər aparır. Qrup daxilində vəzifə bölgüsünün olması səmərəli nəticənin əldə edilməsinə imkan yaradır. Müzakirə fərqli formalarda təşkil edilə bilər. Bu, dərsin vaxt büdcəsindən asılıdır. Kifayət qədər vaxt qalmış olsa, məlumat mübadiləsinin və müzakirənin təşkili mümkündür. Vaxt məhdudluğu yaranarsa, məlumat mübadiləsindən sonra müzakirənin müsahibədən istifadə ilə aparılması faydalıdır. Haqqında danışılan icmal mövzusunu fərqli metodik yanaşmanın tətbiqi ilə də tədris etmək mümkündür. Lakin bütün hallarda şagirdlərin müstəqil fəaliyyəti ön plana çəkilməlidir. Ümumtəhsil məktəblərinin X siniflərində istifadə olunan "Ədəbiyyat" dərsliyində həmin mövzunun tədrisi üçün maraqlı metodik tövsiyə-tapşırıq təklif edilmişdir. Onun əsasında şagirdlərin müstəqil fəaliyyəti dayanır. Tövsiyə-tapşırıq aşağıdakı məzmunda təqdim olunmuşdur:

**"1. Orta əsrlərdə – XIII–XVI yüzilliklərdə Azərbaycan ədəbiyyatı, onun görkəmli nümayəndələrinin yaradıcılığı haqqında ədəbiyyat dərslərində öyrəndiklərinizi yada salıb yığcam müzakirə aparın.**

Həmin dövrdə Azərbaycanın siyasi həyatında, mədəniyyət, incəsənət sahəsində baş vermiş mühüm dəyişikliklər haqqında digər fənlərdən mənimsədiyiniz biliklərdən istifadə edin.

**2. "XIII − XVI yüzilliklərdə yaranan söz sənətimiz ədəbiyyat tarixinin qızıl dövrünü təşkil edir" mövzusunda debata hazırlaşın.**

**1) Mətni oxuyun. Tapşırıqları fərdi olaraq yerinə yetirin.**

a) Mətnkənarı sualların cavablarını ümumiləşdirib qısaca yazın.

| Mətnkənarı suallar | Onların ümumiləşdirilmiş cavabları |
|---|---|
| | |

c) Oxu zamanı sizi düşündürən sualları, onların ilkin cavablarını yazın.

| Məni düşündürən suallar | Onların cavabları |
|---|---|
| | |

3. **Aşağıdakı fikirlərin üzərində düşünün, müzakirədə onlara münasibət bildirin.**

Tarix və zaman etibarilə orta əsrlər Azərbaycan ədəbiyyatı milli ədəbi fikri keçdiyi çoxəsrlik inkişaf yolunun tən ortasıdır. Orta əsrlər ədəbiyyatı özündən əvvəlki dövrlərin ədəbi ənənələrinin və yaradıcılıq proseslərinin möhtəşəm yekunudur. Bu dövrün ədəbiyyatında Nizami Gəncəvinin irsinə və ənənələrinə yenidən və yaradıcı şəkildə qayıtmaqla milli ədəbiyyatın bütöv mənzərəsini yaratmaq vəzifəsi həll olunmuşdur (İsa Həbibbəyli).

Orta əsrlərdə anadilli ədəbiyyat sayca və sanbalca get-gedə güclənir və farsdilli poeziyanı üstələyirdisə də, fars dilində yazıb-yaratmaq ənənəsi hələ ədəbi şəxsiyyətlərin müəyyən bir qismini əhatə edirdi. Fars dilində yazıb-yaratmış görkəmli Azərbaycan şair və mütəfəkkirləri – Nəsirəddin Tusi, Marağalı Əvhədi, Arif Ərdəbili daha çox Nizami ənənələrinə söykənərək bu miqyasda əsərlər yaratmağa çalışırdılar (Nizami Cəfərov).

4. **Oxşar fikirli yoldaşlarınızla birləşib kiçik qruplar yaradın.**
5. **Dəlillər əsasında mövqelərinizi dəqiqləşdirib fərqli fikirdə olan iki böyük qrupda birləşin və müzakirə aparın”** [1, s.57].

Düşünməyə, axtarışlar aparmağa imkan yaradan bu tapşırıq şagirdləri sinifdə öyrəndiklərini mənbələrdən mənimsədiklərinin hesabına zənginləşdirməyə, müstəqil nəticə çıxarmağa yönləndirir. Tapşırığın əhəmiyyəti bununla məhdudlaşmır; fəndaxili, fənlərarası inteqrasiyanın reallaşmasına, fərqli fikirlərə tənqidi yanaşmağa, mənbələrlə işləmək, ümumiləşdirmə, diskussiya aparmaq kimi bacarıqlara yiyələnməyə şərait yaradır.

Artıq qeyd olunduğu kimi, icmal mövzularda, tipindən asılı olmayaraq, xeyli sənətkarın adı çəkilir, əsərləri xatırladılır. Vaxt məhdudluğu bu sənətkarları şagirdlərə ətraflı tanıtmağa imkan vermir. Əlbəttə, icmal mövzularda adı çəkilən əsərlərin hamısının oxudulması mümkün deyildir. Lakin şagirdlərin həmin bədii əsərlərdən müəyyən qismi ilə, ümumiyyətlə tanış olmamalarına haqq qazandırmaq olmaz. Fərqli yollardan istifadə etməklə (məsələn, yuxarıda təsvir edildiyi kimi, şagirdlərin müstəqil işinin təşkili yolu ilə) bu məsələnin səmərəli həllinə nail olmaq mümkündür. İcmal mövzularda adı çəkilən sənətkarlara münasibətdə *birinci vəzifə* onların şəxsiyyətinə maraq oyatmaqdır. Bu, həmin sənətkarların yaradıcılığına marağın oyanmasına və beləliklə şagirdlərdə müstəqil mütaliəyə həvəsin yaranmasına səbəb olur.

*İkinci vəzifə* həmin sənətkarların yaradıcılığının ədəbiyyatımızda tutduğu yeri və əhəmiyyətinin müəyyənləşdirilməsidir. Söz sənətimiz, bədii fikir tariximizin zənginləşməsində bu və ya digər sənətkarların ən qiymətli və mühüm töhfəsinin müəyyənləşdirilməsi, mənimsənilməsi istiqamətində addımların atılması, müstəqil olaraq mükəmməl öyrənilməsinə marağın yaradılması icmal mövzuların qarşısında duran vəzifələrdən sayıla bilər.

İcmal mövzuların öyrənilməsinə həsr olunmuş dərslərin maraqlı, səmərəli keçməsi üçün müxtəlif vasitələrdən istifadə edilməsi məqsədəuyğundur. Məsələn:

– Əyani vəsait (portret, cədvəl, sxem, xəritə və s.);

– Bədii oxu ustasının ifasında əsərlərdən parçaların səsləndirilməsi;

– İnternet resurslarından istifadə;

– İncəsənətin digər növlərindən (rəssamlıq, musiqi əsərləri, kinodan fraqmentlər və s.) istifadə.

İcmal mövzuların tədrisində istifadə olunan *metod, priyom və iş növləri* barədə metodik ədəbiyyatda az danışılmamışdır. Kurikulumaqədərki dövrdə *mühazirə* icmal mövzuların öyrənilməsində mühüm metod kimi qəbul edilmişdir. Lakin bu gün həmin mövzuların tədrisində mühazirədən istifadə səmərəli hesab olunmur. Yeni təhsil proqramı – kurikulum əsasında hazırlanmış "Ədəbiyyat" dərsliklərində və müəllim üçün metodik vəsaitlərdə icmal mövzuların tədrisində şagirdlərin müstəqil fəaliyyətinin, tədqiqatçılıq mövqeyinin aparıcı yer tutması məqsədəuyğun sayılır. Yuxarıda verilmiş nümunədən də görünür ki, şagirdlər dərslikdəki yığcam icmal materialını sinifdəcə oxuyur, yaxşı halda əlavə ədəbiyyatdakı materiallarla da tanış olur, öyrəndiklərini müzakirə edirlər. Müzakirə zamanı araşdırılmasına, zənginləşdirilməsinə ehtiyac duyulan məsələlər müəyyənləşdirilir. Mövzu ilə bağlı tədqiqatlarını məktəbdənkənar vaxtlarında davam etdirən şagirdlər dərslikdə təklif edilmiş müxtəlif mənbələri araşdırmaqla sinifdə öyrəndiklərini zənginləşdirir və tamamlayırlar.

İcmal mövzuların tədrisini, qeyd olunduğu kimi, fərqli formalarda təşkil etmək mümkündür. Məsələn, qabaqlayıcı tapşırıqlar verməklə (bunun mükəmməl və fərqli forması yuxarıda təsvir edildi) dərsi dialoq əsasında qurmaq olar. Bu yol seçilərsə, icmal mövzularda adı çəkilən əsərlərdən parçaların ifadəli oxunması, bədii oxu ustasının ifasının dinlənilməsi, dərslikdəki materialın plan və ya konspektinin hazırlanması və s. kimi iş növlərinin tətbiqi məqsədəuyğundur.

## Nəticə / Conclusion

Bunu da unutmaq olmaz ki, təhsil proqramının yenilənməsi dərsliklərin məzmun və strukturunda dəyişikliyə səbəb olur. Əksər hallarda isə dərsliklər bütövlükdə yenidən yazılır. Burada verilən izahların əksəriyyəti hazırda məktəbdə tətbiq olunan dərsliklərlə bağlıdır. Sonrakı illərdə – yeni dərsliklər yarananda onlarda fərqli çatışmazlıqların aradan qaldırılmasına şübhə etməmək olar. Lakin icmal mövzuların həmişə tədris ediləcəyi şəksizdir. Deməli, əsli icmalların tədrisi ilə bağlı burada səsləndirilmiş metodik fikirlərdən bu və ya digər səviyyədə həmişə istifadə etmək mümkün olacaqdır.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Богданова О.Ю., Леонов С.А., Чертов В.Ф. (2008). Теория и методика обучения литературе. Москва, “Академия”. 400 с.
2. Əliyev S., Həsənov B., Mustafayeva A. (2022). Ədəbiyyat, 10-cu sinif üçün dərslik. Bakı, “Bakınəşr”. 208 s.
3. Hüseynoğlu S. (2009). Ədəbiyyat dərslərində yeni texnologiyalar: fəal interaktiv təlim. Bakı, Bakınəşr. 200 s.
4. Həsənli B. (2016). Ədəbiyyatın tədrisi metodikası. Bakı, Müəllim. 452 s.
5. Ядровская Е.Р. (2021). Методика преподавания литературы. Москва, “Юрайт”. 236 с.

## MÜƏLLİFLƏRİN NƏZƏRİNƏ

*«Azərbaycan dili və ədəbiyyat tədrisi» jurnalında dərc ediləcək məqalələr üçün texniki tələblər*

**Məqalələrin məzmunu**

Məqalələr aktual mövzulara həsr olunmalı, jurnalın məzmun və üslubuna uyğun akademik tələblərə cavab verməli, "Giriş" (Introduction), "Əsas hissə" (Main part) və "Nəticə"dən (Conclusion) ibarət olmalıdır. "Giriş"də mövzunun aktuallığı əsaslandırılmalı, "Əsas hissə"də tədqiq edilən məsələlər, qaldırılan problemlər bölmələr üzrə ətraflı şərh edilməli, "Nəticə"də isə elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq, müəllifin gəldiyi elmi qənaət, işin elmi yeniliyi, tətbiqi əhəmiyyəti və s. aydın şəkildə verilməli, təklif və tövsiyələr irəli sürülməlidir.

**Məqalələrin strukturu və tərtib edilmə qaydaları**

1) Redaksiyaya təqdim edilən məqalələr Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının dövri elmi nəşrlərin qarşısında qoyduğu şərtlər də daxil olmaqla aşağıdakı tələblərə cavab verməlidir:

- ✓ Məqalənin adı, müəllifin adı və soyadı, vəzifəsi, elmi dərəcəsi (əgər varsa), işlədiyi qurumun adı, elektron poçt ünvanı və ölkə adı məqalənin titul səhifəsində yazılmalıdır.
- ✓ "Xülasə" Azərbaycan və ingilis dillərində eyni məzmunda olmaqla, təxminən 70-120 söz həcmində verilərək, tədqiqat işinin əhatə dairəsini təsvir etməlidir.
- ✓ "Açar sözlər" Azərbaycan və ingilis dillərində verilərək 3-5 söz və ya söz birləşməsindən ibarət olmalıdır.

2) Məqalənin mətni Microsoft Word proqramında, A4 (210x297mm) formatda, Times New Roman – 14 şriftində yığılmalı, intervalı – 1,15, həcmi 6-15 səhifə olmalıdır.

3) Məqalənin adı və yarımbaşlıqları yalnız ilk hərfi böyük olmaqla, qalın şriftlə yazılmalıdır. Başlıq və yarımbaşlıqlardan, cədvəl və şəkillərdən (həmçinin tənliklər və düsturlardan) əvvəl və sonra bir sətir ara boşluğu buraxılmalıdır. Səhifələr ardıcıl olaraq aşağı sağ küncdə nömrələnməlidir.

4) Cədvəl və şəkillərin adı olmalı və bu ad cədvəllər üçün cədvəlin üstündə sol küncdə, şəkillər üçün şəklin altında sol küncdə yerləşdirilərək, ardıcıl nömrələnməlidir.

5) Məqalənin mövzusu ilə bağlı elmi mənbələrə zəruri istinadlar olmalı, sonda verilən "İstifadə edilmiş ədəbiyyat"da istinad olunan ədəbiyyatlar mətnin içində [Kazımov Q. Bakı, 2007] və ya [1, s.52] kimi verilməli, sonda isə əlifba ardıcıllığı ilə nömrələnməlidir. Elmi ədəbiyyata mətndə onlayn istinad olarsa 1 qoyaraq aşağıda internet linki göstərilməlidir. Ədəbiyyat siyahısında verilən hər bir istinad haqqında məlumat tam, dəqiq və orijinalın dilində olmalıdır. İstinad olunan mənbənin biblioqrafik təsviri onun növündən (monoqrafiya, dərslik, elmi məqalə və s.) asılı olaraq verilməlidir. Elmi məqalələrə, simpozium, konfrans və digər nüfuzlu elmi tədbirlərin materiallarına və ya tezislərinə istinad edərkən məqalənin, məruzənin və ya tezisin adı göstərilməlidir. Mətndə istinad olunan bütün mənbələr, səhifə nömrələri ilə birlikdə «İstifadə edilmiş ədəbiyyat» siyahısında aşağıdakı nümunələrdə göstərilən qaydada verilməlidir:

a) *Kitablara istinad:* Kazımov Q. (2007). Müasir Azərbaycan dili. Sintaksis. Bakı, Təhsil. 496 s.

b) *Jurnallara istinad:* Həsənova S. (2021). Aşıq Ələsgər və ədəbi dilimiz. "Azərbaycan dili və ədəbiyyat tədrisi", № 4. Bakı, "N print studiya", s.25-34.

c) *Toplularda məqaləyə istinad* (konfrans, simpozium və digər): "Azərbaycan iqtisadiyyatında keçid dövrünün başa çatması: təhlil və nəticələr. Milli inkişaf modelinin formalaşması problemləri". (2010). Respublika elmi-praktiki konfransının materialları. Bakı, Şərq-Qərb, s.314-316.

ç) *Dissertasiyalar və avtoreferatlar:* Məmmədov H.B. (2013) Azərbaycan Respublikası müasir beynəlxalq siyasi proseslərin aktoru kimi. Elmlər doktoru dissertasiyasının avtoreferatı. Bakı, Elm. 44 s.

d) *Müəlliflik şəhadətnamələri və patentlər*: Алиев С.Г., Джалалов К.Х. А.С. 163514, СССР Б.И. 1988, № 4, s.50 Langsam M., Savoca A. C.L. Pat. 4759776, USA, 1988.

e) *İnternet səhifələri:* İnternet səhifələrinə istinadlar tam göstərilməlidir. Məsələn: http://www.tall.edu.az

6) Məqalədə son 5-10 ilin elmi məqalələrinə, monoqrafiyalarına və digər etibarlı mənbələrinə üstünlük verilməlidir.

7) Məqalə redaksiyaya 3 formada: ya elektron poçtla (*tall@edu.gov.az*), ya jurnalın saytı (http://*tall.edu.az)* üzərindən, ya da çap formasında müəllifinin özü tərəfindən təqdim edilməlidir. Orijinal nüsxədə müəllif(lər)in imzası vacibdir.

**Məqalələrin qəbul edilməsi və dərci**

Təqdim edilən məqalələr redaksiyada nəzərdən keçirildikdən sonra oxunuş üçün (müəllifin adı gizli saxlanılmaqla) mütəxəssislərə göndərilir. Məqalə jurnalın profilinə uyğun olduğu təqdirdə və tələblərə cavab verərsə, çapa təqdim edilir. Müəllif istəsə, ona məqaləsinin qəbul edilməsi barədə sənəd verilə bilər. Məqalələr növbəlilik prinsipi ilə dərc edilir.

**Müəlliflik hüquqları**

Jurnalda dərc edilən məqalələrdə müəlliflik hüququ qorunur və bu məqalələrin bütün nəşr hüquqları *"Azərbaycan dili və ədəbiyyat tədrisi"* jurnalına aiddir. Jurnalda çap edilmiş məqalələrin eyni ilə digər nəşrlərdə (məqalənin tezis şəklində dərc olunmuş variantı istisnadır) dərcinə yalnız redaksiyanın yazılı icazəsi, sitatların verilməsinə isə mənbə göstərilmək şərti ilə yol verilir. Əvvəllər çap olunmuş və ya çap olunmaq üçün başqa bir dövri nəşrə göndərilmiş əlyazmaların jurnala təqdim edilməsi müəlliflik etikasına ziddir. Yuxarıda göstərilən tələblərə cavab verməyən məqalələr qəbul edilmir. Dərc olunmuş məqaləyə görə müəllifə jurnalın bir nüsxəsinin verilməsi nəzərdə tutulur.

## FOR AUTHORS

*Requirements to the articles submitted for publication in «Teaching of Azerbaijani language and literature»*

### Content of articles

The articles should be devoted actual topics, meet the academic requirements of journal's style and content and consist of «Introduction», «Main part», and «Conclusion». The «Introduction» should contain a thesis that will assert the main argument. In the «Main part», the studied issues and the raised questions should be explained and analyzed in detail in the sections. In the «Conclusion», the author should reinforce the importance of the main idea, emphasize his scientific contention and appreciate his topic in personally relevant ways, and it is notable to shine the scientific novelty and the benefits of the work and to offer suggestions and recommendations.

### Rules of preparing of articles and scope

1) The articles submitted for the editorial must meet the following requirements, including the conditions set out for the periodical scientific publications presented by the Higher Attestation Commission under the President of the Republic of Azerbaijan:

- ✓ Title of the article, author's name, surname, position, academic degree, name and address of the organization where he works, E-mail address should be written on the title page of the article.
- ✓ Abstract (in Azerbaijani and English) should be approximately 70-120 words, with the same content.
- ✓ Keywords (in Azerbaijani and English) should consist of 3-5 words or phrases.

2) The text should be typed in Microsoft Word, A4 (210x297mm), Times New Roman – 14, interval – 1, 15, size 6-15 sheets.

3) The title and subheadings of the article should be written in bold, with only the first letter capitalized. Before and after the headline and subheadings, tables and figures (also equations and formulas), a single line spacing should be added. Pages should be numbered in the lower right corner.

4) The table and pictures must be named, and the name should be placed in the left hand corner above the table, and pictures name should be placed in the left-hand corner under picture.

5) There should be references to scientific sources related to the topic of the article, as well as the sources noted at the end in "used works" should be mentioned in the text as [Kazimov G. Baku, 2021] or [1, p.52], and finally numbered in alphabetical

order. If there is an online reference in the text, you should put an internet link below and number it from one. The information on each reference in the Literature List must be in full, accurate and the native language. The bibliographic description of the source should be based on its type (monograph, textbook, scientific article, etc.). The name of the article, report or thesis should be cited when referring to scientific articles, materials or theses of symposium, conference or other prestigious scientific events. All sources referenced in the text should be cited in the “Used Works or References” list, along with the page numbers, as specified in the following examples:

a) *References to books:* Kazimov G. (2007). Modern Azerbaijani language. Syntax. Baku, Tahsil. 496 p.

b) *References to journals:* Hasanova S. (2021). Ashug Alasgar and our literary language. "Teaching of Azerbaijani language and literature", № 4. Baku, “N print studio”, p.25-34.

c) *Reference to the articles in scientific events:* «End of a transitional period in Azerbaijan economy: analysis and conclusions. Problems of National Development Model Formation" (2010). Materials of the scientific-practical conference of the Republic. Baku, East-West, p.314-316.

d) *Dissertation thesis and abstracts*: Mammadov H.B. (2013) The Republic of Azerbaijan as an actor in contemporary international political processes. Doctoral dissertation abstract, Baku, Science. 44 p.

e) *Copyright and Patents:* Aliev S.G., Jalalov K.Kh. A.S. 163514, USSR // B.I. 1988, No. 4, p.50 Langsam M., Savoca A. C.L. Pat. 4759776, USA, 1988.

f) *Internet pages* (references to web pages should be indicated in full): For example: http://www.tall.edu.az

6) The article should give preference to scientific materials, monographs and other reliable sources for the last 5-10 years.

7) The article must be submitted to the editorial office in 3 forms: by e-mail *(tall@edu.gov.az)*, or through the journal's website *(http://tall.edu.az)*, or in printed form by the author of the article. The original signature of the author is important.

**Acceptance and publication of articles**

After review, the presented article will be sent to experts to be read out. If the article corresponds to the journal profile and meets the requirements, the printing is provided. If the author wishes, a document on his / her article acceptance may be issued. Articles are published on the principl of rotation.

## Copyright

# К СВЕДЕНИЮ АВТОРОВ

*Технические требования к статьям опубликованным в журнале «Преподавание Азербайджанского языка и литературы»*

## Содержание статей

Статьи должны быть посвящены актуальным темам и соответствовать академическим требованиям в соответствии с содержанием и стилем журнала. Статьи должны состоять из «Введение» (Introduction), «Основной части» (Main part) и «Заключения» (Conclusion). В «Введение» должно обосновываться актуальность темы, в «Основной части» исследуемые задачи и поднятые проблемы должны быть объяснено подробно по разделам, а в «Заключения» должно основываться на характере области статьи. Важность приложения, научный вывод, сделанный автором, научная новизна работы, экономические выгоды и т. д. должны быть четко указано и должны быть выдвинуты предложение и рекомендации.

## Структура и правила составления статей

1) Статьи, представленные в редакцию, должны соответствовать следующим требованиям, в том числе условиям, установленным Высшей Аттестационной Комиссией при Президенте Азербайджанской Республики, для периодических научных публикаций:
   - ✓ На титульном листе статьи должны быть указаны название статьи, имя и фамилия, должность, ученая степень, название и адрес организации, адрес электронной почты автора.
   - ✓ Ключевые слова (на азербайджанском и английском языке) должны состоять из 3 - 5 слов или фраз.
   - ✓ Резюме (на азербайджанском и английском языке) должна составлять примерно 70-120 слов с одинаковым содержанием.

2) Текст статьи должен написан в программе Microsoft Word, A4 (210x297 мм), Times New Roman – 14, интервал – 1, 15, объем 6-15 страниц.

3) Названия статьи должен писаться с жирным шрифтом с большой буквой. До и после заголовка и подзаголовков, таблиц и рисунков (также уравнений и формул) должен быть выпущен один междустрочный интервал. Страницы должны располагаться последовательно в правом нижнем углу.

4) Таблицы и рисунки должны иметь имя и это имя для таблиц должен перемещаться над таблицей в левом углу, а для рисунков под рисунки в левом углу и последовательно пронумероваться.

5) Необходимые ссылки на научные источники, относящиеся к теме статьи, должны быть приведены в тексте как ссылки на «Использованную литературу» в тексте [Казымов Г. Баку, 2021 г.] или [1, с.52] и в конце должны быть упорядочены в алфавитном порядке. Если в тексте есть онлайн-ссылка на научную литературу, интернет-ссылка должна быть показана ниже, поставив 1. Информация по каждой ссылке в списке литературы должна быть полной, точной и на языке оригинала. Библиографическое описание справочного источника следует представить в зависимости от его типа (монография, учебник, научная статья и т). При ссылке на научные статьи, материалы или тезисы симпозиумов, конференций и других престижных научных мероприятий необходимо указывать название статьи, доклада или диссертации. Все источники, на которые есть ссылки в тексте, должны быть включены в список «Использованная литература» вместе с номерами страниц в следующих примерах:

а) *Ссылки на книги:* Казимов Г. (2007). Современный азербайджанский язык. Синтаксис. Баку, Тахсил. 496 с.

б) *Ссылка на журналы:* Гасанова С. (2021). Ашуг Алесгар и наш литературный язык. «Преподавание азербайджанского языка и литературы». № 4, Баку, «N print studio», с.25-34.

в) *Ссылки на статьи в сборнике (конференция, симпозиум и т. д.):* «Конец переходного периода в экономике Азербайджана: анализ и итоги. Проблемы формирования модели национального развития». (2010). Материалы республиканской научно-практической конференции. Баку, Восток-Запад, с.314-316.

г) *Диссертации и авторефераты:* Мамедов Х.Б. (2013) Азербайджанская Республика — современная международная политика как актер в процессе. Автобиография докторской диссертации, Баку, Наука, с.44.

д) *Авторские свидетельства и патенты:* Алиев С.Г., Джалалов К.Х. А.С. 163514, СССР. БИИ 1988, № 4, с.50 Langsam M., Savoca A. C.L. Патент 4759776, США,1988

е) *Ссылки на веб-страницы:* Ссылки на веб-страницы должны быть полностью показаны. Например: http://www.tall.edu.az

6) В статье предпочтение отдается научным статьям, монографиям и другим надежным источникам написанном последние 5-10 лет.

7) Статью можно представить в редакцию в 3-х формах: либо по электронной

почте *(tall@edu.gov.az)*, либо через сайт журнала *(http://tall.edu.az)*, либо в печатном формате автором статьи. В оригинале обязательна подпись автора(ов).

**Прием и публикация статей**

Представленные статьи после ознокомлений в редакции отправляют (после того, как имя автора останется конфиденциальным) экспертам для прочтения. Если статья соответствует профилю журнала и требованиям, тогда предоставляется в печать. По желанию автора может быть выдан документ о его принятии статьи. Статьи публикуются по принципу очереди.

**Авторские права**

Авторские права на статьи, публикуемые в журнале защищены и все права на публикации этих статей принадлежит журналу *«Преподавание Азербайджанского языка и литературы».* Статьи, опубликованные в журнале, допускаются только с письменного разрешения редакции для других опубликованных публикаций (кроме статьи, опубликованной как тезис). А для использования цитатов можно только с одним условиям показать источника. Рукописи, отправленные для печати в другое периодическое издание или в раннем времени напечатанные в другом журнале подача в редакцию, противоречит этику авторов. Статьи, не соответствующие вышеуказанным требованиям, не принимаются. Для опубликования статьей предназначен представить автору одну копию журнала.

